# DƏLİLUT-TALİB Lİ NEYLİL-MƏTALİB

**(təharət kitabından cihad kitabının sonuna qədər)**


**əş-Şeyx əl-Alləmə**

**Mər'i bin Yusuf bin Əbi Bəkr əl-Kərmi əl-Məqdisi əl-Hənbəli**

**(v. hicri 1033/miladi 1624)**


**İmam Əhmədin məzhəbi üzərində yazılmış ən mötəbər müxtəsər fiqh mətnlərindən birinin tərcüməsi haşiyələr və qeydlər ilə birlikdə**


**www.favaid.com**

# DƏLİLUT-TALİB Lİ NEYLİL-MƏTALİB

**(təharət kitabından cihad  kitabının sonuna qədər)**

**əş-Şeyx əl-Alləmə**

**Mər'i bin Yusuf bin Əbi Bəkr əl-Kərmi əl-Məqdisi əl-Hənbəli**

**(v. hicri 1033/miladi 1624)**

# Müqəddimə

Rəhimli və Mərhəmətli Allahın adı ilə. Həmd aləmlərin rəbbi olan Allaha məxsusdur. Peyğəmbərimiz Muhəmmədə, onun ailəsinə və sahabələrinə salavat və salam olsun.

Məlumdur ki, mükəlləf müsəlmanların dinlərini üzərində quracaqları, gündəlik ibatlərini və muamələtlərini yerinə yetirə biləcəkləri bilgilərə sahib olmaları labüddür. Məzh bu səbəbdən dolayı hənbəli məzhəbi üzərə yazılmış müxtəsər bir kitabı tərcümə edib onu azərbaycanlı müsəlmanların xidmətinə vermək qərarına gəldik. Seçdiyimiz kitab misirli hənbəli alimi Şeyxulislam Alləmə Mər`i ibn Yusuf əl Kərminin "Dəlilut Talib li Neylil Mətalib" kitabıdır. Bu kitabı seçməyimizin səbəbi müəllifinin hənbəli alimləri arasında uca məqamı, həmçinin imam Əhmədin məzhəbində yazılmış ən mötəməd kitablardan olmasıdır. Müəllif hər bir məsələdə yalnız bir görüş qeyd edir və bu məzhəbdə fətvanın onun üzərində olduğu görüşdür, məzhəbin səhih rəyinə muxalif olması çox nadirdir.

İndiyə qədər kitabın ibadətlər bölümünü tərcümə edib bitirmişik. Muamələtlər bölümünü də Allahın izni ilə təqdim edəcəyik. Ehtiyac duyduğumuz yerlərdə İbn Əbi Təğləbin`in bu kitaba yazdığı "Neylul Məarib" adlı şərhindən, alləmə əl Ləbədinin bu şərhin üzərinə yazdığı haşiyəsindən və həmçinin məzhəbin digər kitablarından izahatlar vermişik. Allahdan bu əməlimizi xalis olaraq Onun üçün etməsini və Qiyamət Günü bizi və digər müsəlmanları əfv etməsini diləyirik.

## Sular bölümü

Təharət hadəsin aradan qaldırılması[1] və xabəsin yox olmasıdır[2][3].

**Suyun qisimləri üçdür**:

**Birinci**: Öz yaradılış şəklində qalan təmizləyici su; bu su, hadəsi aradan qaldırır və xabəsi yox edir.

**Bu su dörd növdən ibarətdir**:

1 - İstifadəsi haram olan, hadəsi aradan qaldırmayan, lakin xabəsi aradan qaldıran su və bu, mübah olmayan sulardır[4].

---

[1] Hədəs iki cürdür: böyük hədəs və kiçik hədəs. Böyük hədəs qüslsuzluq halıdır, kiçik hədəs isə dəstəmazsızlıq halıdır. Böyük hədəsi qüsl almaq ilə, kiçik hədəsi isə dəstəmaz almaq ilə aradan qalxır. Deməli təharətin bu qisminə iki şey daxildir: vacib qüsl və vacib dəstəmaz. Qeyd edək ki, qəsd olunan vacib qüslda və vacib dəstəmazda birinci dəfə yumaqdır, çünki bir dəfə yumaq vacibdir və bu yumaqla hədəs aradan qalxır, ikinci və üçüncü dəfə yumaq haqda isə aşağıda söhbət açılacaq.

[2] Xəbəs təmiz yerə düşmüş nəcasətdir. Beləliklə istər bədəndə, istər paltarda, istərsə də yerdə olan nəcasəti yumaq təharətin ikinci qismidir.

[3] Kitab müxtəsər olduğu üçün müəllif bu təriflə kifayətlənmişdir. Müəllifin Ğayətul Muntəhə kitabında verdiyi tərif: "hədəsin aradan qalxması, xəbəsin yox olması və onların (hədəsin aradan qalxması və xəbəsin yox olması) mənasında olanlar". İlk iki qismi yuxarıda izah etdik. Onların mənasında olan ilə qəsd etdiyi təharətə aid olub ilk iki qismə daxil olmayanlardır. Bura meyyiti yumaq, müstəhəb qüsl, müstəhəb dəstəmaz, vacib qüsl və vacib dəstəmazda ikinci və üçüncü dəfə yumaq, gecə yuxusundan qalxanın əllərini üç dəfə yuması, məzi ifraz edənin onu yuduqdan sonra zəkərini və xəyalarını yuması, təyəmmüm və isticmar aiddir.

[4] Şeyx əd-Duməni haşiyəsində deyir: "Mübah olmayan sular ilə qəsdi bütün növləri ilə birlikdə haram olan sulardır, misal üçün oğurlanmış su, qəsb olunmuş su, bir kəsin yanında əmanət olaraq tərk edilmiş, lakin sahibinə geri qaytarılmamış su və içmək üçün xeyirxahlıq olaraq nəzərdə tutulmuş su, beləliklə bunların heç biri nə böyük, nə də kiçik hadəsi aradan qaldırmır." ("Haşiyətud-Duməni", səh: 100)

2 - Həddi-büluğa çatmış kişi və xunsənin deyil, qadının hadəsini aradan qaldıran su; bu, mükəlləf qadının hadəsdən kamil surətdə təmizlənməsi üçün xəlvətə çəkildiyi sudur.

3 - Ehtiyac olmadığı sürəcə istifadəsi məkruh olan su; bu, qəbiristanlıqda olan quyu suyu, yaxud çox isti və ya çox soyuq olan su, yaxud nəcasət ilə və ya qəsb olunmuş bir şeylə qızdırılmış su, yaxud vacib olmayan təharətdə və ya kafirin qüslunda istifadə edilmiş su[5], yaxud su duzu[6] ilə və ya xmer çubuğu[7], kafur parçaları və yağ kimi suya qarışmayan şeylərlə dəyişmiş sudur. Zəm-zəm suyunun istifadəsi isə yalnız xabəsi yox etməkdə məkruhdur.

4 - Dəniz suyu, quyular, çeşmələr, çaylar, hamam suyu[8], günəşdə qızdırılmış su, uzun müddət qalması, yaxud bir leş tərəfdən gələn yel səbəbilə, yaxud (qəsdən suya) atılmadığı təqdirdə yosun və ağac yarpağı[9] kimi suyun onlardan qorunulması çətin olan şeylər səbəbilə dəyişmiş su, məkruh olmayan sudur.

---

[5] Burada istifadə edilmiş su ilə qəsd olunan dəstəmaz və ya qüsl alanın yuduqu üzvlərinindən axıb tökülən sudur, istifadə etdiyi qabda qalan su deyil

[6] Duz ya dağ duzu, ya da su duzu olur. Su duzu sudan çıxarılır və şorlu torpaqlarda olur, üzərinə su töküləndə su, duzlaşmış olur. Dağ duzları isə dağ mədənlərindən çıxan duzlardır. Şeyx əd-Duməni deyir: “Çünki o, şorlu torpaqlara tökülmüş sudur, beləliklə duzlaşır. Hətta qəsdən suya atılsa belə bunun sadəcə məkruh olmasının səbəbi onun özünün də sudan ibarət olmasına görədir, beləliklə qarın əriməsinə bənzəmiş olur...Su duzu qeydi ilə mədən duzunu kənarda saxlayıblar, çünki o, suyun tahuriyyətini alıb götürür.” (“Haşiyətud-Duməni”, səh: 105)

[7] Ərəbcə “əl-‘Ud əl-Qiməri” və ya “əl-’Ud əl-Qaməri” adlanan bu ağac hissələri xoş ətrə sahibdir. Qimər adlı yerdən gəldiyi üçün onlara “qiməri çubuq” deyirlər. Qimər isə tarixdə Xmer imperiyasının adı olmuşdur, indiki Kamboca ölkəsidir. Alləmə Əbu Abdilləh Şəmsud-Din Muhamməd bin Əbil-Fəth əl-Bə’li əl-Hənbəli (hicri 645-709) deyir: “Qəsdi qaməri çubuğudur, qaf hərfi fəthə ilədir, Qamər ölkəsinə nisbət edilir və o, Hindistan torpaqlarında bir yerdir.” (“əl-Mutli alə Əbvabil-Muqni”, səh: 22)

[8] Bununla daha əvvəl məkruh olan sular arasında zikr olunan nəcasət ilə qızdırılmış suların arasından hamam suyu istisna edilmiş olur. Yəni hamam suyu istər təmiz bir materialla, istərsə də nəcasətlə qızdırılmış olsun, ondan istifadə etmək məkruh deyildir. Alləmə İbn Aud “Hidəyətur-Rağib” kitabına yazdığı haşiyəsində deyir: “Yəni hamam suyu nəcasətlə qızdırılmış məkruh olan sular arasından istisna edilir, çünki səhabələr hamama daxil olmağa rüxsət veriblər.”

[9] Alləmə İbn Humeyd – rahiməhullah - əl-Buhuti’nin “əl-Muntəhə” kitabına yazdığı şərhində “ağac yarpağı” sözü ilə bağlı açdığı haşiyəsində deyir: "Sözündən anlaşılan budur ki, əgər ağacın meyvələri düşərsə və suyu

**İkinci**: Hadəsi aradan qaldırmaq və xabəsi yox etməkdən başqa hallarda istifadəsi icazəli olan təmiz su[10]; və bu, rənginin yaxud tamının yaxud iyinin çox hissəsi təmiz bir şeylə dəyişmiş sudur və əgər bu dəyişiklik özü aradan qalxarsa[11] təmizləyici halına geri dönər.

Bu növ təmiz suya, az olub hadəsi aradan qaldırmaq üçün istifadə edilmiş su[12] və yaxud dəstəmazı pozacaq şəkildə gecə yatmış mükəlləf müsəlmanın, (oyandıqdan sonra) niyyət və bəsmələ ilə üç dəfə əllərini yumadan öncə - və bu, vacibdir - əlini bütövlüklə içinə daxil etdiyi su da aiddir[13].

---

dəyişdirərsə, yekdil görüş olaraq suyun təmizləyici xüsusiyyətini aparmış olur, çünki çox zaman suyu meyvələrdən qorumaq mümkündür. Su hövzələri yanında meyvəli ağaclar az olur. Lakin yarpaqlar kimi (meyvələrin də) suyun təmizləyici xüsusiyyətini aparmaması görüşü də əsaslıdır və bu, meyvələrin çox zaman çöllükdə bitən meyvəsi püstə, qaraz olan ağacların olması halında əsaslıdır. Bunu əş-Şişəni "əl-Muharrar" kitabının şərhi "əl-Muqarrar"da deyib." ("Həşiyətu İbn Humeyd", səh: 146)

[10] Şeyx Abdul-Ğani bin Yəsin əl-Ləbədi deyir: "Yəni bu iki hala bənzər hallarda; belə su ilə meyiti yumaq, gecə yuxusundan duranın əllərini yuması, məzi ifraz edənin xayalarını yuması, cümə qüslu kimi müstəhəb qüsl və müstəhəb dəstəmaz almaq və bənzər əməlləri etmək səhih deyildir, baxmayaraq ki, bunlar hadəsin aradan qaldırılması və xabəsin yox edilməsi hesab edilmir. Bu üzdən onun (yəni əl-Kərmi'nin) sözlərində qüsur vardır." ("Haşiyətul-Ləbədi", səh: 12)
[11] Bu, şərt deyil.Üstəlik əgər onun dəyişməsi suyun əlavə edilməsi və digər şeylərlə yoxa çıxarsa təmizləyici vəsfinə dönər.(Haşiyətul Ləbədi:12 səh)
[12] Burada da istifadə olunmuş su ilə qəsd üzvlərdən axan sudur, istər böyük hədəsin qaldırılmasında istifadə olunsun istərsə də kiçik hədəsin.
[13] Mükəlləf müsəlman gecə dəstəmazı pozacaq qədər çox yatarsa duranda əllərini niyyət və bəsmələ ilə üç dəfə yuması vacibdir. Burada niyyət əllərində olan məna üçündür, bəsmələ isə "bismilləh" deməkdir. Burdan anlaşılır ki, bu dəstəmaza aid deyil, əksinə müstəqil bir ibadətdir. Buna görə burada dəstəmaz niyyətini etmək keçərli deyil və dəstəmazdan uzun zaman əvvəl edilə bilər. Bu ibadət vacib olsada, özü və bəsmələsi cahilliyə və unutqanlığa görə düşər. Yəni bu ibadəti və ya bəsmələsini unudub və ya onlardan cahil olduğuna görə dəstəmaza keçərsə, vaciblik hökmündən düşər, dəstəmaz əsnasında xatırlasa belə bu ibadətə qayıtmaq lazım olmaz. Lakin bilərək və xatırlayaraq bu ibadəti yerinə yetirmədən dəstəmaz alarsa, əllərini qabın içinə salmasa belə dəstəmazı səhih olmaz.
Beləliklə, əgər əllərini yumaqdan əvvəl bütün əlini içində az su olan qaba salarsa, və ya biləyindən barmaqlarına qədər bütün əlində az su hasil olarsa, bu su tahir hökmünə düşər. Bu hənbəli alimlərinə görə təabbudi, yəni mənası əqllə dərk

**Üçüncü**: Zərurət halı istisna olmaqla istifadəsi haram olan, hadəsi aradan qaldırmayan və xabəsi aparmayan nəcis su; və bu, az olduğu halda içinə nəcasət düşmüş yaxud çox olduğu halda (içinə düşmüş) nəcasət səbəbilə vəsflərindən biri dəyişmiş sudur.

Əgər bu dəyişiklik özlüyündə və ya ona (çox miqdarda)[14] təmizləyici suyun əlavə edilməsi yolu ilə və yaxud da arındırılmaqla və sonra qalan suyun çox olması ilə aradan qalxarsa təmizlənər.[15]

Çox, təqribən[16] iki qüllədir[17]. Az isə iki qüllədən az olandır. İki qüllə isə İraq çəki ölçüsü ilə beş yüz ratl, Qüds çəki ölçüsü ilə səksən və

---

olunmayan hökmlərə aiddir, ona görə hətta gecə əllərini bir kisənin içində bağlayıb yatsa da, hökm eynidir. Həmçinin əlini suya salmaqla onu orda yumağı niyyət edib etməməsi, bu hökmü bilib bilməməsi arasında fərq yoxdur, hətta bu suya əlini salmağa məcbur edilsə də hökm eynidir. Lakin əgər əllərindəki mənanı qabın içində yumağı niyyət edib az suya salsa, əlin hamısını deyil, az hissəsini salsa belə su tahir olacaq.
Burdan anlayırıq ki, çox suya əllərin salınması təsir etməyəcək, və çox suyun mənası irəlidə gələcəkdir.

[14] Kitabın əlyazmaları içində Mədinə məscidinin kitabxanasındakı əlyazmada "çox miqdarda" əlavəsi yer almışdır. Kitabı təhqiq etmiş Əbu Quteybə əl-Fəryəbi bu əlavənin dörd əlyazma içindən yalnız bunda olduğunu deyir. Görünür ki, Şeyx əl-Ləbədi öz haşiyəsində deyir: "Onun "çox miqdarda" sözü o deməkdir ki, suya əlavə edilən təmizləyici suyun miqdarının çox olması lazımdır, yəni iki və daha çox qüllə olmalıdır. "əl-Muntəhə" və digər kitablarda qəti olaraq bu görüş bildirilir. "əl-İnsaf" kitabında (əl-Mərdəvi) deyir: "Əgər az miqdarda su ilə və ya sudan başqa bir maye ilə artırılarsa məzhəbin səhih görüşünə görə su təmizlənməz." Müəllif "əl-Ğayə" kitabında deyir: "Su əlavə etmək və suyu arındırmaqda çox miqdarı şərt qoşmağın səhih olmaması tutarlı görüşdür." Deyirəm: Bu, onun bu kitabındakı sözünün zahiri mənasıdır və bu, əshabın (yəni hənbəli alimlərinin) çoxunun görüşünə müxalif olsa belə dəlil baxımından güclüdür, çünki heç bir su əlavə etmədən (sudakı) dəyişiklik özlüyündə aradan qalxarsa su təmizləyici halına geri dönər, o zaman az miqdarda suyun əlavə edilməsi ilə təmizləyici halına qayıtması daha münasibdir. Bu barədə düşün! Təqlidin əsiri olma!" ("Haşiyətul-Ləbədi", səh: 13) Bu sözlərdən belə başa düşürük ki, məzhəbin səhih görüşünə görə vəsflərindən biri dəyişmiş suyu təmizləyici halına qaytarmaq üçün ona əlavə edilən təmizləyici suyun miqdarının çox olması şərtdir, əgər az miqdarda təmizləyici su əlavə edilərsə su təmizlənmiş sayılmaz. Lakin Şeyx Mər'i əl-Kərmi digər görüşü, yəni belə bir şərtin səhih olmaması görüşünü əsaslı sayıb. Anladığımız kimi əl-Ləbədi bu görüşü güclü hesab etmişdir.

[15] Az olub düşən nəcasət səbəbilə nəcis olan, lakin vəsflərindən heç birini dəyişməyən suyun təmizlənməsi isə çox tahur suyun əlavəsi ilə olur.

[16] Şeyx əd-Duməni deyir: "Yəni dəqiq yox, lakin təqribən belədir və bir və ya iki iraq ratlı miqdarında su çatışmazsa yenə zərər verməz, çünki bir şeyə yaxın

yeddidə iki və yeddidə birin yarı[18] ratlini təşkil edir.[19] İki qullənin həcmi həm uzununa, həm eninə, həm də dərinliyində bir zira` və dörddə biri qədərdir[20].

Əgər təmizləyici su çox olarsa və nəcasət səbəbilə dəyişikliyə uğramazsa, nəcasət orada qalsa belə su təmizləyici sayılır. Əgər suyun çox olub olmamasında şübhə edərsə, su, nəcis sayılır.

Əgər təharət üçün icazəli olan su ilə icazəli olmayan su qarışıq düşərsə (onlardan hansının icazəli olduğunu) araşdırmamalıdır və suyu dağıtmadan təyəmmüm almalıdır.[21]

Bir şeyin nəcasət olduğunu bilənin onu istifadə etmək istəyənə xəbər verməsi lazımdır.

---

olana da onun hökmünü verirlər. İki qüllədən bu miqdarda (yəni bir iki ratl) su az olarsa ona da iki tam qüllə hökmü verilir.” (“Haşiyətud-Duməni”, səh: 118)

[17] Bu sözü “ İki qullə İraq çəkisi ilə beş yüz ratl təşkil edir” sözlərindən deməsi daha münasibdir.Çünki çoxu çərçivəli formada iki qullədir.Əgər iki qullədən cuzi olaraq azalarsa ondan az olar.Hökmün bünövrəsi isə suyun iki qulləyə çatması yaxud çatmamasıdır.İki qullənin İraq çəkisi ilə beşyüz ratl olması məsələsi isə dəqiq ölçü deyil yaxınlaşdır-madır.Əgər həmin həcm bir ratl yaxud iki ratl az olarsa zərər verməz və iki qullə adlanar.Çünki bu həcm nassla varid olmuşdur.

[18] Riyazi hesab ilə təqribən 80.357 ratl edir.

[19] Müasir alimlər müasir ölçülər ilə qüllənin miqdarının nə qədər olmasında ixtilaf ediblər. Şeyx Abdullah bin Muni bunun 203 litr olduğunu deyir. Şeyx Muhamməd Süleyman Abdullah əl-Əşqar isə “əl-Mucəllə” kitabında bunun təqribən 193 litr olduğunu deyir. Doktor Muhamməd Cumə də buna yaxın rəqəm söyləmişdir.

[20] Bir zira’ təqribən 54 santimetrdir və beləliklə bir zira’ və onun dörddə biri 67,5 santimetr etməlidir. Şeyx əl-Əşqar diqqət çəkərək deyir ki, buna əsasən iki qüllənin həcmi 300 litrə yaxın etməlidir və bununla da qüllələrin vəzn və həcm baxımından ölçülməsi arasındakı böyük fərq aşkar görünmüş olur.

[21] İstifadəsi mübah olan su ilə istifadəsi haram olan suların qarışıq düşməsi, və ya tahur su ilə nəcis suyun qarışıq düşməsi buna misal ola bilər, hətta mübah və ya tahur suyun sayı çox olsa belə. Lakin tahur su ilə nəcis suyun qarışıq düşməsi halında, əgər yuxarıda zikr olunan qaydalara əsasən onları qarışdırıb nəcis suyu təmizləmək mümkündürsə, bunu etmək vacib olar.

## Qablar bölümü

Hər bir təmiz qabın, qiymətli olsa belə saxlanması və istifadəsi mübahdır. Qızıl, gümüş və onların suyuna salınmış qablar isə müstəsnadır.

Onlarda və qəsb olunmuş qablarda alınan təharət səhihdir.

Həmçinin bəzək məqsədi olmadan azca gümüş ilə lehimlənmiş qab mübahdır.

Kafirlərin qabları və paltarları təmizdir.

Bir şeyin murdar olduğu bilinmədiyi müddətcə o şey şəkk ilə murdar olmaz.

Leşin sümüyü, buynuzu, dırnağı, hafiri[22], vətəri və dərisi murdardır və dərisi aşılanma ilə təmizlənmir.[23] Pişik və siçan kimi əti yeyilməyən heyvanlar olsa belə sağlığında təmiz sayılan heyvanların leşlərindəki tük, yun, lələy[24] təmizdir.

Qabların örtülməsi və tuluqların bağlanması müstəhəbdir.[25]

---

[22] Hafir məməli heyvanların dırnaqlılar sinfinə aid olan heyvanların dırnağının adıdır. Onlar ya təkdırnaqlı, ya da cütdırnaqlı olurlar. At, inək, dəvə, qoyun kimi heyvanların dırnağına ərəblər hafir deyirlər.

[23] Lakin həyatda təmiz olub, ölümü ilə leş olan heyvanların dərisinin aşılanması və noxud, mərci, buğda kimi quru olan mallar üçün istifadəsi mübahdır. Maye və yağ halında olan ərzaqlar üçün istifadə etmək olmaz. Aşılandıqdan sonra quru şeylər üçün istifadəsinin mübah olması satılmasının caiz olması anlamına gəlməz, istifadəsi mübah olsa belə satılması haramdır, çünki aşılanma leşin dərisini təmizləmir. Fayda üçün zikr etməliyik ki, heyvanı dərisinə görə kəsmək olmaz.

[24] "əl-Mustəv'ib" kitabında ağrı verdiyi üçün heyvanın tükünün dartılıb qopardılması haram sayılmışdır, "ən-Nihəyə" kitabında isə məkruh sayılıb.

[25] Alləmə İbnun-Nəccər əl-Fətuhi "əl-Muntəhə" kitabında deyir ki, qabları örtmək və tuluğları bağlamaq vaxtın gecə və ya gündüz olmasından asılı olmayaraq sünnətdir. əl-Həccəvi isə "əl-İqna`" kitabında (1/21) kitabında deyir: "Axşam olduğu zaman." Həmçinin qapıları bağlamaq, işıqları, lampaları, kösovları söndürmək də sünnətdir.

## İstinca və ayaq yoluna çəkilməyin ədəbləri

İstinca, təmizləyici su və yaxud təmiz, mübah[26] və pak edici daş vasitəsi ilə iki yoldan çıxanı[27] aradan qaldırmaqdır.

Daş və ona bənzər olan şeylərlə[28] təmizlənmək, sudan başqa heç bir şeyin apara bilməyəcəyi qədər izin qalmasıdır. (Sidik və nəcasətin çıxdığı) yeri bütövlüklə örtəcək şəkildə üç dəfə silməkdən daha azı yetərli deyildir.

Su ilə təmizlənmək, (sidik və nəcasətin çıxdığı) yerin əvvəlki kələ-kötürlüyünün qayıtmasıdır[29] və (dərinin əvvəlki halına qayıtmasını) zənn etməsi kifayət edir.

Daş ilə, sonra isə su ilə istinca etmək müstəhəbdir. Əksinə edərsə məkruh olar. Bu ikisindən birinin edilməsi yetərlidir. Su, daha yaxşıdır.

İstinca zamanı qibləyə tərəf üz tutmaq və ona tərəf arxanı çevirmək məkruhdur.[30]

Peyin, sümük və yeməklə - heyvanın qıdası olsa belə - istinca etmək haramdır.[31] Əgər edərsə bundan sonra sudan başqa heç bir şey

---

[26] Beləliklə oğurlanmış, qəsb olunmuş və buna bənzər istifadəsi haram olan daşlar ilə edilən istinca səhih deyildir.
[27] Yəni sidik və nəcisi.
[28] Daşa bənzər şeylər ilə qəsd olunan salfetka, əski, taxta parçası və bunlara oxşar digər şeylərdir.
[29] Şeyx əl-Kərmi bu kitabını əl-Fətuhi'nin "əl-Muntəhə" kitabından ixtisar etdiyi üçün burada əl-Fətuhi'nin işlətdiyi sözü işlətmişdir. Lakin burada sadəcə olaraq sidik və nəcisin çıxdığı yerin əvvəlki halına dönməsi şəklində söyləsəydi daha yaxşı olardı, çünki dərinin kobud olması daha çox kişilərə xasdır. Ona görə də Alləmə Muhamməd bin Əhməd əl-Xalvati "əl-Muntəhə" kitabına yazdığı haşiyəsində (səh: 149) deyir: "Əgər "yerinin əvvəlki halına qayıtması" desəydi qadınlar və uşaqlar baxımından daha aydın olardı."
[30] Burada Şeyx əl-Kərmi "fəzada", yəni çöllük, boşluq bir yerdə bunun məkruh olduğunu xüsusiləşdirməmişdir, lakin "əl-Ğayə" kitabında bunu qeyd etmişdir. Məzhəbin görüşünə görə evlərin içində qibləyə tərəf üz çevirmək və ya arxa çevirmək məkruh deyildir, caizdir.
[31] Şeyx əd-Duməni deyir: "Çünki peyğəmbər – salləllahu aleyhi va səlləm – peyin və sümük ilə isticmar etməyin qadağan olmasının səbəbini onların cinlərdən olan qardaşlarımızın qidası olmaqla izah etmişdir, o zaman bizim və

yetərli olmaz[32], necə ki, çıxan (sidik və ya nəcis) adətən toxunduğu yerdən başqa yerlərə də yayılarsa (sudan başqa bir şey ilə təmizlənmək keçərli olmaz).[33]

Təmiz bir şey və (çıxdığı) yeri bulamayan nəcis istisna olmaqla hər çıxan şey üçün istinca etmək vacibdir.

## Fəsil

Ayaq yoluna girənin birinci sol ayağını qoyması və "bismilləh"[34] "əuzu billəhi minəl-xubsi vəl-xabəis"[35] sözlərini deməsi müstəhəbdir.

Oradan çıxdığı zaman isə birinci sağ ayağını önə atır və "ğufranəkə,"[36] "əlhəmdu lilləhilləzi əzhəbə annil-əzə və afəni"[37] sözlərini deyir.

Ayaq yoluna çəkilmiş olduğu halda günəşə, aya[38] və külək əsən istiqamətə üz tutmaq, danışmaq[39], qabın içinə, dəliyə, atəşə və külün

---

heyvanlarımızın qidası haram olmaq və (isticmar üçün) yararlı olmamaq baxımından daha münasibdir." ("Haşiyətud-Duməni", səh: 141)

[32] İstənilən haram əşya ilə istinca edənə sudan başqası kifayət deyil.

[33] Çıxan nəcis və ya sidik adətən buladığı yerdən artığını bulayarsa, adət yerindən kənara çıxanı sudan başqası ilə yumaq olmaz. Adət yerində olanda isə daş və bənzəri kifayətdir. Həmçinin nəcis və ya sidik adət yerində quruyarsa, sudan başqası kifayət etməz.

[34] İbn Macə (297) ; Hədisi Əli (r.a) rəvayət etmişdir.

[35] əl-Buxari, (142); Muslim, (375); Hədisi Ənəs (r.a) rəvayət etmişdir.

[36] Tirmizi (7) Aişə'dən (r.a) rəvayət etmişdir. əl-Hafiz ibn Hacər "Nətəicul-Əfkər" kitabında (1/214) deyir: "Bu, həsən səhih hədisdir".

[37] İbn Macə (301) hədisi Ənəs'dən (r.a) rəvayət etmişdir. əl-Hafiz ibn Hacər "Nətəicul-Əfkər" kitabında (1/217) deyir: "İbn Macə onu məhz bu cür nəql etmişdir. Onun raviləri İsmayıl istisna olmaqla etibarlı ravilərdir". Hədis zəif olsa da məzhəbin görüşünə görə bu kimi dua və zikrlərdə zəifliyi şiddətli olmayan hədislərlə əməl etmək olar.

[38] İmam İbnul-Qayyim demişdir: "Peyğəmbərdən - sallallahu aleyhi va səlləm - buna dair, səhih, zəif, mürsəl və muttəsil isnadla bir kəlmə belə nəql edilməmişdir. Bu məsələnin şəriətdə heç bir əsli yoxdur." ("Miftəhud-Dəris-Səadə", 2/205-206) Alləmə İbn Muflih "əl-Muharrar" kitabına yazdığı qeydlərində deyir: "Bu məsələ məşhur olsa da bəziləri bunu zikr etməyib, ola bilsin ki, onlar bu görüşdə deyillər. Bir şeyin məkruh olması dəlilin olmasını tələb edir və əsli hökm məkruh olmamasıdır. Peyğəmbərin – salləllahu aleyhi va səlləm – "lakin şərqə və qərbə tərəf üz tutun" sözünün zahiri bunun məkruh olmamasına dəlalət edir." ("ən-Nukət val-Fəvaid əs-Səniyyə", 1/9)

üzərinə sidiyə çıxmaq məkruhdur. Ayaq üstə sidiyə çıxmaq məkruh deyildir.[40]

Səhrada sipər olmadan qibləyə üz tutmaq və arxanı çevirmək haramdır. Ətəyini buraxması isə kifayət edir.[41]

Keçilən yolda, (insanların) faydalandığı kölgəlikdə, üstündə insanların yararlandığı meyvəsi olan ağacın altında və müsəlmanların qəbirləri arasında sidiyə çıxmaq və çölə çıxmaq və ehtiyac duyulan vaxtdan çox qalmaq[42] (haramdır).[43]

## Misvak bölümü

Parçalanmayan nəm çubuqla[44] dişləri təmizləmək sünnətdir. Bu, mütləq şəkildə sünnətdir,[45]amma oruclu üçün günəş zeniti keçdikdən

---

[39] əl-Ğayə:1/18, əl-İqna:1/15 kitablarında demişdir: Kör və qafil kimi məsum birini xəbərdarlıq etmək üçün söz demək vacibdir. əl-Muntəhə:1/13 kitabında: Mütləq şəkildə danışmaq məkruhdur.

[40] Əgər üstünə sidiyin sıçramayacağından əmindirsə ayaq üstə sidiyə çıxmaq məkruh deyildir.

[41] Yəni ehtiyacını ödəyərkən paltarının ətəyini aşağı buraxması və bununla da paltarını qiblə ilə arasında sədd etməsi kifayət edir. Bunun üçün divar, qaya, dağ, at yəhəri kimi şeyləri də sipər kimi istifadə etmək olar.

[42] Şeyx əd-Duməni deyir: "Qaranlıq olsa belə."

[43] Alləmə əd-Duməni burada bəzi faydalar zikr edir: "Hamama, tualetə ehtiyacı olana oradan istifadə etməyə qadağa qoymaq, hətta məktəb və ribat kimi müəyyən qrup insan üçün vəqf olunmuş yer və şəxsi mülk olsa belə haramdır, ona ücrət düşmür. Əgər zimmət əhlinin müsəlmanların təharət yerlərinə daxil olmaqlarında müsəlmanlar üçün darlıq və ya natəmizlik və ya suyun korlanması və buna bənzər hallar varsa, onlara (daxil olmağı) qadağan etmək vacibdir. Bunu Şeyx Təqiyyud-Din (İbn Teymiyyə) deyib. Şeyx Mənsur (əl-Buhuti) bununla eyni mənada deyib: "Rafizilər kimi sünnət əhli arasında fəsad etmək ilə tanınanlar təharət yerlərinə daxil olmaqdan qadağan edilməlidirlər." ("Haşiyətud-Duməni", səh: 150-151)

[44] Alləmə İbn Bədran əd-Diməşqi deyir: "Yəni, (dişləri) yaralamayan, ovulub tökülməyən və zərər verməyən hər çubuqla (təmizləmək sünnətdir.) Deyirəm: Bu gün "fırça" adı ilə bilinən şeylə də misvak edə bilər, çünki bununla məqsəd dişlərin təmizlənməsidir. (Həmçinin) söyüd və qovaq çubuğu ilə də olar, lakin

sonra istisna vardır, belə ki, onun üçün məkruhdur.[46] Bundan öncə isə quru çubuqla etməsi sünnətdir, nəm çubuq ilə etməsi isə mübahdır. Çubuqdan başqa bir şeylə dişlərini təmizləyən sünnəyə müvəffəq olmamışdır.

Dəstəmaz, namaz, Quran oxunuşu, yuxudan oyanma və ağız qoxusunun dəyişməsi zamanı həmçinin məscidə, evə daxil olarkən, uzun müddət davam edən sükutdan sonra və dişlər saraldıqda (misvakdan istifadə etmək) xüsusilə önəmlidir.[47]

Bir çubuq ilə iki və daha çox şəxsin dişlərini təmizləməsində heç bir qəbahət yoxdur.[48]

## Fəsil

Qasığı qırxmaq, qoltuqdakı tükləri yolmaq, dırnaqları tutmaq[49], güzgüyə baxmaq, ətir vurmaq, hər gecə hər gözə üç dəfə sürmə çəkmək, bığı çox azaltmaq və saqqalı artırmaq sünnətdir. Saqqalı

---

Arak ağacının çubuğu daha əfzəldir." ("Əxsarul-Muxtəsarat məa Haşiyəti İbn Bədran", səh: 92)

[45] Şeyx əd-Duməni deyir: "Yəni bütün vaxtlarda sünnətdir. Alimlərin bunun ümmət üzərində təkid olunmuş sünnət olduğunda ittifaq ediblər." ("Haşiyətud-Duməni", səh: 153)

[46] Alləmə əl-Ləbədi deyir: "Məzhəbin görüşü budur. Bunun oruclu üçün də hər bir vaxtda sünnət olduğu da deyilmişdir. Təhqiqatçı alim Muhamməd əs-Səffərini bu görüş üzərində durmuş və bu barədə bir risalə yazmış, orada bu görüş üçün aşkar sübutlar və dəlillər qarşıya qoymuşdur. Misvak peyğəmbər üçün – salləllahu aleyhi va səlləm – vacib idi." ("Haşiyətul-Ləbədi", səh: 17) Beləliklə məzhəbin görüşünə görə oruclu üçün zöhrdən öncə misvak sünnətdir, lakin zöhr vaxtı girdikdən sonra məkruhdur. Bunun dəlili isə budur ki, "oruclunun ağzından gələn qoxu Allah yanında müşkdən də gözəldir." Ağız qoxusu isə zöhr vaxtı girdikdən sonra üzə çıxır.

[47] Yəni bu hallarda misvakı istifadə etməyin fəziləti daha çoxdur.

[48] İstifadə etdikdən sonra çubuğun üstündəkiləri yumaq müstəhəbdir.

[49] Bu üç sünnəti, həmçinin bığları çox qısaltmağı da cümə günü namazdan əvvəl etmək müstəhəbdir.

qırxmaq isə haramdır. Ondan bir ovucdan çox olan hissəsini almaqda isə heç bir qəbahət yoxdur.[50]

Həddi-büluğa çatdıqda həm kişi, həm də qadına xitən vacib olur[51], bundan öncə edilməsi isə daha yaxşıdır.

## Dəstəmaz bölümü

Dəstəmazda bəsmələ çəkmək vacibdir və səhvən[52] (tərk edildikdə vaciblik hökmdən) düşür. Əgər dəstəmaz əsnasında (unutduğunu) xatırlayarsa yenidən başlamalıdır.[53]

(Dəstəmazın) fərzləri altıdır: Üzü yumaq - ağızın yaxalanması və buruna suyun çəkilməsi də bura daxildir - , qolları dirsəklər də daxil olmaqla yumaq, bütün başa məsh çəkmək - qulaqlar da (başdan)

---

[50] əl-İqna` (1/23) kitabında əl-Həccəvi'nin işlətdiyi sözlər budur: "Bir ovucdan artıq gələni və boğazının altında olanı aldırmaq məkruh deyildir." Allamə Əli bin əl-Bəhə əl-Bəğdədi (hicri 822-900) deyir: "Bir tutumdan az olan hissədən götürmək məkruhdur. (İmam Əhməd) bunu bir-mənalı şəkildə bildirib. Çünki sünnət saqqalı (ona toxunmadan) çoxaltmaqdır. Bir tutumdan artığını götürməyi məkruh saymamağımız isə İbn Ömərin felinə görədir, belə ki, o, hədisi rəvayət edəndir və oradakı məqsədin nə olduğunu daha yaxşı bilir. Bundan artıq olanı isə fitrətə müxalifdir." ("Fəthul-Məlikil-Aziz bi Şərhil-Vaciz", 1/223) Buradan biz saqqalla bağlı fərqli halların hökmlərini anlamış oluruq. Saqqalı toxunmadan uzatmaq sünnətdir, bir ovucdan artıq olan hissəsini kəsmək mübahdır, bir ovucdan az olan hissəni kəsmək məkruhdur. Saqqalı qırxmaq isə haramdır.

[51] İbn Bədran əd-Diməşqi "Əxsarul-Muxtəsarat" kitabına yazdığı haşiyəsində (səh: 92) deyir: "İmamdan gələn digər rəvayətə görə bu, qadına yox, kişiyə vacibdir, bunu (İbn Muflih) "əl-Furu" kitabında zikr edir. Bu günlərdə əməl bu rəvayət üzərindədir." İbn Bədran isə hicri 1346-cı ildə, miladi tarixlə 1927-ci ildə vəfat edib.

[52] Həmçinin dəstəmaz alanın bəsmələnin hökmündən cahil olduğu üçün də vaciblik hökmündən düşər.

[53] Allamə əl-Ləbədi deyir: «Müəllif Allamə (əl-Kərmi) vaxtın geniş olması və suyun çox olması halında bəsmələ deyib yenidən başlamağı, vaxtın dar və ya suyun az olduğu halda bəsmələ çəkib qaldığı yerdən davam etməsini əsaslı saymışdır. Bu, iki görüş arasında duran orta mövqedir və gözəl bir təfsilatdır." ("Haşiyətul-Ləbədi", səh: 19)

sayılır - , ayaqları topuqlar da daxil olmaqla yumaq, tərtib[54] və muvalə[55].

Şərtləri isə səkkizdir: Onu vacib edəcək səbəbin kəsilməsi[56], niyyət[57], müsəlman olmaq, ağıl, təmyiz[58], təmizləyici mübah su, dəriyə çatmağa mane olanın kənarlaşdırılması və istinca yaxud isticmar.

---

[54] Tərtib Quranda zikr olunan üzvlər arasında vacibdir, yəni üzü, sonra əlləri yumaq, sonra başı məsh etmək və sonra ayaqları yumaqda tərtibə riayət etmək fərzdir. Əgər tərtibi pozarsa, tərtib üzərə yuduğu son üzvdən davam etməlidir. Sağdan sonra solu yumağa gəldikdə isə bu barədə Alləmə İbn Əbi Təğləb deyir: "Əllərdə və ayaqlarda sağ ilə sol arasındakı tərtibə gəldikdə isə bu, vacib deyildir. İbnul-Munzir buna dair icma nəql etmişdir." ("Neylul-Məərib bi Şərh Dəlil ət-Talib", 1/60)

[55] Muvalə, mötədil vaxt çərçivəsində bir üzv qurumadan digər üzvü yumağı gecikdirməməkdir. Lakin burada etibara alınan qurumağın həqiqəti deyil, mötədil hava şəraitində adətən üzüvün quruduğu vaxtın keçməsidir. Əgər üzvün yuyulmasını ondan əvvəlki üzvün mötədil hava şəraitində quruyacağı qədər gecikdirərsə, muvalə pozular. Əgər üzvü yuduqdan sonra mötədil hava durumunda üz misal olaraq beş dəqiqədən sonra quruyursa, deməli beş dəqiqə keçsə və dəstəmaz alan əllərini yumağa başlamasa, dəstəmazı pozulacaq, yenidən başlaması lazım olacaq. Ola bilər ki, digər hava şəraitlərində üzv daha tez qurusun, və ya əksinə uzun müddət qurumasın, lakin hər bir halda etibara alınan mötədil hava şəraitidir, ona görə bizim misalda beş dəqiqə sonra üz qurumasa belə muvalə pozulacaq. Qeyd edək ki, muvalə tərtibdə bir birinin ardıyca gələn üzvlərdə vacibdir, məsələn üz və əllər arası, əllər və baş arası, baş və ayaqlar arası. Həmçinin niyyət ilə üzü yumaq arasında da muvalənin pozulmaması lazımdır. Yəni, hansısa üzvün yuyulduqdan sonra mötədil hava şəraitində quruyacağı qədər çox vaxt keçməməlidir. Baş ilə ayaqlar arasında muvalədə isə, başın yuyulacağı təqdir olunmalı, və bundan sonra nə vaxta quruyacağı nəzərə alınmalıdır.

[56] Yəni dəstəmazı pozan amillərin qurtarması qəsd olunur. Misal üçün əgər bədəndən qan axırsa qanın kəsilməsi lazımdır, ya da dəvə əti yeyilirsə yeyib qurtarmaq lazımdır.

[57] Niyyət, həm vacib, həm də müstəhəb olan dəstəmaz və qüsul üçün şərtdir. Kitab əhlindən olan qadın da digər müsəlman qadınlar kimi heyzdən, nifasdan təmizlənib qüsul almayana qədər müsəlman ərinə halal olmaz və kitab əhlindən olan qadın bu məqsədlə qüsul alarkən niyyət etməsi şərt deyil. Həmçinin müsəlman qadın əri ilə əlaqədə olmamaq üçün heyz və nifasdan təmizləndikdən sonra qüsul almaqdan imtina edərsə, əri onu məcburi qüsul aldıra bilər və belə halda üzr olduğu üçün niyyət olmasa da səhihdir. Lakin bu qüsul ilə cinsi əlaqədən başqa qüslun şərt olduğu heç bir əməl mübah olmaz. Həmçinin kitab əhlindən olan qadın müsəlman olarsa aldığı həmin qüsul ilə namaz qıla bilməz. Kitab əhli qadının qüsl aldığında bəsmələ çəkməsi haqqında Alləmə əl Xalvati buyurur ki, bu haqda məzhəbdə iki vəch var: İnsaf və İqna kitabında vacib olmaması qeyd olunur, Məunətu Ulin Nuhə kitabının zahiri isə vacib olmasıdır.

## Fəsil

Buradakı niyyət, hadəsi aradan qaldırmağı qəsd etmək və yaxud namaz, tavaf və mushafa toxunmaq kimi təharətin olmasını vacib edəcək bir şeyi qəsd etməkdir. Yaxud da (Quran) oxumaq, zikr etmək, yatmaq, şübhəni aradan qaldırmaq[59], qəzəb və haram söz[60], məsciddə oturmaq, elm öyrənmək və yemək yemək kimi (dəstəmazın) müstəhəb olduğu halları qəsd etməkdir. Bunlardan birini niyyət etdikdə hadəsi aradan qalxır.

Niyyət etdiyi şeydən başqasını xəta ilə dilində söyləməsi[61], həmçinin hər bir ibadəti bitirdikdən sonra niyyətində, yaxud da hər hansı bir fərzində[62] şəkk etməsi zərər vermir. Əgər (dəstəmaz) əsnasında bu barədə şəkkə düşərsə yenidən başlamalıdır.[63]

---

[58] Təmyiz uşaq üçün qoyulmuş bir yaş ölçüsüdür. Hənbəli alimlərinin çoxuna görə təmyiz yaşı yeddi yaşdır, beləliklə onlara görə yeddi yaşlı uşaq "mumeyyiz" uşaq sayılır. Lakin Əbu Abdilləh Şəmsud-Din əl-Bəali deyir: "O, ona edilən xitabı anlayan və cavab verə bilən bir uşaqdır, dəqiq yaşla müəyyən edilməz, əksinə anlayışların fərqli olması ilə (yaşları) fərqlənə bilər." ("əl-Mutli alə Əbvabil-Muqni", səh: 67) Lakin bu kitabda mumeyyiz uşaq deyildikdə və ya təmyiz zikr edildikdə bununla yeddi yaşlıq uşaq və ya yeddi yaş həddi qəsd olunur.
Müsəlman olmaq, əql və təmyiz bütün ibadətlərdə şərtdir, yalnız həcc istisnadır, çünki həcdə təmyiz şərt deyildir. Bunu Alləmə İbrahim ibn Duveyyən "Mənərus-Səbil" kitabında (səh: 49) söyləyir.

[59] Yəni, dəstəmazlı olub olmaması şübhəsini.

[60] Yəni qəzəbləndikdən sonra dəstəmaz almaq müstəhəbdir. Həmçinin qeybət, nəmimə kimi haram olan sözlərdən sonra dəstəmaz almaq müstəhəbdir. Bu, kimi hallarda dəstəmaz alarkən bu səbəblərə görə dəstəmaz almağı niyyət edirsən.

[61] Yəni «zöhr namazı qılmağı niyyət etdim" demək əvəzinə "əsr namazı qılmağı niyyət etdim" deməsi niyyətə zərər etməz, çünki niyyətin yeri qəlbdir. Dildə söyləmək isə qəlbdəki niyyəti təkid etmək üçün və niyyəti unutmaqdan və ya niyyətdə xəta etməkdən qorunmaq üçündür.

[62] Misal üçün əgər hər hansı bir üzvü yuyub yumamasında və ya başına məsh çəkib çəkməməsində ibadəti bitirdikdən sonra şəkk edərsə bu, heç bir zərər verməz.

[63] Müəllifin qəsd etdiyi niyyətində şübhə etməsdir, beləliklə dəstəmaz əsnasında niyyətində şəkk edən yenidən başlamalıdır. Hansısa üzvü yuyub yumamasında

## Dəstəmaz almağın şəkli barədə fəsil

**(Dəstəmaz almağın şəkli) belədir**:

Niyyət edir, sonra bəsmələ çəkir[64] və əllərini (biləklərinə qədər) yuyur. Sonra ağzını yaxalayır və burnuna su çəkir. Sonra saçın adətən bitdiyi yerə nəzərən üzünü yuyur. Saqqalın üstünü yumaq yetərli deyildir, lakin dərini tam örtəcək şəkildə olması istisnadır.[65] Sonra dirsəklər də daxil olmaqla qollarını yuyur və (bu zaman) dırnaqların arasında və bənzəri yerlərdə[66] olan azca çirkin zərəri yoxdur.[67] Sonra üzün kənarından başlayaraq ənsə adlanan yerə qədər bütün başının üstünə məsh çəkir, qulaqların üst hissəsindəki ağlıq da (başa) daxildir və şəhadət barmaqlarını qulaqların içinə salıb baş

---

şəkk edən isə həmin üzvə qayıtmalı və onu yumalıdır, bundan sonra isə təriblə dəstəmazına davam etməlidir.

[64] İbn Əbi Təğləb deyir: "Yəni "bismilləh" deyir və bundan başqasını söyləmək keçərli deyildir. "Bəsmələ"nin vacib olduğu bütün yerlər bunun kimidir. (Müəllifin) "sonra" deyərək bir-birinin ardınca zikr etməsinin zahirindən anlaşılan budur ki, əgər niyyətdən öncə "bəsmələ" etsə dəstəmazı səhih olmaz. Bu faydanı şeyximiz əl-Bəlbəni zikr edib." ("Neylul-Məərib", 1/62) Beləliklə buradan iki şey öyrəndik. Əgər kimsə "bismilləh" əvəzinə "bismir-rahmən" söyləsə dəstəmazı səhih deyildir.

[65] Saqqal seyrək olduqda onun altındakı dərini də yumaq lazımdır, lakin sıx olduqda sadəcə saqqalın üstünü yumaq kifayət edir. Sıx saqqal o saqqaldır ki, onun altındakı dəri görsənmir. Dəri görsənərsə, deməli saqqal seyrəkdir. Bığ, qaşlar, aşağı dodağın altında bitən tüklərin hökmü də saqqalın hökmü kimidir.

[66] Misal üçün burnun içində çirkin olması zərər verməz.

[67] Şeyx əl-Ləbədi deyir: «Elm tələbəsi olan qardaşlarımızdan, hətta şeyxlərimizdən çox vaxt eşidirik ki, böyük hadəsdən qüsl alarkən bu, (yəni azca çirk) bağışlanılmır, yalnız dəstəmazda bağışlanır. Ola bilsin ki, onlar bunu saçın - sıx olsa belə - altındakı dərini yumağın dəstəmazda yox, qüsulda şərt olmasından götürüblər. Yoxsa mən bunu alimlərimizin sözlərində açıq şəkildə deyildiyini görmürəm. Mənə görə isə bunun qüsulda da bağışlanılması əsaslıdır, çünki ondan (yəni dırnaq və buna bənzər yerlərdə olan çirkdən) qorunmaqda məşəqqət/əziyyət vardır, saçın dibini yumaq isə fərqlidir, çünki bunda məşəqqət yoxdur. Əgər belə şey bağışlanılmasaydı o zaman (alimlərimiz) qüsul bölməsində bunu açıq şəkildə deyərdilər. Sadəcə olaraq burada zikr edildiyinə etimad edərək orada (azca çirkdə) güzəşt ediləcəyini açıq sözlərlə ifadə etməyiblər, çünki bu nöqtədə bu iki təharət arasında bir fərq yoxdur. Mənim anladığım budur. Doğrusunu Allah bilir." ("Haşiyətul-Ləbədi", səh: 21)

barmaqları ilə çöl hissəsini məsh edir[68]. Sonra topuqlar da daxil olmaqla ayaqlarını yuyur və topuqlar kənara çıxan iki sümükdür.[69]

## Fəsil

Dəstəmazın sünnətləri on səkkizdir: qibləyə yönəlmək, misvak[70], əlləri biləklərə qədər üç dəfə yumaq, üzü yumadan öncə ağızı yaxalamaq və buruna su çəkməklə başlamaq, oruclu istisna olmaqla bu ikisində mübaliğə etmək[71] və mütləq şəkildə[72] digər əzalarda mübaliğə etmək və üz üçün suyu artırmaq.

Sıx saqqalın arasını[73] və barmaqların aralarını ovxalamaq[74], qulaqlar üçün əlavə su götürmək, sağı soldan öncə yumaq, fərz olan hissədən artıq olan yerləri də yumaq[75], ikinci və üçüncü dəfə yumaq[76],

---

68 Qulaqları da tam məsh etmək lazımdır. Lakin qulağın yuxarı hissəsindəki qığırdaqların altında görsənməyən yerlər istisnadır.
69 Dəstəmaz əsnasında əvla olan kəlamı tərk etməkdir. Lakin əksər hənbəlilərin sözünün zahiri dəstəmaz alana salam verməyin və onun salamı qaytarmasının məkruh olmamasıdır.
70 Yəni dəstəmaz əsnasında ağzı yaxalayarkən misvakdan istifadə etmək sünnətdir.
71 Yəni ağızı yaxalayarkən və buruna su çəkərkən daha dərinə getmək qəsd olunur, lakin oruclu üçün bu, sünnət deyildir, əksinə məkruhdur, çünki suyun boğazına getməsi riski vardır.
72 Mütləq şəkildə sözü ilə qəsd olunan heç bir istisnanın olmamasıdır, çünki orucluya da dəstəmazın əzalarında mübaliğə etmək sünnətdir.
73 Daha öncə qeyd olundu ki, saqqal sıx olduqda tələb olunan onun üstünü yumaqdır. Yaş barmaqları saqqalın tükləri arasına salmaq və saqqalı ovxalamaq sünnətdir. Şeyx İbn Əbi Təğləb deyir: "Diləsə saçını məsh edərkən də (barmaqlarını arasına salıb oxvalaya bilər)". ("Neylul-Məərib", 1/64) Sıx saqqalın dibini yumaq isə məkruhdur.
74 İbn Məni' haşiyəsində (səh: 11) deyir: "Yəni əllərin və ayaqların barmaqları; "əş-Şərh"də deyir: "Bunun ayaqlarda edilməsi daha çox təkid edilib, beləliklə sol əlinin çeçələ barmağı ilə sağ ayağının alt tərəfindən, balaca barmaqdan böyüyə doğru aralarını ovxalayır, sol ayağında isə bunun əksini edir. Əllərinin barmaqlarını isə bir-biri ilə ovxalayar..."
75 Bu, üz, əllər və ayaqlara aiddir. Başa məsh edildikdə isə boyuna məsh etmək müstəhəb deyil.
76 Bu da üz, əllər və ayaqlara aiddir. Başa məshi təkrarlamaq isə müstəhəb deyil.

dəstəmazın sonuna qədər niyyəti xatırlamağa davam etmək, (niyyəti) əlləri biləklərə qədər yuyarkən etmək və onu gizlicə söyləmək.[77]

Həmçinin (dəstəmazı) bitirdikdən sonra baxışlarını səmaya yönəldərək "əşhədu əllə iləhə illəllahu vahdəhu lə şərikə ləhu və əşhədu ənnə muhammədən abduhu və rasuluh"[78] sözünü söyləmək[79].

Bir də heç kəsin yardımı olmadan insanın dəstəmazını özünün yerinə yetirməsi[80].[81]

## Xofların üzərinə məsh çəkmək bölümü

---

[77] Niyyəti gizlicə dildə söyləmək məzhəbin görüşünə görə müstəhəbdir. İbn Muflih "əl-Furu" kitabında, əl-Mərdəvi "əl-İnsaf"da və "ən-Tənqih"də, əl-Fətuhi "Muntəhə əl-İradət" kitabında və müəllif burada bunun məzhəbin görüşü olduğunu bəyan edib. Lakin əl-Həccəvi bu məsələdə Şeyxul-İslam İbn Teymiyyə və İbnul-Qayyim'in görüşünə tabe olaraq bunun bidət olduğunu demişdir. Bu məsələdə ümumən məzhəbdə iki vəch vardır. Alləmə Aləud-Din əl-Mərdəvi deyir: "Fayda: İki vəchdən birinə əsasən niyyəti tələffüz etmək müstəhəb deyildir və bu, Əhməddən açıq şəkildə gəlmişdir. Bunu Şeyx Təqiyyud-Din (İbn Teymiyyə) deyib. Dedi: "Doğru olan budur." İkinci vəch isə budur ki, onu gizlicə tələffüz etmək müstəhəbdir və bu, məzhəbin görüşüdür." ("əl-İnsaf", 1/142)

[78] Muslim (1/210); hədisi Uqba ibn Amir (r.a) rəvayət edir.

[79] əl-İqna kitabında bunun həm də qüsuldan sonra deyilə biləcəyi zikr olunub. İbn Muflih "əl-Furu" kitabında deyir: "Bunun qüsuldan sonra da deyilməsi əsaslıdır, lakin (alimlər) bunu zikr etməyiblər." Şeyx əl-Ləbədi deyir: "Dəstəmaz zamanı əzaları yumaqla bağlı zikrlər və dualar gəlib ya yox? Peyğəmbərdən – salləllahu aleyhi va səlləm – , nə səhabələrdən, nə tabiindən, nə də dörd imamdan bu barədə heç bir şey gəlməyib. Bu barədə yalan bir hədis vardır ki, onunla əməl olunmaz." ("Haşiyətul-Ləbədi", səh: 23)

[80] İbn Əbi Təğləb deyir: "(Dəstəmaz almaq üçün) köməkdən istifadə etmək və əzaları qurulamaq mübahdır, lakin bunları etməmək daha yaxşıdır." ("Neylul-Məərib", 1/65)

[81] Şeyx əl-Ləbədi bu bölmədə belə bir fayda zikr edir: «Məsləhət üçün məsciddə dəstəmaz üçün bir yer düzəltmək olar və bunda heç bir qadağa yoxdur, lakin belə bir yerdə nəcasəti yumaq icazəli deyildir. Əgər məsciddə ətrafında arxları olan su hovuzu varsa və ətrafında namaz qılınmırsa, necə ki, Əzhər camisi və Misirin digər camiləri belədir, belə yerlərdə sidiyə çıxmaq və suyu ilə istinca etmək olarmı? Şeyxul-İslam İbn Teymiyyə dedi: Bu, məscidin içində şüşə qaba sidiyə çıxmağa bənzəyir. Ən münasib görüş budur ki, əgər bunu ehtiyac üçün edirsə caizdir. Yoxsa bunu sidik və istinca yerinə çevirməyə gəldikdə isə olmaz. Buradan öyrənirik ki, məsciddə olduqda dəstəmaz yerində ehtiyac üçün nəcasətə bulaşmış üzvü həddi aşmadan yumaq caizdir." ("Haşiyətul-Ləbədi", səh: 22) Buradan anlayırıq ki, məscidlərin içərisində tualetlərin tikilməsi bəyənilmir.

(Xoflara məsh çəkmək) yeddi şərt ilə icazəlidir:

Onları, su ilə kamil şəkildə edilən təharətdən sonra geyinmək[82], (bağlarla) bağlamaq yolu ilə olsa belə onların (yuyulması) fərz olan yeri örtməsi[83], örfdə qəbul olunmuş şəkildə onunla yeriməyin mümkün olması[84], onların özlüyündə (ayaqda) qalması[85], mübah olması[86], özlərinin təmiz olması[87], dərini biruzə verməməsi[88].

---

[82] Bu şərtdən iki məsələni anlamış oluruq. Birinci: Təharətin su ilə edilmiş təharət olması şərtdir, yəni əgər təyəmmüm etdikdən sonra xof və ya corab geyinərsə, sonra təyəmmümü pozduqdan sonra məsh çəkmək istəyərsə caiz olmaz. İkinci: Xof və ya corabın dəstəmaz tam şəkildə qurtardıqdan sonra geyilməlidir. Əgər dəstəmaz alıb bir ayağını yuduqdan sonra o ayağına xof geyinərsə, sonra o biri ayağını yuyub ona da xof geyinərsə həmin xoflara məsh çəkmək olmaz. Dəstəmaz pozulmamışdan öncə o xofların hər ikisi də çıxarılmalı və yenidən geyilməlidir. Lakin əgər ümumən su ilə alınan dəstəmaz əsnasında bəzi üzvlərində olan yara üçün təyəmmüm edərsə, və ya hansısa üzvündə şərtləri ilə qoyulmuş sarğıya məsh edərsə, bu dəstəmaz da su ilə alınmış kamil dəstəmaz hesab olunacaq. Bundan sonra digər şərtlər ilə xof geyinərsə, bir sonrakı dəstəmazda ona məsh edə bilər.

[83] Yəni xoflarda dərini göstərəcək hər hansı bir cırıq, deşik olmamalıdır.

[84] Örfdə qəbul olunmuş şəkildə yerimək deyildikdə insanların anlayışında yerimə sayılacaq şəkildə qəsd olunur. Məsh çəkiləcək xof və corab ilə yeriməyin mümkün olması şərtdir. Xoflar və ya corablar üçün yeriyərkən su keçirməməsi şərt deyildir, lakin onlarla ehtiyacını görəcək şəkildə yerimək mümkündürsə onlara məsh çəkmək olar. Allamə Abdur-Rahmən bin Qasim deyir: “Deyiblər ki, səfərdə olanın öz ehtiyacı üçün gedib gələcəyi qədər (onunla yerimək mümkün olmalıdır), çünki davamlı yerimək üçün istifadəsi mümkün olmayan bir şeydə ehtiyac bunu tələb etmir, buna görə də rüxsət onunla bağlı deyildir.” (“Haşiyətur-Ravdil-Murbi”, 1/219) Bu şərtə əsasən nazik corablara məsh çəkmək səhih deyildir, çünki müasir zamanımızdakı nazik corablarla yerimək mümkün deyildir, ayaqqabısız onları cöldə yerimək üçün istifadə etdikdə cırılırlar.

[85] Alimlərimiz bununla bağlı qeyd edirlər ki, xoflar və corablar özləri ayaqda qalmalıdır və düşməməlidir. Onları bağla bağlamaq yolu ilə ayaqda saxlamaq keçərli deyildir. Lakin ayaqqabı geyindikdə onların üzərinə məsh çəkmək olar, ayaqqabı çıxarıldıqda isə məsh pozulur. Bəzilərinin ayaqqabının üstünə məsh çəkdikdən sonra məscidə girməmiş o ayaqqabıları çıxarması və sonra namaz qılması doğru deyildir, belə bir namaz səhih deyildir.

[86] Qəsb olunmuş, oğurlanmış xoflara məsh çəkmək olmaz. Həmçinin ipəkdən hazırlanmış corablara da məsh çəkmək kişilər üçün caiz deyildir. Hətta zərurət olsa belə bu kimi xoflara məsh çəkmək caiz deyildir. Soyuq və ya digər səbəbə görə bu cür xofu soyuna bilmirsə, təyəmmüm etməlidir.

[87] Yəni özlüyündə nəcasət olan xoflara məsh çəkmək olmaz. Misal üçün it dərisi, donuz dərisi və ya ölü heyvan dərisindən – aşılanmış olsa belə - hazırlanmış xoflara məsh çəkmək caiz deyildir. Bu şərtdən həm də onu anlayırıq ki, xoflar özlüyündə nəcis olmazsa məsh çəkmək olar, əgər xofun və ya corabın üzərinə sidik tökülərsə onun üzərinə məsh çəkmək səhihdir. Bu halda mushafa

Muqim olan və asilik səfərinə çıxan onları geyindikdən sonra dəstəmazı pozduğu vaxtdan başlayaraq bir gün və bir gecə, səfərdə olan isə gecələri ilə birlikdə üç gün məsh çəkir.[89]

Əgər səfərdə olarkən məsh çəkərsə, sonra muqim olarsa və ya hadarda məsh çəkərsə, sonra səfərə çıxarsa və ya məshin başlanğıcına dair şübhəyə düşərsə muqimin məshi(nin müddəti)ndən artıq etməməlidir.[90]

Xofun üst tərəfinin böyük bir hissəsinə məsh çəkmək vacibdir və onun altına və daban hissəsinə məsh çəkmək yetərli deyildir, nə də müstəhəb deyildir.[91]

Qüslu vacib edəcək hər hansı bir şey baş verərsə və ya (ayaqdan yuyulması) fərz olan yerin bir hissəsi açılarsa və ya (məshin) müddəti bitərsə dəstəmaz batil olur.[92]

---

toxunması səhihdir, çünki dəstəmazı vardır. Lakin üzərində nəcasət hələ də qaldığı üçün namaz qılması üçün həmin nəcasəti aradan qaldırması lazımdır. Burada da zərurət olub olmaması arasında fərq yoxdur. Bu cür xoflara məsh mütləq səhih deyil. Hansısa səbəbə görə bu cür xofu çıxarda bilməsə, təyəmmüm edər, lakin bir əvvəlki şərtdən fərqli olaraq burada namazını iadə etməli olacaq, çünki irəlidə öyrənəcəyimiz kimi nəcis paltarda qılınan namaz iadə olunmalıdır.

[88] İbn Əbi Təğləb deyir: “Nazik şüşə kimi şəffaflığına görə ya da dərini biruzə verən corab kimi nazikliyinə görə (məsh çəkmək olmaz)” (“Neylul-Məərib”, 1/67)

[89] Muqim bir yerdə yaşayan və yerləşən kəsə deyirlər. Asilik səfərinə çıxan isə asilik etmək üçün səfər çıxanlardır; zina etmək, oğurluq etmək məqsədi ilə səfər edənlər buna misaldır. Beləliklə bu iki qrupa aid müsəlmanlar dəstəmazı pozmadan öncə corablarını geyinərsə həmin coraba bir gün, bir gecə məsh çəkə bilər. Səfərdə olan isə üç gün, üç gecə məsh çəkə bilər. Məshin müddəti dəstəmazın pozulduğu vaxtdan başlayır.

[90] Əgər səfərə çıxmadan öncə yaşadığı yerdə məsh çəkərsə, yaxud səfərdə məsh çəkəndən sonra muqim olarsa, ya da məshi səfərə başlamadan öncə yoxsa sonra çəkdiyində şəkk edərsə, bu halların hamısında məshin müddəti yalnız bir gün, bir gecə olacaq.

[91] Yəni, yalnız xoffun alt və yan tərəfinə məsh səhih olmaz, üst tərəfinə məsh edildikdən sonra isə müstəhəb olmaz.

[92] Burada muvalə şərtinin pozulub pozulmaması arasında fərq yoxdur. Yəni, əgər xoflara məsh çəkib dəstəmazını bitirdikdən bir dəqiqə sonra məshin müddəti bitərsə, yalnız ayaqlarını yumaq kifayət deyil, dəstəmazı başdan etmək gərəklidir.

## Fəsil

Əgər sarğısı olan onu təharətli olduğu halda qoyarsa və (sarğı) ehtiyac olan yerin həddini aşmazsa sağlam olan yerləri yuyar və onun üzərinə su ilə məsh çəkər və bu, yetərli olar, əks halda yumaq ilə bərabər onun üçün təyəmmüm almaq da vacib olur.

Təharətli halda olmadan qoyulmadığı və (ehtiyac olan) yerin həddini aşmadığı müddətcə (sarğının üzərinə) məsh çəkilməz[93], yoxsa (sağlam yerləri) yuyar, məsh çəkər və təyəmmüm alar.

## Dəstəmazı pozan amillər bölümü

---

[93] Şeyx əd-Duməni bu hissəni izah edərək deyir: "Sarğısı ehtiyac duyulan yerin həddini aşmaqla birlikdə təharətli olmadan qoyulduğu müddətcə sarğı sahibinə məsh çəkmək icazəli deyildir. Buradan anlaşılır ki, əgər sarğını təharətli olarkən qoyubsa və sarğı ehtiyac duyulan yerin həddini aşırsa məsh çəkmək caizdir və bunu "yoxsa" sağlam yerləri "yuyar, ehtiyac duyulan yerə "məsh çəkər" və (ehtiyacdan) artıq olan yerə görə "təyəmmüm alar"." ("Haşiyətud-Duməni", səh: 190) Beləliklə əgər sarğı təharətli halda olarkən qoyulubsa və qoyulan sarğı ehtiyac duyulan yerin həddini aşmırsa, yəni yalnız ehtiyac duyulan yeri örtürsə, o zaman salamat yerləri yuyar və sarğının üstünə məsh çəkər. Əgər sarğını təharətli olarkən qoyubsa, lakin sarğı ehtiyac duyduğu yerdən daha böyük hissəni bağlayırsa, artıq olan hissəni çıxartmaq lazımdır. Əgər artıq olan hissəni çıxartmaqla nəfsinə zərər gələcəyindən qorxarsa, o zaman salamat hissələri yuyar, sarğının ehtiyac duyulan hissəsinin üzərinə məsh çəkər və artıq qalan hissəsinə görə təyəmmüm alar. Əgər təharətli olmadan qoyubsa, sarğının ehtiyac hissəni keçib keçməməsindən asılı olmayaraq salamat olan yerlər yuyulmalıdır və təyəmmüm alınmalıdır və bu zaman məsh çəkmək olmaz. Lakin dediyimiz kimi bu halda da zərər olmasa, sarğının ehtiyacdan artıq olan hissəsini çıxartmalıdır. İbn Məni' haşiyəsində (səh: 12) bunları toplayaraq deyir: "Xülasə olaraq sarğının dörd halı vardır: birinci: təharətli olarkən qoyulub və ehtiyac olan miqdardan çox deyildir, bu halda sağlam yerləri yuyur, yaranın üstünə məsh çəkir və təyəmmüm almır. İkinci: təharətli olarkən qoyulub, lakin ehtiyac olan yerdən artığını örtür, bu halda yumalı, məsh çəkməli və təyəmmüm etməlidir. Üçüncü: təharətli olmadan qoyulub, ehtiyac olan yerdən artıq hissəni örtmür. Dördüncü: təharətli olmadan qoyulub və ehtiyac olan yerdən artıq hissəni örtür, axırıncı iki halda sağlam yerləri yumalı və təyəmmüm almalıdır, məsh çəkməməlidir." Qeyd edək ki, ehtiyac hissəsi ilə qəsd olunan yaranın özü və yara olmayan, lakin sarğının bağlanması üçün minimum labüd hissə qəsd olunur.

**Bunlar səkkizdir**:

**Birinci:** İki yoldan[94] çıxan az və ya çox miqdarda pak[95] yaxud murdar şey.

**İkinci:** Bədənin qalan hissəsindən nəcasətin çıxması; əgər bu, sidik yaxud nəcisdirsə mütləq şəkildə[96] (dəstəmazı) pozur, əgər bu, qan və qusmaq[97] kimi başqa bir şeydirsə, hər bir insanın öz nəzərində (həmin şey) çox görünərsə[98] (dəstəmazı) pozur.

**Üçüncü:** Ağlın itirilməsi və ya ürəkdən getmə yaxud yuxu səbəbi ilə ağlın örtülməsi.[99] Amma əyləşmiş və ayaqda durmuş birinin örfdə yüngül sayılacaq miqdarda yuxuya dalması istisnadır.[100]

---

[94] Sidik orqanı və anus dəliyi

[95] Pak, yəni təmiz şeyə misal olaraq alimlər qansız doğulan uşağı misal göstərirlər.

[96] Mütləq şəkildə; yəni çıxan şeyin az və ya çox olması arasında fərq qoyulmur.

[97] Burada bir şeyi yedikdən sonra dərhal qusmaq ilə müəyyən bir vaxt keçdikdən sonra qusmaq arasında bir fərq yoxdur. Hətta su içdikdən sonra həmin suyu qaytararsa qusmuş və bununla da dəstəmazını pozmuş sayılır. Hənbəlilərdə insanın mədəsinə gedən yeməyin və mayenin halını dəyişməsi yox, həmin şeyin mədəyə getməsi etibara alınır.

[98] Şeyx əd-Duməni deyir: «Yəni öz halı və etiqadına əsasən; belə ki, əgər özü (çıxan şeyin) çox olduğunu düşünürsə dəstəmazı pozulmuşdur, bu, onun öz etiqadı ilə əməl etməsi ilə olur, çünki İbn Abbas deyir: "Çox, sənin qəlbində çox olaraq gördüyündür." Həmçinin peyğəmbər – salləllahu aleyhi va səlləm – demişdir: "Səni şübhəyə salan şeyi tərk edib şübhəyə salmayanı götür!" Üstəlik başqasının çox saymasını insanın nəzərə alması sıxıntıya səbəb olur, beləliklə (öz etiqadına əsasən əməl etməklə həmin sıxıntı) aradan qaldırılmış olur." ("Haşiyətud-Duməni", səh: 193-194) Burdan anlayırıq ki, milçək, ağcaqanad, bit, birə və bunların bənzərləri insanın qanın sorsa, dəstəmaz pozulmaz. Lakin zəlinin sorduğu qana görə dəstəmaz pozular.

[99] Ağlın itirilməsi insanın dəli olmasıdır. Ağlın örtülməsi isə sərxoş olmaq, huşunu itirmək və ya yatmaq yolu ilə ola bilər.

[100] Şeyx İbn Əbi Təğləb deyir: "Əgər yuxusunun çox olub olmamasında şəkk edərsə şəkkinə bir əhəmiyyət verməməlidir. (Yəni yuxusunun yüngül olduğunu əsas almalıdır.) Rükuda, səcdədə olarkən, uzanmış, söykənmiş, dirsəklənmiş halda olarkən az da olsa yuxuya dalmaq dəstəmazı pozur. Şeyximiz əl-Bəlbəni – rahiməhullah – dedi: "Yürüyərkən (də azca da olsa yuxuya dalarsa dəstəmazı pozular.)"("Neylul-Məərib", 1/70) Şeyx Osman ibn Cami deyir: "Əgər yuxu görərsə, o zaman çox sayılır (və dəstəmazı pozulur), lakin əgər ağlından bir şeylər keçərsə və bunun bir yuxu, yoxsa öz içində etdiyi söhbət olduğunu bilməzsə, dəstəmazı pozulmuş sayılmaz." ("əl-Fəvaid əl-Muntəxabət", 1/60) Buradan anlayırıq ki, oturan və ya duranın azca yuxuya dalmasının dəstəmazı pozmayacağını dedikdə alimlər bununla bir yerə söykənmədən oturmuş və ya

**Dördüncü**: Dirnağl ilə yox, əl ilə[101] arada bir maneə olmadan insanın[102] (bədənə) bitişik cinsiyyət üzvünə yaxud arxa dəliyin halqasına toxunması; nə xayalara toxunmaq, nə də (bədəndən) ayrılmış cinsiyyət üzvünün yerinə toxunmaq (dəstəmazı) pozmur.[103]

**Beşinci**: Kişinin dərisinin qadına və ya qadınkının kişiyə - hətta toxunulan ölü, yaxud qoca, yaxud da məhrəm olsa belə - şəhvət ilə, arada heç bir maneə olmadan toxunuşu; yeddi yaşından kiçiyə[104], dişə, dırnağa, tükə toxunmaq (buna aid) deyildir, nə də bunlardan biri ilə toxunmaq (bura daxil) deyildir[105].

Cinsiyət üzvünə toxunulanın və bədəninə toxunulanın dəstəmazı, şəhvət hissi keçirsə belə, pozulmur. [106]

**Altıncı:** Meyiti[107] yaxud onun bir hissəsini yumaq. (Burada) yuyan, suyu tökən yox, meyiti çevirən və ona əl vurandır.

---

durmuş şəxsi qəsd edirlər. Həmçinin oturmuş və ya durmuş olduqda belə yuxu görməyin artıq yuxunun yüngül, yəni az olmaması anlamına gəlir.

Şeyx Osman ən Nəcdi dediyinə görə, yanındakı insanların səsin eşitsə, lakin nə dediklərini anlamasa, yüngül yuxu hesab olunur.

[101] Burada əlin içi, üstü və barmaqların ucu arasında fərq yoxdur. Dırnaqlar istisna edilmişdir.

[102] Böyük və ya kiçik, qəsdən və ya səhvən toxunması arasında fərq yoxdur.

[103] Həmçinin qadının cinsiyyət dodaqlarına toxunmaqla dəstəmaz pozulmaz. Dəstəmazı pozan onun sidik, məni və heyz çıxdığı yerlərinə toxunmaqdır. Anus dəliyi və cinsiyyət üzvü arasında olan yerə toxunmaq da dəstəmazı pozmur.

[104] Beləliklə yeddi yaşı olan və daha yaşlı olana şəhvətlə toxunmaq dəstəmazı pozur.

[105] Yəni şəhvətlə olsa belə diş, dırnaq və tük ilə toxunmaq dəstəmazı pozmur.

[106] Beləliklə kiməsə bir başqası toxunanda toxunulan kəs şəhvət hissi keçirsə də dəstəmazı pozulmur. Lakin belə bir halda ixtilafdan qurtulmaq üçün dəstəmaz almaq müstəhəbdir. Şeyx əd-Duməni həm də qeyd edir ki, "fikirləşmək və ya (qadına) dönə-dönə baxmaq səbəbilə (kişinin cinsi orqanının) durması dəstəmazı pozmur." ("Haşiyətud-Duməni", səh: 199)

Qeyd: İbn Əbi Təğləb əlavə edir: "Qadının qadına ( - şəhvətlə olsa belə - ) toxunması dəstəmazı pozmur." ("Neylul-Məərib", 1/71) Şeyx əl-Ləbədi isə onun sözlərinə əlavə edərək deyir: "Kişinin kişiyə - gənc və gözəl simalı olsa belə - toxunması da bura aiddir. Mənim anladığım budur. Sonra bunun "əl-İqna" və digər kitablarda aşkar şəkildə qeyd olunduğunu gördüm." ("Haşiyətul-Ləbədi", səh: 25)

[107] Bu zaman meyitin müsəlman və ya kafir olması, böyük və ya uşaq, kişi və ya qadın olması arasında fərq yoxdur.

**Yeddinci:** Çiy olsa belə dəvə ətini yemək[108]; ciyər, ürək, dalaq, qarın, piy, böyrək, baş, dil, hörgüc, dırnaqlar, bağırsaqlar və ətinin çorbası kimi onun digər hissələri ilə dəstəmaz pozulmur. Ət yeməməyə and içmiş bir şəxs bunları yeməklə andını pozmuş sayılmır.

**Səkkizinci**: Mürtəd olmaq.[109]

Qüslu vacib edən hər bir şey – ölüm istisnadır[110] - dəstəmazı da vacib edir.[111]

## Fəsil

Hər kim təharətli olduğundan əmindirsə, lakin hadəsin baş verib verməmədiyinə dair şübhə edərsə yaxud da hadəsin baş verdiyindən

---

108 Yediyi ətin dəvə əti olduğunu bilməməsi hökmü dəyişdirmir, əgər sonradan bunu öyrənərsə dəstəmazı pozulmuş olur.

109 Məlumdur ki, mürtəd olmaq, yəni İslam dinindən çıxmaq bütün xeyir əməlləri batil edir, beləliklə dəstəmaz da batil olur. Yenidən İslam girdikdə ona həm qüsul, həm də dəstəmaz vacib olur.

110 Yəni qüslu vacib edən hər bir şey dəstəmazı da vacib edir, lakin ölüm istisna edilmişdir, çünki insan öldükdə vacib olan onu yumaqdır, ona dəstəmaz aldırmaq vacib deyildir.

111 Şeyx əl-Ləbədi deyir: "Mushafı öpmək icazəlidir və ondan (yəni Əhməddən) müstəhəb olduğu da rəvayət olunub. Bir qrup alim bu məsələdə susublar, çünki bu barədə şəriətdə bir şey gəlməyib, baxmayaraq ki, bu əməldə ucaltma və hörmət vardır..." əl-Ləbədi əlavə edir: "Onda (yəni Quran) fal açmağa gəldikdə isə İbn Battah bunu edərdi, lakin başqaları bu rəydə olmayıb. Bəzi şafi'i alimləri bunu məkruh sayıblar və bəzi malikilərdən bunun haram olması görüşü nəql olunub. Doğrusunu Allah – subhənəhu va təalə - bilir!" ("Haşiyətul-Ləbədi", səh: 26) Burada fal açmaq ilə insanın bir iş görmək istədikdə Quranı açıb orada nemət, müjdə, rəhmət kimi xoş ayələrə rast gəldikdə həmin işi görməsi, lakin əzab kimi ağır ayələrə rast gəldikdə isə həmin işindən əl çəkməsi qəsd olunur. Şeyx Osman ibn Cami həmçinin deyir: "(Mushafa) tərəf ayaq uzatmaq və ona arxa çevirmək məkruhdur." ("əl-Fəvaid əl-Muntəxabət", 1/64)

əmin olarsa, lakin təharət alıb almadığına dair şübhə edərsə əmin olduğu hala uyğun əməl etməlidir.[112]

Dəstəmazsız şəxsə namaz[113], təvaf və Qurana arada bir maneə olmadan dərisi ilə toxunmaq[114] haramdır.

Boynunda qüsul olana isə (bunlardan başqa) Quran oxumaq[115] və dəstəmazsız məsciddə qalmaq[116] əlavə olunur.

## Qüslu vacib edən amillər bölümü

**Bunlar yeddidir**:

**Birinci:** Məninin hərəkət etməsi[117]; əgər insan onun hərəkətini hiss etdikdə onun qarşısını alarsa və o çıxmazsa qüsl vacib olur. Əgər bundan ötrü qüsl alar və daha sonra o, şəhvətsiz çıxarsa yenidən qüsul almalı deyildir.

---

112 Burada namazda və ya ondan qabaq şəkkə düşmək arasında fərq yoxdur. Namazdan sonra isə şəkkə fikir verməz. Yəni, namaz qıldığında özünün dəstəmazlı olduğunu bilən, namazdan sonra bu haqda şübhəyə düşərsə, namazını yenidən qılmalı deyil.

113 Məzhəbə görə dəstəmazsız namaz qılmaq küfr deyil.

114 İbn Əbi Təğləb deyir: "Lakin arada bir maneə olduqda toxunmağın zərəri yoxdur. Misal üçün (köynəyinin) qolu ilə və ya bir çubuq ilə vərəqləyə bilər, həmçinin bir asqıda və ya kisədə daşıya bilər. Təfsir kitabına, hökmü qalsa da tilavəti nəsx olunmuşa, qüdsi hədislər, Tövrat və İncil kimi Allahdan – Azzə va Cəllə - nəql olunanlara toxunmaq isə haram deyildir." ("Neylul-Məərib", 1/73) Burdan həmçinin anlayırıq ki, dəstəmazı səhih olmayacaq kiçik uşaqlara Mushafa toxunmağa imkan vermək olmaz.

115 İbn Əbi Təğləb deyir: "Yəni bir və ya daha çox ayə oxumaq (olmaz) və bunun məkruhluğu Ömərdən və Əlidən – radiyallahu anhumə - rəvayət olunub. (Lakin) ayənin bir hissəsini, hətta onu təkrarlayaraq oxuması isə icazəlidir...Lakin (ayələri) hecalamaq, zikr etmək və namazda keçərli olmayacaq şəkildə gizlincə oxumaq olar." ("Neylul-Məərib", 1/74)

116 Müsəlman cənabətli olduqda məsciddə qalmaq ona qadağandır, lakin dəstəmaz alıb qala bilər. Bu növ dəstəmaz hadəsi aradan qaldırmadığı üçün məsciddə yatmağının bir zərəri yoxdur. Şeyx əd-Duməni deyir: "Əgər dəstəmaz almaq imkanı olmazsa təyəmmüm almadan da (məsciddə) qala bilər." ("Haşiyətud-Duməni", səh: 204)

117 İbn Bədran deyir: "yəni məni çıxmasa belə öz yerindən (başqa yerə) axması (qüslu vacib edir)."

**İkinci:** Onun, qan şəklində[118] olsa belə öz məxrəcindən çıxması. Yatmış halda və buna bənzər halda olmadığı müddətcə onun şəhvətlə çıxması şərtdir.[119]

**Üçüncü:** Cinsiyyət üzvünün baş hissəsinin yaxud (cinsiyyət üzvünün başı kəsilmiş kəslərdə) onun qədər olan hissəsinin arada maneə olmadan (əsli) fərcdə[120] itməsi; hətta (daxil edilən əsli fərc) anal dəliyi olsa belə[121], hətta (əsli fərc) ölüyə[122] və ya heyvana və ya quşa

---

[118] Şeyx əd-Duməni deyir: "Yəni, hətta əgər insan bədənin zəifliyi üzündən şəhvətin azlığına görə məni qan şəklində qırmızı rəngdə çıxsa belə (qüsul vacib olur). Onların (yəni hənbəli alimlərinin) sözlərinin zahirindən anlaşılan budur ki, bu cür məni təmizdir, belə ki, məninin təmiz olduğunu deyiblər və bu da bədəndən çıxmaqla qüslu vacib etdiyi üçün məni sayılır." ("Haşiyətud-Duməni", səh: 206)

[119] Əgər yatdığı halda və ya huşunu itirdiyi halda və buna bənzər hallarda məni çıxarsa bununla qüsul vacib olur. Yatarkən insanın ağlı örtülü olduğu üçün şəhvətlə çıxıb çıxmadığını hiss etməz, ona görə də onlar üçün şəhvətin şərt olması mümkün deyildir. Lakin ayıq insandan məninin çıxması şəhvət şərtinə bağlıdır və bir çox alim burada məninin təzyiq ilə çıxmasını da zikr edirlər, lakin mənini çıxardan şəhvətdirsə o zaman təzyiq ilə çıxır. Buradan anlayırıq ki, soyuqdəymə və ya digər xəstəliklərə görə məni çıxarsa qüsul pozulmaz. Bu halda çıxan məni nəcis hesab olunur. Şeyx əd-Duməni deyir: "Kim yuxusunda ihtilam olduğunu görsə, sonra həmən ayılsa və bir nəmlik görməsə ona qüsul vacib deyildir. İbnul-Munzir deyir: "Elm əhlindən hifz etdiklərimin hamısı bunun üzərində icma etmişdir." Lakin əgər ayıldıqdan sonra ondan məni çıxarsa qüsul almaq vacib olur; bunu (Əhməd) bir mənalı bildirmişdir. Lakin çıxarkən şəhvət hiss edərsə elə həmin an üçün (qüsul) vacib olur, əgər şəhvət hiss etməzsə o zaman ehtilam gördüyü andan (qüslun) vacib olması ortaya çıxır, çünki (qüsul) məninin hərəkəti ilə vacib olur. Beləliklə yuxudan durduqdan sonra, (məni) çıxdıqdan öncə qıldığı namazı yenidən qılmalıdır, çünki o, cənabətli idi, lakin bunu bilmirdi." ("Haşiyətud-Duməni", səh: 207-208) Ehtilamı xatırlamadan paltarında və ya bədənində yaşlıq tapan isə, əgər bunun məni və ya məzi olduğundan əmin olarsa, əmin olduğu ilə əməl edər. Yəni məni üçün qüsl alar, məzini isə vacib olaraq yuyar. Tapdığı şeyin nə olduğunda şübhə edən isə, əgər yatmaqdan öncə məziyə səbəb ola biləcək oynaşma, baxış, fikir olubsa, və ya insanda mənini və ya məzini çıxaran xəstəlik varsa, bu zaman qüslunun pozulmadığını təqdir edər, çıxan şeyi isə vacib olaraq yuyar. Yuxudan əvvəl dediklərimizdən heç bir şey baş verməsə, ehtiyat olaraq həm qüsl alar həmdə çıxanı yuyar.

[120] Fərc ilə burada qəsd edilən qadının cinsiyyət orqanı və kişi və qadının anal dəliyidir və "əsli" sözünü əlavə etməklə əsli olmayan fərci istisna etmiş oluruq. Əsli olmayan fərc isə xonsa və ya əməliyyat etmiş kəslərdə ola bilər.

[121] Anal dəliyinin kişiyə və ya qadına aid olması arasında fərq yoxdur.

[122] Ölü qadının cinsiyyət üzvünə, və ya ölü kişi və ya qadının anal dəliyinə kişi cinsiyyət üzvü daxil edildikdə, ölünün qüslunu təzələmək lazımdır. Lakin ölü kişinin cinsiyyət üzvü fərcə daxil edildikdə, onun qüslü təzələnməz.

aid olsa belə (qüsul vacib olur)[123]. Lakin qüsul yalnız on yaşında olan oğlana və doqquz yaşında olan qıza vacib olur.[124]

**Dördüncü:** Kafirin – mürtəd olsa belə - İslama girməsi.

**Beşinci:** Heyz qanının çıxması.

**Altıncı:** Nifas qanının çıxması.[125]

**Yeddinci:** Ölüm; təabbud olaraq[126].

## Fəsil

**Qüslun şərtləri yeddidir**:

Onu vacib edən amilin kəsilməsi, niyyət, İslam, ağıl, təmyiz, təmizləyici mübah su, suyun bədənə çatmasına mane olanı kənarlaşdırmaq.

**Onun vacibi**: bəsmələ'dir və səhvən[127] o, (insanın öhdəliyindən) düşür.

**Onun fərzi**: bütün bədəni, ağız və burnun içini, hətta ehtiyacını ödəmək üçün oturduğu zaman qadının cinsiyyət üzvündən görünən hissəni[128] və hətta saçlarının dibini su ilə əhatə etməkdir.

---

[123] Həmçinin əgər yatmış və ya dəli kişinin cinsiyyət üzvü fərcə daxil edilərsə, hər ikisinə qüsl vacib olar.

[124] Beləliklə doqquz yaşdan kiçik qız uşağı və on yaşdan kiçik oğlan uşaq ilə belə bir hal baş verərsə onlara qüsul almaq vacib olmaz. Lakin bu, o demək deyildir ki, bu yaşdan yuxarı olan və həddi-büluğa çatmamış uşaqlar qüslu tərk etməklə günah işləmiş olurlar. Qəsd olunan odur ki, əgər bu yaşa çatmış qız və oğlan, qüslun şərt olduğu ibadəti yerinə yetirmək istəsələr, qüsl almaları lazımdır.
Qeyd edək ki, əgər əlaqədə olan iki insandan biri bu yaşdan kiçik, digəri böyük olsa, böyük olana qüsl vacib olar.

[125] Burdan anlayırıq ki, qansız doğan qadının qüslu pozulmaz. Həmçinin onun orucu da pozulmaz, və ərinə onun yaxınlıq etmək qadağan olunmaz.

[126] "Təabbud olaraq"; yəni bunun hikməti bizə məlum deyildir, sadəcə olaraq şəriət mətnlərində gəldiyi üçün olduğu kimi qəbul edirik.

[127] Dəstəmazda olduğu kimi burada da bəsmələ "Bismilləh" sözüdür. Həmçinin cahil olduğu üçün də vaciblik hökmündən düşər.

Cənabətdə yox, lakin heyz və nifasda saçları açmaq vacibdir.

Suyun dəriyə tam şəkildə çatdığını zənn etmək kifayət edir.

**Onun sünnələri**: qüsuldan öncə dəstəmaz almaq, üstünü bulaşdıran şeyi kənarlaşdırmaq[129], suyu başına üç dəfə və bədənin qalan yerlərinə üç dəfə tökmək, sağla başlamaq, muvalə[130], əl ilə bədəni sürtmək və ayaqları başqa bir yerdə yenidən yumaq.

Kim müstəhəb və ya vacib qüsul almağı niyyət edərsə digəri üçün yetərli olar.[131]

Əgər hər iki hadəsi və ya mütləq şəkildə hadəsi yaxud ancaq dəstəmaz və qüsl ilə mübah olacaq bir işi niyyətində tutarsa hər ikisi üçün yetərli olar. [132]

Dəstəmazı bir mudd su ilə almaq və qüslu isə bir sa' su ilə almaq sünnətdir; bir mudd[133] iraq çəkisi ilə bir tam üçdə bir ratl, qüds çəkisi ilə iki tam yeddidə dörd uqiyə, bir sa' isə iraq çəkisi ilə beş tam üçdə bir ratl və qüds çəkisi ilə on tam yeddidə iki uqiyədir.

---

[128] Qadının oturduğu zaman cinsiyyət üzvündən göründüyü hissə onun bədəninin xarici hesab olunur, buna görə bu hissəni qüsl zamanı və nəcasətdən yumaq vacibdir. Bundan artığı isə, bədəninin daxil hissəsi hesab olunur, ora əlini salaraq yuması lazım deyil.

[129] İstəyir məni kimi təmiz olsun, ya da məzi kimi nəcis olsun.

[130] Əgər muvalə pozularsa, qüsluna davam etmək üçün niyyətini təzələməlidir. Yəni, ola bilər ki, insan qüsl aldıqda hansısa üzvünü yumağa unudub, və muvalə itəcək qədər uzun müddət sonra bunu xatırlayıb. Bu zaman niyyətini təzələyərək qüslunu bitirə bilər. Burdan anlayırıq ki, bəsmələni yenidən demək vacib deyil.

[131] Lakin müstəhəb qüsl o zaman vacib qüslun yerinə kifayət edəcək ki, qüsl alan boynunda vacib qüsl olduğunu unutsun. Boynunda vacib qüsl olduğunu xatırlayaraq müstəhəb qüslu niyyət edərsə, kifayət etməz. Bundan daha əfzəl isə, hər ikisini niyyət etməkdir. Əvvəlcə vacib qüsl, sonra isə müstəhəb qüslu almaq bunda da gözəldir.

[132] Yəni, zikr olunandan birini niyyət etdikdən sonra, sadəcə qüsl almaqnan dəstəmaz da hasil olacaq. Və burada tərtib, muvalə və başa məsh fərzlik hökmündən düşəcək. Lakin əgər qüsl əsnasında dəstəmazı pozularsa, misal üçün cinsiyyət üzvünə toxunarsa, qüslunu tamamlamalı, bundan sonra isə dəstəmaz almalıdır.

[133] Vəzn vahididir və iki ovuca birlikdə tam şəkildə yerləşən miqdara mudd deyilir. Bu, təxminən 508 qram edir. 543 qram olduğu da deyilib. Beləliklə təxminən yarım litr su ilə dəstəmaz almaq sünnətdir. Saa isə 4 mudda bərabərdir, buradan başa düşürük ki, bir saa təxminən 2036 qram təşkil edir.

(Suyu) israf etmək məkruhdur[134], zikr olunandan da azı ilə isbəğ[135] etmək məkruh deyildir.

Əziyyət vermədiyi təqdirdə məsciddə, harama düşməkdən əmin olacağı halda hamamda qüsul almaq mübahdır; əgər harama düşmək qorxusu olarsa məkruh olar, (düşəcəyini) bildiyi təqdirdə isə haram olar.[136]

## Müstəhəb qüsullara dair fəsil

**Bunlar on altıdır**:

Onların arasında ən çox təkid olunmuşu cümə namazı üçün, orada iştirak edəcək kişi üçün həmin gündə alınan qüsuldur[137]. Sonra ölünü yumaqdan ötrü, sonra bayram üçün həmin gün[138], kusuf və istisqa namazı üçün, dəlilik və ürəkdən getməyə görə, hər namazda istihazə üçün, ihram üçün, Məkkəyə və oranın haramına daxil olmaq üçün, Ərəfatda durmaq, ziyarət təvafı, vida təvafı, Müzdəlifə'də gecələmək və daş atmaq mərasimi üçün alınan qüsuldur[139].

---

[134] Muntəhə əl İradət kitabına görə tamamilə lüt qüsl almaq da məkruhdur. Qəsd olunan heç kimin görməyəcəyi bir yerdə olduğu zamandır. Kiminsə gördüyü təqdirdə isə haram olar.

[135] İsbəğ fərz olan üzvlərdə suyun axmasıdır. Burdan anlayırıq ki, su axmadan fərz üvlərini yaş etmək, misal üçün yaş əl ilə məsh etmək, və ya qar ilə məsh etmək kifayət deyil. Lakin qar əriyib axarsa, kifayət edər.

[136] Harama düşmək qorxusu olmadan ümumi hamama daxil olmağın mübahlığı kişiyə aiddir. Qadına isə ehtiyac olmadan ümumi hamamlara daxil olmaq haramdır. Heyz, nifas, cənabət, xəstəlik kimi üzrü olarsa, caiz olar.

[137] Burdan anlayırıq ki, qadın üçün cümə qüslu müstəhəb deyil. Həmçinin cümə qüslunun vaxtı fəcr girdikdən sonra, namaz qılınana qədərdir. Fəcrdən əvvəl və namazdan sonra müstəhəb deyil.

[138] Burada da cümə kimi fəcrdən əvvəl və namazdan sonra qüsl müstəhəb deyil. Lakin cümə qüslundan fərqli olaraq bu qüsl qadınlara da müstəhəbdir.

[139] "İstisqa namazı üçün qüslun vaxtı (istisqa) namazına çıxmaq istədikdə, kusuf namazı üçün isə (kusuf) baş verdiyi zaman, həcdə isə yaxında əda etmək istədiyi ayini etmək istəyərkəndir. Bunu (əl-Mərdəvi) "əl-İnsaf" kitabında (1/248) demişdir." ("Neylul-Məərib", 1/84)

Habelə bunların hamısı üçün ehtiyac olduqda, həmçinin dəstəmaz alınması sünnət olan işlər üçün (dəstəmaz almaq) mümkün olmadıqda təyəmmüm ala bilər.

## Təyəmmüm bölümü

**(Təyəmmüm)**[140] **səkkiz şərt ilə səhih olur**: niyyət[141], müsəlman olmaq, ağıl, təmyiz, istinca yaxud isticmar.

**Altıncı**: namazın vaxtının girməsi; bir namaz üçün onun vaxtından öncə, nə də (namazın) qadağan olduğu bir vaxtda nafilə namazı üçün alınan təyəmmüm səhih deyildir.

**Yeddinci**: ya suyun olmamasına görə, ya da onu istifadə etdikdə zərər gələcəyindən qorxduğuna görə sudan istifadə etməyin mümkün olmaması.

(Qanı) haram olan insanlardan[142] və ya heyvanlardan susamışlara (suyu) vermək vacibdir.

Hər kim təharəti üçün yetməyəcək qədər su taparsa su qurtarana qədər onu istifadə etməsi vacibdir, sonra təyəmmüm almalıdır.

---

[140] Şeyxul İslam ibn Teymiyyə demişdir: "Hər kim təyəmmüm ilə namaz qılmaqdan imtina edərsə o, yəhudi və nəsrani qəbilindən birisi olar, çünki təyəmmüm Muhamməddin - sallallahu aleyhi va səlləm - ümməti üçün xasdır." ("Haşiyətur-Raud", 1/300)

[141] Təyəmmümdə niyyət müəyyən fərz və ya nafilə namazını, fərz və ya nafilə təvafını, mushafa toxunmağı, Quran oxumağı, məsciddə oturmağı və ya cinsi əlaqəni mübah etmək niyyətidir. Əgər sadəcə namazı və ya təvafı mübah etməyə qəsd edərsə, niyyəti nafiləyə aid olar və fərzi qıla bilməz, buna görə fərz namaz və ya təvaf olduğunu təyin etməlidir.
Daha üstün bir şeyi mübah etməyi niyyət edən onu, mislini və ondan aşağı olanı edə bilər, lakin özündən üstün olan ibadəti yerinə yetirə bilməz. Üstülük ardıcıllığı isə belədir: fərz ayn namazı, nəzir namazı, fərz kifayə namazı, nafilə namaz, fərz təvaf, nafilə təvaf, mushafa toxunmaq, Quran oxumaq, məsciddə oturmaq, cinsi əlaqə.
Hədəsi aradan qaldırmağı niyyət edərsə, təyəmmümü səhih olmaz.

[142] Qəsd olunan öldürülməsi qadağan edilmiş insanlardır.

Əgər səfərdə olan, artıq vaxtın daraldığı bir halda suya yetişərsə və yaxud da növbənin ona yalnız vaxt çıxdıqdan sonra çatacağını bilirsə təyəmmümə keçməlidir. (Ondan) başqaları isə, hətta vaxt çıxacaq olsa belə bu cür edə bilməzlər. [143]

Hər kim (namazın) vaxtında suyu dağıdarsa və yaxud da sudan dəstəmaz almaq imkanı olduğu halda və o sudan başqasını tapa bilməyəciyini bildiyi halda onun yanından keçib gedərsə haram olar. (Lakin) sonra təyəmmüm alıb namaz qılarsa, onu yenidən qılmaq lazım deyildir.

Bədənində və paltarında nəcasət olan, dəstəmazsız bir kəs kifayət etməyəcək qədər su taparsa, (birinci) paltarını yuması vacibdir. Sonra əgər sudan bir şey qalarsa bədənini yuyar, sonra yenə əgər sudan artıq bir şey qalarsa onunla təharət edər, əks halda isə təyəmmüm edər.

Hər hadəs üçün və bədəndə olan nəcasət üçün – onu imkan dairəsində azaltdıqdan sonra - təyəmmüm almaq səhihdir. Əgər onu azaltmadan öncə təyəmmüm alarsa səhih olmaz.

**Səkkizinci**: onun (atəşdə) yanmamış, təmizləyici[144], mübah və ələ yapışan tozu[145] olan torpaqla edilmiş olması.

---

[143] Yəni, müsafir istisna, digər adam suya fərz namazının vaxtından sonra çatacağını bilsə də, suyun dalınca getməlidir. Burada suyun örfdə yaxın hesab olunacaq yerdə olması və ona qısa bir zamanda çatacağını bilməsi şərtdir, yoxsa yalnız uzun müddət sonra suya yetişəcəyini bilən suyu olmayan biri hökmündədir, təyəmmüm ilə namazını qılmalıdır.

[144] Təmizləyici torpaq ilə qəsd olunan nəcisə qarışmayan və ya vacib təyəmmümdə istifadə edilməyən torpaqdır. Vacib təyəmmümdə istifadə edilən torpaq isə təyəmmüm zamanı əllərdən və üzdən ayrılan torpaqdır. Burdan anlayırıq ki, eyni yerdən bir neçə nəfər təyəmmüm edə bilər, çünki hər birisi istifadə etdikdən sonra yerdə qalan torpaq təmizləyici xüsusiyyətini itirmir, təmizləyici xüsusiyyətini itirən əllərindən və üzündən ayrılan torpaqdır. Həmçinin əgər torpağa un kimi ona qarışan şeylər əlavə olunarsa və torpağa sadəcə torpaq deyilməyəcək qədər çox olarsa, bu qarışıqla da təyəmmüm səhih olmaz.

[145] Burdan anlayırıq ki, qum, gil və ələ yapışan tozu olmayan digər şeylərdən alınan təyəmmüm səhih deyil. Onu da qeyd edək ki, əgər əşyaların üzərində toz yığılarsa, təyəmmümdə bu tozdan istifadə etmək caizdir.

Əgər bunu tapmazsa ancaq fərz namazını olduğu hal üzərində qılmalı, namazında yetərli olandan artığını etməməlidir[146] və onu yenidən qılmaq lazım deyildir.

## Fəsil

**Təyəmmümün vacibi** bəsmələ çəkməkdir və səhvən o, (insanın öhdəliyindən) düşür.

**Fərzləri beşdir**: üzü məsh etmək[147] və biləklərə qədər əlləri məsh etmək.

**Üçüncü**: kiçik təharətdə tərtibin olması.[148]

Dəstəmaz əzalarının bəzisində yarası olan bir kimsənin, (həmin əzası) sağlam olsaydı yuyulması lazım olan anda onun üçün təyəmmüm alması lazımdır.[149]

**Dördüncü**: muvalə[150]; beləliklə (hər namaz üçün) aldığı hər təyəmmüm zamanı (yara olan əzanın) sağlam yerini təkrar yumalıdır.[151]

---

[146] Yəni namazın ruknlarından və vaciblərindən artığını etməməlidir. Sünnət olan bir şey edərsə, hətta tumaninə ruknunu kifayət edəcək miqdardan artıq edərsə, namazı batil olar. Həmçinin bu cür qılınan namazda dəstəmazı pozacaq bir şey baş verərsə, və ya üzərinə namazda bağışlanmayan nəcasət düşərsə, namazı batil olar.

[147] Üzü məsh etdikdə saqqal seyrək olsa belə onun diblərinə məsh etmək lazım deyil. Torpağı ağıza və buruna daxil etmək isə məkruhdur.

[148] Yəni, əgər təyəmmümü kiçik hədəsin yerinə alarsa, əvvəlcə üzünə sonra isə əllərinə məsh etməsi fərzdir.

[149] Yəni, əlində yarası olan əvvəl vacib olaraq üzünü yuyar, sonra əllərindən sağlam olan hissəni yuyar, sonra əllərindəki yara üçün təyəmmüm edər, sonra isə dəstəmazını tərtiblə bitirər. Qeyd edək ki, əllərə çatanda əvvəl təyəmmüm sonra isə sağlam hissəni yuya bilər.

[150] Muvalə də yalnız kiçik hədəsin yerinə alınan təyəmmümə aiddir. İrəlidə gələcəyi kimi, üzərinə hər iki hədəsi olan onlar üçün eyni niyyət ilə bir təyəmmüm edə bilər. Qeyd edək ki, qüsldan fərqli olaraq, burada hər iki hədəsi niyyət edəndə tərtib və muvalə fərzlik hökmündən düşmür.

[151] Bədənindəki sarğıya görə təyəmmüm almış bir kimsə, namazın vaxtının çıxması ilə təyəmmümün də batil olması səbəbilə yenidən təyəmmüm almalıdır və bu zaman sağlam dəstəmaz üzvlərini də yenidən yumalıdır.

**Beşinci**: hadəsə yoxsa nəcasətə görə təyəmmüm aldığını niyyətdə müəyyənləşdirmək; biri üçün edilən niyyət digəri üçün kifayət etmir. Əgər hər ikisini də niyyət edərsə yetərli olar.[152]

**(Təyəmmümü) batil edən amillər beşdir**: Dəstəmazı batil edən hər bir amil[153], suyun tapılması, vaxtın çıxması[154], onu mübah edən səbəbin aradan qalxması və üzərinə məsh edilmiş şeyin çıxarılması[155].

Əgər namazda ikən su taparsa namazı batil olar. Əgər namaz bitərsə onu yenidən qılmaq vacib deyildir.

**(Təyəmmümün) alınma şəkli**: ilk olaraq niyyət edir, sonra bəsmələ edir və üzüyü və buna bənzər şeyləri çıxartdıqdan sonra barmaqları aralı tutaraq əlləri ilə torpağa bir dəfə vurur, iki dəfə vurarsa ehtiyat baxımından daha yaxşı olar. Daha sonra barmaqlarının iç tərəfiylə üzünü və sonra ovucu ilə əllərinin üst tərəfini sürtür.

Suyun tapılmasına ümid edənə təyəmmümü seçilmiş vaxtın sonuna qədər təxirə salmaq müstəhəbdir.

O, bir təyəmmümlə istədiyi qədər fərz və nafilə namazları qıla bilər. Lakin nafilə üçün təyəmmüm alarsa (bu təyəmmüm) fərz qılmağı mübah etmir.

---

[152] Yəni, istəsə böyük və kiçik hədəs, həmçinin bədənində olan nəcasət üçün bir təyəmmüm edə bilər. İstəsə bunları ayrı ayrı edə bilər. Bədənində olan bütün nəcasətlər üçün bir təyəmmüm kifayətdir.

[153] Bu, dəstəmaz yerinə alınan təyəmmümü pozar. Qüsl yerinə alınan təyəmmümü isə yalnız qüslu vacib edən amillər pozar. Əgər hər iki hədəsin yerinə bir təyəmmüm alarsa, sonra dəstəmazı pozan amil baş verərsə, kiçik hədəs üçün aldığı təyəmmüm batil olar, digəri deyil. Qeyd edək ki, heyz və nifas üçün alınan təyəmmümü yalnız bu ikisi poza bilər, digər hədəslər deyil.

[154] Namazda ikən vaxt çıxarsa təyəmmümü pozular, beləliklə namazı da səhih olmaz. Yeni təyəmmüm alıb namazı qəza etmək lazımdır.

[155] Misal üçün şərtləri ilə xof geyinərsə, sonra dəstəmaz almaqdan aciz olub təyəmmü edərsə, xofları çıxartdığı vaxt təyəmmümü pozular. Məshin müddətinin bitməsi də bunun kimidir, təyəmmüm pozular.

## Nəcasətin kənarlaşdırılması bölümü

Nəcasətə bulaşmış hər bir şeyin yeddi dəfə yuyulması[156], it və ya donuz ilə murdarlanmış şeydən ötrü isə (yeddi dəfədən) birinin təmiz və təmizləyici torpaqla və ya sabun və buna bənzər şeylərlə olması şərtdir[157]; nəcasətin tamının qalması zərərdir, lakin rənginin və ya qoxusunun, ya da hər ikisinin azicliyə görə qalması zərər verməz.

Yeməyi iştaha ilə yeməyən erkək körpənin sidiyi üçün su çiləmək - və bu (bulaşmış yeri su ilə) əhatə etməkdir - yetərlidir[158]. Maye ilə - bu maye it və ya donuzdan gəlsə belə - murdar olmuş qaya daşının, hovuzların və yerin təmizlənməsində, nəcasətin rəngi və iyi gedənə qədər onun üzərinə çoxlu su tökmək yetərlidir[159].

Yer günəş, külək və qurumaq ilə, nə də nəcasət atəş(də yanmaq) ilə təmizlənmir.

Sərab öz-özünə sirkəyə çevrildikdə öz qabı ilə birlikdə təmizlənir.

Nəcasətin (dəqiq) yeri gizli qalarsa onun yuyulduğu əminliklə bilinənə qədər ora yuyular[160].

---

[156] Bir şeyi yumaq onun üstündə suyun axması ilə hasil olur, sadəcə məsh edərək yaş olması kifayət deyil. Burada yeddi dəfə yumaq ilə qəsd olunan nəcasətin getməsi şərtiylədir, əgər yeddi dəfədən sonra nəcasət qalarsa, nəcasət gedənə qədər yumaq sayını artırmaq lazımdır. İçinə su hopduran materiallarda isə vacib olan onun içinə su yığmaq, sonra isə içindəki suyun əksəriyyəti gedəcəyi şəkildə sıxmaqdır və bu, bir yumaq hesab olunacaq.

[157] Torpaq və bənzəri şeylərlə yumağın birinci olması daha yaxşıdır. Burada torpağı nəcislənmiş yerin hamısına su ilə çatdırmaq vacibdir.

[158] Burada suyun axması şərt deyil. Sidik düşmüş yeri tam su ilə əhatə edəcək qədər su çiləmək kifayətdir. Həmçinin anlayırıq ki, bu hökm oğlan uşağına xasdır, qız uşağının sidiyi adi nəcis hökmündədir.

[159] Yetəcək qədər suyun tökülməsi ilə yer təmizlənir, suyun qurumaq ilə və ya başqa yol ilə aradan qalxması şərt deyil, su qala-qala da yer təmiz hesab olunur.

[160] Misal üçün nəcasətin köynəyinə düşdüyündən əmin olan, lakin yerini tam dəqiqliklə bilməyən, vacib olaraq bütün paltarını yumalıdır.

## Fəsil

Maye şəklində olan uyuşdurucu, həmçinin həşiş, pişikdən iri quruluşa malik yeyilməyən quşlar və heyvanlar murdardır.

İlan və sıçan kimi ondan kiçik quruluşa malik olanlar və maye şəklində olmayan uyuşdurucu təmizdir.

İnsan, balığ[161], çəyirtkə və həmçinin əqrəb, böcək, taxtabiti, bit və birə kimi axar qana malik olmayanlar[162] istisna olmaqla hər bir meyit murdardır.

Əti yeyilənlərdən yeminin çox hissəsi nəcasət olmamış heyvanların sidiyi, peyini, qusmağı, məzisi, vədisi, mənisi və südü təmizdir. Yeyilməyənlərdə isə murdardır; insanın mənisi[163] və südü istisnadır.

İrin, qan və yaradan çıxan çirk murdardır[164]; lakin ondan, sağlığında pak sayılan canlıdan çıxan - heyz qanı olsa belə - dəstəmazı pozmayacaq qədər az miqdarı namazda bağışlanmışdır[165].

Birdən çox yox, yalnız tək bir paltarda fərqli yerlərdə olan az miqdar (nəcasət) bir arada toplanılaraq hesaba alınır[166].

---

161 Yalnız suda yaşayan digər heyvanlar da balığ hökmündədir, yəni meyiti təmizdir.

162 Lakin əgər axar qanı olmayan heyvan nəcisdən əmələ gələrsə, o zaman murdar olar.

163 Lakin əgər məni çıxan məxrəc nəcis olarsa, sonra məni çıxarsa, hamısı nəcis olar. İsticmar edilmiş məxrəcdən çıxan məni isə təmizdir.

164 Dörd növ qan vardır ki, təmizdir: 1) yeyilən heyvan şəri yolla kəsildikdən və qanı çıxdıqdan sonra ətində qalan qan 2) üzərində qaldığı müddətcə şəhidin qanı 3) balığ və onun kimi sudan başqa yerdə yaşamayan heyvanların qanı 4) təmiz şeydən əmələ gəlib axar qanı olmayan heyvanların qanı.

165 Bunların bağışlanması üçün xülasə şərtlər bunlardır: 1) bunlar bədəndə, paltarda və yerdə bağışlanıb, yeməkdə və içməkdə deyil 2) bunlar sağlığında təmiz olan heyvandan çıxmalıdır 3) dəstəmazı pozmayacaq qədər az olmalıdır 4) iki yoldan çıxmamalıdır, iki yoldan çıxan olsa bağışlanmaz, lakin heyz, nifas və istihazə qanı istisnadır

Murdar olması zənn edilən küçə palçığı[167], həmçinin pak olan (canlının) təri və tüpürcəyi təmizdir.

Əgər pişik və safsar, siçan və kirpi kimi ona bənzər pak heyvanlardan biri və ya körpə uşaq nəcasət yeyib daha sonra üstündən maye içərsə zərər verməz[168].

Pak heyvanın artığı məkruh deyildir və artıq, onun yediyindən və içdiyindən artıq qalana deyilir.

## Heyz bölümü

Doqquz yaş tamam olmadan öncə, həmçinin əlli yaşdan sonra və hamiləliklə eyni zamanda[169] heyz olmur.[170] Heyzin ən az müddəti bir

---

[166] Misal üçün üzərində iki dənə paltar var və hər bir paltara qan bulaşıb. Bu zaman, bir paltara bulaşanı digərinə əlavə edərək hesablamayacayıq, hər paltarın öz hökmü olacaq. Lakin bir paltarda müxtəlif yerlərdə olan qan izləri bir-birinə əlavə olunaraq hesaba alınar.

[167] Murdar olduğundan əmin olduğumuz küçə torpağından isə az miqdarda olan bağışlanıb. Bağışlanan nəcasətə həmçinin isticmarın izi və gözün içində olan nəcasət də aiddir.

[168] Qəsd olunan odur ki, bu suya zərər verməz. Yəni, zikr olunanlardan biri nəcis yeyərsə, ağızı nəcis olar, sonra bu nəcis ilə mayeyə toxunarsa, qaydalara əsasən mayenin nəcis olması gərəksə belə, burada aşırı məşəqqətə görə nəcis olmayacağına hökm verilmişdir.

[169] İkinci rəvayətdə deyilir ki, hamilə qadın heyz keçirir. Bu görüşü Şeyxul İslam seçmiş və ibn Muflih bunu üstün saymışdır. Həmçinin əl-Mərdəvi demişdir: “Bu, doğru görüşdür.” (“əl-İxtiyarat”, səh: 30; “əl-Furu`”, 1/267; “əl-İnsaf”, 1/357)

[170] Burada ilk dəfə heyz qanı görən qızlar üçün önəmli olan məlumatı qeyd etmək uyğundur və anaların bunu bilməsi və qızlarına başa salması lazımdır. Şeyx İbn Bədran deyir: “İlk başlayan qızın, yəni ilk dəfə heyz görən qızın hökmü xülasə olaraq belədir ki, o, ilk dəfə heyzin müddətini bir gün, bir gecə olaraq fərz etməlidir, beləliklə bu vaxt bitdikdən sonra qüsul almalı və qanı hələ də gəlsə belə ona vacib olan ibadətləri etməlidir. Sonra ikinci və üçüncü ayda da belə etməlidir, sonra təkrar edən günlərə nəzər salmalı və misal üçün bir gün, bir gecə olub olmadığını və ya dörd gün və ya yeddi gün olub olmadığına baxmalıdır. Əgər təkrarlanırsa bu, onun adət günləri sayılır və tutduğu oruclar və etdiyi təvaflar batil olur, bunları qəza etməsi lazımdır. Əgər qanı təkrarlanmazsa, yəni birinci ay gələrsə, ikinci ay isə gəlməzsə və ya ümumiyyətlə heç gəlməzsə qəza etməsi vacib deyildir. Əgər (ilk gələn) qan on beş gündən artıq davam edərsə artıq günlərin qanı istihazə sayılır, heyz deyildir. Sonra əgər qanı bir cürdürsə, ilk dəfə

gün və bir gecədir.[171] Onun ən uzun müddəti on beş gündür. Əksər hallarda altı, ya da yeddi gün davam edir.[172]

İki heyz arası ən az təmiz olma müddəti on üç gündür. Əksər hallarda ayın qalan hissəsi olur. Onun ən çox müddəti üçün bir hədd yoxdur.[173]

**Heyz vaxtı bir sıra şeylər haram olur**; bura aiddir: cinsiyyət orqanı vasitəsi ilə əlaqədə olmaq, (qadını) boşamaq, namaz, oruc[174], təvaf, Quran oxumaq, mushafa toxunmaq, məsciddə qalmaq, həmçinin oranın bulaşacağından qorxarsa oradan keçmək.

(Heyz) qüslu, həddi-büluğ yaşına çatmağı, heyzli olduqda cinsi əlaqəyə - hətta məcbur edilmiş olsa, heyzi unutsa və ya heyz barəsində və (bu əməlin) haramlığı barəsində cahil olsa belə - girməyə görə kəffarəni vacib edir; kəffarə isə bir dinar və yaxud onun

---

heyzinin bir gün, bir gecə olduğunu, qalan qanın isə istihazə olduğunu fərz etməlidir və bunu üç ay təkrarlamalıdır. Əgər qan əvvəlki xüsusiyyətlərini saxlayarsa, yəni dəyişməzsə o zaman heyz müddətinin altı və ya yeddi gün olduğunu hesablamalıdır, qalan günlər isə istihazədir. Əgər qan bir-birindən ayırd edilə bilinəcək qədər fərqlidirsə, bəzən qara, bəzən qatı, sonra duru gəlirsə, o zaman ilk gələn qanın xüsusiyyətlərini etibara almalıdır və əgər həmin şəkildə bir gün, bir gecə və ya daha çox müddət gələrsə ayırd edilə bilinən qan heyz sayılır, ayırd edilən ikinci qan isə istihazədir, bu halda təkrarlamağa ehtiyac yoxdur."

[171] əl-İqna` kitabının şərhində demişdir: "Burada qəsd olunan bir gün və bir gecənin miqdarıdır. Yəni, iyirmi dörd saat. Əgər qan bundan qısa müddətdə kəsilərsə fəsad qanı olacaq." ("Neylul-Məərib", 1/104)

[172] İbn Bədran adət günləri dəyişən qadınlar haqqında deyir: "Lakin misal üçün altı və ya yeddi gün çəkən adəti olan qadınlara gəldikdə isə, sonra qan davamlı axmağa başlayarsa, qanın bir-birindən ayırd edilib edilməməsindən asılı olmayaraq (əvvəlki) adətini heyz hesab etməli, qalan günlər isə istihazə sayılır. Əgər ayın əvvəlində başlayan bir adəti varsa və misal üçün sonra ayın ortasına keçərsə və ya yeddi gün çəkən adəti varsa, sonra misal üçün on gün davam edərsə o, bunu üç ay yoxlamalıdır, əgər təkrar edərsə deməli adəti dəyişmişdir, əgər təkrarlamazsa birinci adətinə geri qayıdar."

[173] Bu, şeyxul İslam ibn Teymiyyənin seçimidir.(əl-İxtiyarat:28 səh).

[174] Yəni oruc tutmaq. Lakin orucun qəzasını tutmaqda icma var. əl-Muntəhənin çərhində belə gəlib.(Neylul məarib:1/106).

yarısıdır və ikisi arasında seçim edə bilər.[175] Həmçinin əgər (cinsi əlaqəyə) razılıq verərsə (kəffarə) qadına da aiddir.

Onun kəsilməsindən sonra və qüsldan yaxud təyəmmümdən öncə yalnız oruc, talaq və dəstəmazlı halda məsciddə olmaq mübahdır.

Həmçinin heyz müddətində qoyulan pambıqda dəyişikliyin olmaması ilə qanın kəsilməsi təmizlənmə sayılır.

Heyzli və nifaslı qadın namaz yox, lakin orucun qəzasını tutur.

## Fəsil

Qadının qanı on beş günü keçərsə, deməli o, müstəhazədir. Həmin qadın (heyz günlərini təmizlik günlərindən) ayıra bilmədiyi təqdirdə hər ayın altı və ya yeddi gününü oturur[176], sonra qüsul alıb həmin yeri yuduqdan və oranı sarıdıqdan sonra orucunu tutur və namazını qılır. Hər namazın vaxtında dəstəmaz almalıdır və dəstəmazı ilə (namazı) mübah qılmağı niyyət etməlidir. Bunu həmçinin daimi hadəsdən əziyyət çəkən hər bir kəs etməlidir[177].

Müstəhazə ilə cinsi əlaqəyə girmək haramdır, lakin buna kəffarə düşmür.

---

[175] Şərhul Muntəhə kitabında demişdir: Əgər: Bir şey və onun yarısı arasında seçim necə olur ki?-deyilərsə, deyəcəyik: Səfərdə olanın namazı tam yaxud qısa qılmağda seçim qarşısında qoyulduğu kimi.(neylul məarib:1/107)

[176] Altı və ya yeddi gün oturması qohum qadınlarda müşahidə olunan əksər hala görədir, əgər onlarda adətən altı gün olursa altı gün, yeddi gün olursa, yeddi gün oturar.

[177] Yəni, istihazə, daimi sidik, məzi və sair daimi hədəsi olan insanlar yeri yumalı və bacardığı qədər bərk bağlamalıdır. Sonra hər namazın vaxtı daxil olduqdan sonra namazı mübah etmək niyyəti ilə dəstəmaz almalıdır, əgər bu vaxt nəisə çıxarsa. Heç bir şey çıxmazsa, namaz vaxtının çıxması ilə dəstəmazı pozulmaz.

**Nifas**: onun ən qısa müddəti üçün hər hansı bir hədd yoxdur. Ən uzun müddəti isə qırx gündür. Onun hökmü, insan quruluşunda olduğu aydın görünən birini doğmaq ilə sabit olur.

Əgər qırx günün içində qanın əsər əlaməti qalmazsa, təmizlənmə sayılacaq. Lakin bu müddətdə onunla cinsi əlaqəyə girmək məkruhdur.

Əgər qadın iki yaxud daha çox uşaq doğarsa, nifasın başlanğıc müddəti birinci uşaqdan başlayacaq. Əgər onların arasında qırx gün fərq olsa belə ikinci uşaq üçün (ayrıca) nifas yoxdur.

Heyzli qadınla cinsi əlaqə ilə bağlı olan hər şey nifaslı qadınla cinsi əlaqədə də keçərlidir.[178]

Kişi cinsi əlaqənin qarşısını alacaq mübah dərmanlar qəbul edə bilər. Qadın həmçinin heyzin hasil olması və onun kəsilməsi üçün dərman içə bilər.[179]

## Əzan və iqamə bölümü

Əzan və iqamə[180] azad kişilər[181] üçün daimi məskunlaşdıqları yerdə fərzu-kifayə, tək adam və səfərdə olan üçün müstəhəb, qadınlar üçün isə, yüksək səslə olmasa belə məkruhdur.

---

[178] Nifas haram və hökmdən düşmə hallarında heyz kimidir. Lakin iddət və həddi-buluğ həddi müstəsnadır, belə ki, heyz həddi-buluğun əlamətlərindəndir, nifas isə uşaq doğmaqdan sonra gəlir və uşağı doğmaq ilə həddi-büluğ artıq sabit olduğu üçün nifasın bir təsiri qalmır. Həmçinin nifas vaxtı zövcəsi ilə cinsi əlaqəyə girməyəcəyinə and içmiş şəxs üçün and içmə (əl-ilə) müddətində hesaba alınmır. Həmçinin iddət nifaslı qadın üçün deyil sadəcə heyzli qadın üçündür. Lakin onlar qüsul, namazın tərk edilməsi, həmin əsnada cinsi əlaqəyə girmək kimi işlərdə müştərəkdirlər.

[179] Hamiləliyə qarşı dərmanlara gəldikdə isə bədənə zərəri olmadığı müddətcə qadın ərinin razılığını aldıqdan sonra istifadə edə bilər, lakin hamiləliyin tamamilə qarşısını kəsən vasitələrə gəldikdə isə haram olmasında şəkk yoxdur, yalnız zərurətdə caizdir.

[180] Əda edilən beş fərz namazı üçün. Cümə də bura daxildir.

Bunların hər ikisi də yalnız tərtib ilə, örfdə mütəvali sayılacaq[182] şəkildə və niyyət ilə bir şəxs tərəfindən deyildiyi zaman səhih olur. Həmin şəxsin müsəlman, kişi, ağıl sahibi, mumeyyiz, danışma qabiliyyətinə malik və zahirdə olsa belə ədalətli[183] olması şərtdir.

Sübh namazının əzanı müstəsna olmaqla vaxtından əvvəl verilmiş əzan və iqamə səhih deyildir. (Sübh namazının əzanı isə) gecə yarısından[184] sonra səhihdir. Yaxında olan üçün əzan vermədiyi müddətcə yüksək səslə olması əzanın rüknu sayılır[185].

Müəzzinin uca səsli, etibarlı[186], vaxtları bilən, təharətli və hər ikisində ayaq üstə olması[187] müstəhəbdir. Dəstəmazsız bir kimsənin əzan verməsi məkruh deyildir, lakin iqamə verməsi (məkruhdur)[188].

Əzanın vaxtın lap əvvəlində olması, onun aramla verilməsi, yüksək bir yerdə üzü qaldıraraq[189], şəhadət barmaqlarını qulaqlara salaraq,

---

181 Yəni iki və daha çox sayda olduqda fərzu-kifayədir, yoxsa tək olana vacib deyildir.

182 Yəni insanların nəzərində, onların adətində iqamə və ya azan verənin iqaməsini və ya azanını kəsdiyi güman ediləcək şəkildə fasilə vermədən iqaməni və azanı söyləmək qəsd olunur. Əzan və ya iqamə arasında qısa fasilə verərsə və ya qısa mübah söhbət edərsə məkruh olar, lakin haram söhbət etsə miqdarından asılı olmayaraq əzanı və ya iqaməsi batil olar.

183 Burada ədalətli ilə böyük günah etməyən və kiçik günahların üzərində israr etməyən müsəlman qəsd olunur. “Zahirdə olsa belə”, yəni gizlində günah edə bilər, əsas zahirin nəzərə alınmasıdır. ət-Təğləbi şərhində (1/114) deyir: “”əş-Şərh” kitabında dedi: “Halı gizli olana gəldikdə isə onun azanı səhihdir və bunda hər hansı bir ixtilafın olduğunu bilmirik.”

184 Alləmə əl-Ləbədi deyir: «Bu zaman gecə ilə qəsd olunan təkcə günəşin batmasından fəcrin girməsinə qədər olan vaxt yox, (günəşin batmasından) onun çıxmasına qədər olan vaxtdır.” (“Haşiyətul-Ləbədi”, səh: 46)

185 Yəni azanda səsi qaldırmaq, yüksəkdən söyləmək azanın rükunudur və rükunu olmasının mənası budur ki, bunu qəsdən və ya unudaraq tərk etmək azanı batil edir. Lakin yaxında duranlar üçün azanın verilməsi istisna edilmişdir, çünki azanla məqsəd elan etməkdir. Lakin taqətindən daha çox səsini qaldırmağı məkruhdur.

186 Azanı vaxtında vermək baxımından etibarlı biri olması sünnətdir. Həmçinin minarəyə çıxdıqda məscidin qonşuluğunda olan qadınlara baxmamaq yönündən də etibarlı biri olması qəsd olunur.

187 Müsafir və üzrü olan istisna oturaraq və ya uzanaraq əzan və iqamə vermək məkruhdur.

188 Cunub olan birisinin isə əzanı da məkruhdur.

189 ət-Təğləbi şərhində (1/116) deyir: “(əl-Mərdəvi) “əl-İnsaf” kitabında deyir: “Məzhəbin səhih görüşünə görə bütün azan boyu üzünü səmaya doğru qaldırar.”

qibləyə yönələrək[190] və “hayyə aləs-saləh” dedikdə sağa və “hayyə aləl-fələh” dedikdə isə sol tərəfə çevrilərək verilməsi, minarənin üzərində olmadığı təqdirdə ayaqlarını durduğu yerdən çəkməyərək[191] və sübh namazında “hayy alə...” dedikdən sonra ət-təsvib adlanan “əs-salətu xeyrun minən nəum” sözlərini iki dəfə demək[192] müstəhəbdir.

Çətin olmayacağı təqdirdə bir nəfərin əzan və iqaməni üzərinə götürməsi müstəhəbdir.[193]

Hər kim namazları cəm edərsə və ya qəzaları qılarsa birinci (namaz) üçün əzan və hər bir namaz üçün (ayrılıqda) iqamə verər.

---

190 Bu sünnəti tərk etmək də məkruhdur.

191 Burada ayaqları çəkməmək ilə qəsd olunan ayaqları olduğu yerdə saxlamaq, sağa sola çevrildikdə ayaqları çevirməmək qəsd olunur. Şeyx əd-Duməni deyir: “Onun “ayaqlarını... çəkməyərək” sözləri; yəni azanı qurtarana qədər azan verdiyi yerdən (çəkməməlidir) və (bir şeyə) söykənməməlidir. Onun “minarənin üzərində olmadığı təqdirdə” sözləri; yəni (minarənin üzərində) buna ehtiyac vardır ki, azan yaxşı çatdırılsın. (əl-Kərmi) bu görüşündə əl-Qadi (Əbu Yalə), əl-Məcd (İbn Teymiyyə) və bir qrup hənbəli aliminə tabe olmuşdur. (əl-Mərdəvi) “əl-İnsaf” kitabında deyir: “Doğru görüş budur, çünki bu cür etmək elanı çatdırmaqda daha güclüdür.” “əl-Muntəhə” kitabındakı ibarə isə belədir: “Ayaqlarını çəkməməlidir.” Kitabı şərh edən (əl-Buhuti) deyir: “Minarə üzərində və ya başqa yerdə olması arasında fərq yoxdur.” (“Haşiyətud-Duməni”, səh: 294-295) Beləliklə buradan anlayırıq ki, əl-Kərmi – rahiməhullah – burada minarənin üzərində ayağı çəkməməyi sünnətdən saymamışdır. Bu görüş həmçinin əl-Qadi Əbu Yalə, İbn Teymiyyənin babası Məcdud-Din İbn Teymiyyə, İbnul-Cəvzi və əl-Ədəmi kimi hənbəli alimlərinin görüşüdür. Lakin məzhəbin görüşünə görə bu məsələdə minarə ilə başqa yer arasında bir fərq yoxdur, hər bir yerdə ayaqları olduğu kimi saxlamaq sünnətdir. Yalnız boyunu çevirmək və ayaqlar yerindən tərpənməyəcək qədər sinəni çevirmək kifayət edir.

192192 əd-Duməni deyir: “Bu sözlərin zahirindən anlaşılan budur ki, hətta fəcr girmədən öncə verilən azanda da demək olar, çünki insanlar adətən o vaxt yatırlar. Sübh azanından başqa yerdə və həmçinin azan ilə iqamə arasında bunu demək məkruhdur. əd-Dənəvşəri deyir: “Əshabımızın “sübh azanında “hayyə alə...”dən sonra” sözlərinın zahirindən anlaşılan budur ki, fəcrdən öncə olan birinci azanda deyilməz.” (“Haşiyətud-Duməni”, səh: 295) Beləliklə alimlər bu məsələdə fərqli anlayışa sahibdir. əd-Duməni’yə görə bu sözləri fəcr girmədən öncə verilən birinci azanda da demək olar, lakin əd-Dənəvşəri isə verilməyəcəyini deyir.

193 Yəni müəzzin minarənin başında azan verirsə və ya bir qədər aralı yerdə azan verirsə oradan gələrək iqamə vermək bəzən çətin ola bilər, məşəqqətə səbəb ola bilər. Əks halda isə həm azanı, həm də iqaməni bir nəfərin verməsi müstəhəbdir.

Əzan yaxud iqamə verəni eşidənə[194] onun dediyinin eynisini təkrarlamaq, lakin istisna olaraq (müəzzin) “**hayyə alə...**” dedikdə “**lə həulə və lə quvvətə illə billəh**”[195] sözlərini, ət-təsvib sözlərində “**sadəqtə və bərirtə**”[196] sözlərini və iqamə ləfzində isə “**əqaməhəllahu və ədəməhə**”[197] sözlərini demək sünnətdir. Bunu bitirdikdən sonra peyğəmbərə - salləllahu aleyhi və sələm - salavat[198] gətirilir və ardınca belə deyilir: “**Allahummə rabbə həzihi-d-də`vati-t-təmməh, vas saləti-l-qaiməh, əti muhammədən-il-vəsilətə və-l-fədilə vəb`ashu məqamən məhmudən-il-ləzi va’adtəh.**”[199] Sonra burada və iqamədən sonra dua edir.

Əzandan sonra üzr olmadan yaxud qayıtmaq niyyəti olmadan məsciddən çıxmaq haramdır.

---

[194] Bu, müəzzinin və iqamə verənin özünə də sünnətdir.
[195] Muslim (12/385); Bu hədisi Ömər ibn əl-Xattab – radiyallahu anhu - rəvayət edib.
[196] Dörd məzhəbin fəqihlərinin böyük əksəriyyəti kitablarında bunu qeyd edirlər. Lakin bunun hədis kitablarında hər hansı bir əslinin olub olmadığına gəldikdə isə böyük mühəddis alimlər bunun əslinin olmadığını deyiblər. əl-Hafiz İbn Hacər “ət-Təlxis” kitabında bunun bir əslinin olmadığını demişdir. Lakin hicri 710-cu ildə vəfat etmiş misirli məşhur şafi’i alimi Nəcmud-Din İbnur-Raf’a bunun bir xəbərə dayandığını deyib. Ona görə də əl-Munəvi, əz-Zəbidi, ər-Ramli, İbn Abidin kimi sonradan gələn fəqihlər İbnur-Raf’anın şahidliyinə əsaslanaraq bunu qəbul ediblər. İstənilən halda şübhəli işləri tərk etmək təqvadandır.
[197] Bunu Əbu Davud (528) Əbu Uməmə’dən rəvayət etmişdir. Həmçinin peyğəmbərin - sallallahu aleyhi va sələm - bəzi səhabələrindən və Bilal’dan mərfu olaraq rəvayət edilib. əl-Hafiz ibn Hacər “ən-Nətəic” kitabında (1/361) kitabında demişdir: “Bu, qərib bir hədisdir. Əbu Davud bu rəvayəti belə nəql etmiş və onun üzərində susmuşdur. Hədisin isnadında naməlum ravi var. Şəhr ibn Havşəb haqqında isə danışıblar. Lakin onun hədisi digər rəvayətlərə zidd gəlmədiyi zaman yaxşı sayılır. Adı çəkilən Muhamməd ibn Sabit isə əl-Abdi’dir, onun haqqında da danısıblar. Bunu Vaki` ondan rəvayət etmişdir, lakin isnadında Şəhr ibn Havşəbi qeyd etməmişdir.”
[198] Məzhəbin görüşünə görə yalnız salavatla kifayətlənmək məkruh deyil, lakin diləsə salamı da əlavə edə bilər.
[199] əl-Buxari (614) və başqaları Cabirin hədisindən nəql ediblər və Muslim (11/384) bunu Abdullah bin Amr bin əl-As’ın hədisindən rəvayət etmişdir.

## Namazın şərtləri bölümü

**Bunlar doqquzdur**: müsəlman olmaq, ağıl, təmyiz[200], həmçinin qadir olduqda təharətin olması.

**Beşinci**: vaxtın girməsi.

Beləliklə zöhrün vaxtı, günəş zeniti keçdikdən sonra hər şeyin kölgəsinin - günəş zeniti keçərkən mövcud olan kölgəsindən başqa - özü mislində böyüməsinə qədərdir.

Bundan sonra əsrin sərbəst vaxtı gəlir və hər şeyin kölgəsinin - günəş zeniti keçərkən mövcud olan kölgəsindən başqa - özünün iki mislində böyüməsinə qədər davam edir. Bundan sonra günəş batana qədər (əsrin) zərurət vaxtıdır.[201]

Daha sonra məğribin vaxtı gəlir və qırmızı şəfəq yoxa çıxana qədər davam edir.

Daha sonra gecənin üçdə birinə qədər davam edən i'şə namazının sərbəst vaxtı gəlir. Bundan sonra sübh girənə qədər (i'şə namazının) zərurət vaxtıdır.

Sonra isə sübhün vaxtı gəlir və günəş çıxana qədər davam edir.

Vaxta yetişmə ihram təkbiri ilə hasil olur[202].

---

[200] Bu üçü bütün ibadətlərin şərtlərindəndir, yalnız təmyiz həcc ibadətində istisnadır, belə ki, dünyaya bir saat öncə göz açmış olarsa belə mumeyyiz olmayanın həcc etməsi səhihdir, çünki onun əvəzinə vəlisi ihrama girir. ("Neylul-Məərib", 1/120)

[201] Heç bir üzr olmadan namazı sərbəst vaxtından zərurət vaxtına qədər gecikdirmək haramdır.

[202] Yəni, yalnız ihram təkbiri namazın vaxtına təsadüf edərsə, namazın qalan hissəsi isə vaxt çıxandan sonra yerinə yetirilsə də namaz əda olunmuş hesab olunur, qəza deyil. Lakin namazı qəsdən bu cür gecikdirmək haramdır. Bunun faydası isə odur ki, namazın vaxtından ihram təkbiri qədər vaxt qaldığında qadın heyzdən təmizlənərsə, və ya məcnun ağıllanarsa, və ya uşaq həddi buluğa çatarsa, bu vaxtın namazını və ona cəm olunan namazı qəza etməlidir. Ona cəm olunan namaz ilə qəsd olunan isə, cəmin mübah olduğu zaman cəm edilləndir. Beləliklə dediyimiz şeylərdən biri əsr vaxtının çıxmasına ihram təkbiri qədər qalmış vaxtdan əvvəl baş verərsə, əsr və zöhr namazları qəza edilməlidir. İşa namazının vaxtında baş verərsə, onunla birlikdə məğribi də qəza edər.

Namazı icazəli vaxtdan gecikdirmək haramdır. Onu yerinə yetirməyə qərarlı olduqda öz vaxtı içində gecikdirmək icazəlidir.

İlk vaxtda qılınan namaz daha fəzilətlidir və ilk vaxtda namaza hazırlıq görmək ilə fəzilət hasil olur[203].

Qəza namazlarının dərhal və tərtiblə qılınması vacibdir. Belə olan halda mütləq nafilə namazı səhih olmur[204].

Unutqanlıq[205] üzündən və vaxtın – sərbəst vaxt olsa belə - darlığı üzündən tərtib (qüvvədən) düşür[206].

**Altıncı**: qadir olduqda dərinin (rəngini) vəsf etməyəcək bir şeylə[207] övrəti örtmək.

On yaşı tamam olmuş oğlanın, mumeyyiz qızın və qismən azad edilmiş olsa belə kənizin[208] övrət yeri göbəklə dizin arasıdır[209]. Yeddi yaşından on yaşına qədər olan oğlan uşaqlarının övrəti cinsiyyət oqranı və anus dəliyidir. Həddi buluğa çatmış azad qadının namazda övrəti üzündən savayı hər yeridir[210].

---

[203] İşa namazı istisnadır, çünki namaz qılanlara çətin olmadığı təqdirdə onu gecənin üçdə birinə qədər uzatmaq sünnətdir.

[204] Burdan anlayırıq ki, vitr, ratibə, duha, kusuf, istisqa və bunlar kimi qeydlənmiş namazlar səhihdir.

[205] Cahilliyə görə isə tərtib güvvədən düşməz.

[206] Beləliklə, vaxt daralanda - və vaxtın daralması bu vaxtın namazından başqası üçün vaxtın qalmamasıdır - bu vaxtın namazını qılmaq lazımdır, hətta qeydi olan sünnət namazları burada səhih olmayacaq.

[207] Şeyx əl-Ləbədi deyir: “Zəfəran rəngi, yabanı zəfəran rəngi (yəni bir qədər sarımtıl qırmızı) və qırmızı rəngə tamamilə boyanmış, yəni ondan başqa rəngi olmayan paltarları geyinmək məkruhdur. İmamdan nəql olunub ki, o, sarımtıl qırmızını şiddətlə məkruh görmüşdür. Digər üç imamın məzhəbi isə bunların heç birini geyinmək məkruh deyildir. “əl-Furu” kitabında (İbn Muflih) dedi: “Bu görüşü əş-Şeyx (İbn Teymiyyə) seçmişdir və üstün olan budur.” Deyirəm: Onların sözlərinin zahirindən anlaşılan budur ki, sarımtıl qırmızı və ya zəfəran rəngi ilə yox, lakin sarı rəng ilə boyanmış paltarı geyinmək məkruh deyildir, əks halda deyərdilər ki, qırmızı kimi sarını geyinmək də məkruhdur.” (“Haşiyətul-Ləbədi”, səh: 50)

[208] əl-Ləbədi haşiyədə (səh: 51) deyir: “Görünür burada həddi-buluğa çatmış olan qəsd edilir.”

[209] Göbək və dizlər övrətə daxil deyildir

[210] İmam Əhməddən gələn digər rəvayətə görə biləklərə qədər əllər də övrət deyildir. əl-Muvəffəq İbn Qudəmə “əl-Umdə” kitabında və Məcdud-Din İbn Teymiyyə bu görüşə üstünlük veriblər. Şeyxul-İslam İbn Teymiyyə isə ayaqların

Fərz namazında[211] həddi-büluğa çatmış kişiyə paltarından bir şey ilə çiyinlərindən birini örtmək şərtdir[212].

Hər kim bildiyi və xatırladığı halda qəsb edilmiş və ya ipək paltarda namaz qılarsa, namazı səhih olmaz.

Əgər yalnız qəsb olunmuş paltarı varsa namazı çılpaq qılmalıdır,[213] başqa bir paltarı olmazsa ipək paltarda[214] namazı qılmalıdır, (paltar tapdıqda) onu yenidən qilmaq lazım deyildir.

---

da övrət olmadığını demişdir. Burada qeyd olunan namaz daxilindəki övrətə aiddir. Namazdan kənardakı övrətə gəldikdə isə Şeyx əd-Duməni haşiyəsində (səh: 315) deyir: "Namazdan kənarda isə, kişilərə nisbətdə bütün bədəni övrətdir, qadınlara nisbətdə isə göbək ilə diz arasıdır." Nəzərə almaq lazımdır ki, bizim zamanımızda sosial həyatda qadınların üzünə baxmağa ehtiyac vardır. Ona görə də fayda üçün bu məsələni zikr etməyi lazım görürük. Qadi Aləud-Din əl-Mərdəvi "əl-İnsaf" kitabında (8/28) deyir: "Onun qəsdən yad qadına baxması caiz deyildir. Bu, doğrudur və məzhəbin görüşü budur. Əshabımızdan bir qrup alim kişinin yad qadının namazda övrət olmayan hissələrinə baxmağa icazə veriblər. (əs-Səmuri) "əl-Mustəv'ib"də "ədəb" bölməsində bu görüş üzərində qərarlaşıb. Şeyx Təqiyyud-Din (İbn Teymiyyə) bunu (İmam Əhməddən) bir rəvayət olaraq zikr edib. Qadi (Əbu Yələ) dedi: "Haram olan üz və iki əldən başqa yerlərdir." Qadi (Əbu Yələ) "əl-Cami" kitabında açıq şəkildə bildirib ki, "heç bir ehtiyac olmadan yad qadına baxmaq icazəli deyildir." Sonra isə buyurur: "Övrətə baxmaq haramdır, övrət olmayan yerə isə məkruhdur." (Qadi Əbu Yələ'nin tələbəsi) İbn Aqil və (oğlu) Əbul-Hüseyn bu şəkildə zikr ediblər. Əbul-Xattab (əl-Kəlvəzəni) deyir: "Bizim dediyimiz yerlərdən başqasına baxmaq icazəli deyildir, lakin Qadi (Əbu Yələ) bu ifadəni işlətmişdir və övrətdən başqa yer barədə məkruhluq nəql edib." Şeyx Təqiyyud-Din (İbn Teymiyyə) – rahiməhullah – deyir: "Ehtiyac olmadan yad qadının üzünə baxmaq haramdırmı?" İmam Əhməddən gələn bir rəvayətə görə məkruhdur, haram deyildir. İbn Aqil dedi: "Əgər fitnədən əminlik varsa yad qadının üzünə baxmaq haram deyildir." (əl-Mərdəvi deyir: ) Deyirəm: İnsanların - xüsusilə də qonşular üçün və aralarında böyüdüyü məhrəm olmayan qohumlar üçün - bu görüşdən başqasını götürməsi mümkün deyildir. Bu, əş-Şafi'nin məzhəbidir."

[211] Bura fərz ayn, fərz kifayə və nəzir namazları daxildir. Sünnət namazlarında isə çiynini örtməsi şərt deyil.

[212] Burada paltar dərini vəsf etsə belə kifayətdir, lakin bir çiyinin tamamını örtməsi şərtdir.

[213] Bu, sırf məzhəbə xas olan məsələlərdəndir. Çünki qəsb edilmişin hər bir halda, zərurət və digər hallarda caiz görülməsi məlum deyil. Bu arada ipək bədənin giçişməsi kimi zəruri hallarda mübah edilişdir.(Mənhuş şəfiyət:26 səh)

[214] Yəni, əgər insan müvəqqəti istifadə üçün aldığı olarsa belə həmin paltara sahib olarsa  digəri olmayacağı halda onu istifadə edə bilər.Çünki qoturluq və cüzəm xəstəliyi, soyuq zərurəti yaxud örtəcək digər bir şeyil yoxluğu kimi bəzi hallarda bunu geyinmək icazəlidir.(Neylul məarib:1/125).

Başqa bir paltarı olmadıqda nəcasətə bulaşmış paltarda namazı qılmalı, lakin (sonra paltar tapdıqda) onu yenidən qılmalıdır.

Qadınlara deyil, kişilərə qızıl və ya gümüş ilə tikilmişi və bəzədilmişi, həmçinin hamısı və ya əksər hissəsi ipəkdən olanı geyinmək haramdır[215].

Bünövrəsi ipəkdən düzəldilmiş və digər material ilə qarışdırılmış, yaxud üzdə ipək ilə digər materialının miqdarı eyni görünən paltarı geyinmək mübahdır.

**Yeddinci:** qadir olduqda bədənin, paltarın və yerin nəcasətdən təmiz olması.

Əgər bir şəxs nəcasətli bir yerdə həbs edilərsə və orada namaz qılarsa, namazı səhih olar. Lakin nəm nəcasət olan yerdə o, imkan daxilində namazı işarə ilə qılmalı və ayaqlarının üzərinə əyləşməlidir.

Əgər paltarı nəcasətə bulaşmış bir paltara, və ya söykənmədiyi (nəcasətə bulaşmış) bir divara dəyərsə[216], və ya kənarı nəcasətə bulaşmış təmiz bir yerdə namaz qılarsa, və yaxud da (namazda olarkən) üzərinə nəcasət düşərsə və dərhal (özü) ortadan qalxarsa və ya dərhal onu aradan götürərsə, namazı səhihdir.

Onu dərhal aradan götürə bilməzsə və ya unudarsa və sonra bunu bilərsə namazı batil olar.[217]

Qəsb olunmuş ərazidə, həmçinin qəbiristanlıqda[218], sallaqxanada, zibillikdə[219], ayaqyolunda, dəvələrin tövləsində, insanların çoxca

---

[215] Həm qadın həmdə kişilərə üzərində canlı varlığın təsviri olan paltarı geyinmək haramdır, və belə paltarda qılınan namaz səhih deyildir.
[216] Burada qəsd olunan nəcasətin quru olub onun paltarına yapışmadığı hallardır.
[217] “əl-İnsaf” kitabında (1/486) əl-Mərdəvi deyir: “Bu, məzhəbin görüşdür. Ondan (yəni İmam Əhmənddən) gələn digər rəvayətə görə səhihdir. Son dönəmin alimlərinin çoxuna görə səhih olan rəvayət budur”.
[218] Cənazə namazı istisnadır, beləliklə onu qəbiristanlıqda qılmaq məkruh deyildir.
[219] Zibil təmiz olsa da.

istifadə etdiyi yollarda[220] və hamamda namaz qılmaq səhih deyildir. Bu yerlərin damı da özləri kimidir.[221]

Kəbənin – və hicr də bura daxildir - içində və onun üzərində fərz namazını qılmaq yalnız onun arxasında heç bir şeyin qalmayacağı halda səhih olur.

Onun içində və üzərində nəzir edilmiş namazları qılmaq səhihdir. Həmçinin qılınan nafilə namazları da səhihdir, hətta içində (qılmaq) sünnətdir.

**Səkkizinci:** imkan daxilində qibləyə yönəlmək.

Əgər qiblənin istiqaməti haqqında dəqiq xəbər verəcək birini tapmazsa öz görüşünə əsasən namazı qılacaq. Əgər yanlış istiqamətə qılıbsa onu yenidən qılmaq lazım deyildir[222].

**Doqquzuncu:** niyyət; (bu şərt) heç bir halda qüvvədən düşmür. Niyyətin yeri qəlbdir. Onun mahiyyəti, bir şeyi yerinə yetirməyi əzm etməkdir. Onun şərti isə müsəlman olmaq, ağıl və təmyizdir. Onun (edilmə) vaxtı, ibadətin əvvəlidir və ya ondan azca öncədir. Onun təkbir ilə eyni zamanda edilməsi daha fəzilətlidir.

Namaz niyyəti ilə birlikdə zöhr və ya əsr və ya vitr və ya ratibə namazı kimi hansı namazı qılacağını təyin etməlidir, digər hallarda isə sadəcə namaz niyyətini etmək yetərlidir.

Namazın vaxtı girmiş namaz yaxud qəza yaxud fərz olmasını təyin etmək şərt deyildir[223].

---

220 İnsanların çox olduğu üçün cümə və bayram namazlarını yollarda qılmaq caizdir.

221 Belə ki, Əhmədə görə qadağan olunmuş yerlərin damı özü kimidir.Çünki onun açıqlıq hissəsi daxilə qoşulur. Buna dəlil cunublunun məscidin damında qalmasına maneədir.Həmçinin insan girməyəcəyinə and içdiyi evin damına çıx-maqla andını pozur.(Neylul məarib:1/129)

222 Müəllifin qəsd etdiyi, heç bir yolla qiblənin dəqiq istiqamətini bilməmək halıdır. Lakin bizim zamanda hadarda olana qibləni soruşaraq tapmaq əksər hallarda çətin deyildir, buna görə soruşmadan qılınan namaz iadə edilməlidir, yalnız qibləni müəyyənləşdirmək üçün əlindən heç bir şey gəlməzsə, özü ictihad edər və qılar, bu halda səhv etsə də iadə lazım deyil.

223 Həmçinin rükətlərin sayını və edilən namazı Allah üçün edildiyini niyyət etmək fərz deyil. Lakin zöhr vaxtında günün zöhrünü qılan sonradan boynunda

İmamın imamlıq, onun arxasında qılanın isə ona tabe olmağı niyyət etməsi şərtdir[224].

Camaatı tərk etməyə icazə verən hər hansı bir üzrə görə ayrılma niyyəti etmək hər ikisi üçün də səhihdir. Qiyamda imamdan ayrılan məmum ya (fatihəni) özü oxuyur və ya tamamlayır və fatihədən sonra isə dərhal rukùya gedə bilər[225].

Hər kim fərz niyyəti ilə namaza girər daha sonra niyyətini nafilə namazına döndərərsə bu, vaxt (fərz namazını qılmağa) imkan verdiyi təqdirdə səhih olar. Əks halda isə səhih olmaz və həmin adamın fərz namazı batil olar.

---

qəza olan zöhr namazı olduğunu xatırlayarsa, qıldığı zöhr onun yerini verməz. Həmçinin bu halda ilk əvvəl qəza zöhrünü qılarsa, sonra qəzası olmadığı aşkar olarsa, qıldığı namaz günün zöhrünün yerini verməz.

[224] Başdan imam olmağa niyyət etməyənə sonradan imamlıq niyyətini etmək səhih deyil, nafilə namazı olsa da. Buradan yalnız imam hansısa üzrə görə ayrılıb öz yerinə birini imam etməsi halı istisnadır. Həmçinin əvvəldən məmum olmağa niyyət etməyənə sonradan niyyətini dəyişib məmum olmaq səhih deyildir.

[225] Səsszi namazlar da isə, əgər imamın fatihəni oxuduğunu zənn edərsə, oxumaya bilər, lakin ehtiyat baxımından özünün də oxuması daha yaxşıdır.

Heyzli və nifaslı qadından savayı hər bir mükəlləf müsəlmanın üzərində vacibdir.

Mumeyyizin – və o, yeddi yaşına çatmış uşaqdır – qıldığı namaz səhihdir və savabı ona aiddir.[226]

Vəlisinin ona yeddi yaşında bunu əmr etməsi və bunu tərk etməsi halında on yaşında onu vurması gərəkdir.

Hər kim namazı danaraq tərk edərsə mürtəd olar və ona mürtədlərin hökmləri şamil olar.[227]

**Namazın rükunları on dörddür**; bunlar nə qəsdən, nə səhvən nə də bilməməzlik üzündən qüvvədən düşmür.

**Birinci**: qadir olan şəxsin fərz namazında ayaq üstə dik durması. Əgər o, heç bir üzr olmadan ayaq üstə duran adlanmayacaq surətdə əyilərək və ya maili şəkildə durarsa səhih olmaz. Başını aşağı salması

---

[226] ət-Təğləbi şərhində (1/133) deyir: "Həddi-büluğa çatmış birinin namazının səhihliyi üçün şərt olan hər bir şey onun da (yəni mumeyyizin də ) namazının səhihliyi üçün şərtdir, yalnız örtünmək istisnadır." əl-Ləbədi bu sözlər barəsində haşiyəsində (səh: 56) deyir: "Övrəti örtməyi qəsd edir; belə ki, həddi-büluğa çatmış kişi göbəyi ilə dizinin arasını və fərz namazlarında çiyinlərindən birini örtməlidir. Mumeyyizə gəldikdə isə əgər on yaşdan kiçikdirsə cinsiyyət orqanı ilə anus dəliyindən başqa yerləri örtməsi vacib deyildir, çünki örtünmək onun namazının səhihliyinin şərti deyildir." Buradan anlayırıq ki, yeddi yaşından on yaşına qədər olan uşaqlar alt paltarında namaz qılarlarsa, namazları səhihdir.

[227] Şeyx Osman əl-Cəmi "əl-Fəvaid"də (1/114) deyir: "Həmçinin səhlənkarlıq və ya tənbəllik üzündən tərk edən də, imam və ya onun naibi onu namaz qılmağa çağırdıqdan sonra digər namazın vaxtının çıxmasına az qalarsa bu hökmdədir." Yəni mürtəddir. Buradan anlayırıq ki, məzhəbin görüşünə görə tövbəyə çağırılmadan namazı tərk edən təkfir edilməz. Fayda: Şeyx əl-Ləbədi deyir: "Müsəlmana şəriət çatmadan öncə ötürdüyü namazları qəza etmək vacibdir. Bunun vacib olmadığı da deyilmişdir, bunu əl-Qadi (Əbu Yalə) zikr edib və bu görüşə əş-Şeyx (İbn Teymiyyə) üstünlük verib."Qəsdən və ya unudaraq tərk edilmiş namazların qəzasını qılmaq vacibdir. Lakin mürtəd olan birinin mürtəd olduğu müddətdə tərk etdiyi namazları qılması vacibdirmi? Bu barədə İmam Əhməd'dən iki rəvayət gəlib və məzhəbin səhih görüşünə görə vacib deyildir.

isə zərər verməz. Heç bir üzr olmadan bir ayaq üstə durması isə məkruhdur.

**İkinci**: ihram təkbiri; və bu, "**Allahu Əkbər**" sözləridir, (onun əvəzində) başqa sözlər keçərli deyildir və bu sözləri ayaq üstə deməlidir. Əgər bu sözləri ayaq üstə olmadan başlayarsa və ya tamamlayarsa nafilə namazı olaraq səhih sayılacaq[228]. Əgər "Allah" kəlməsində və ya "Əkbər" kəlməsində həmzə hərfini yox, "ləm" hərfini uzadarsa mün'əqid olar, amma "əkbəər" və ya "əl-əkbər" deyərsə olmaz[229].

Bunu və bütün rükunları və vacibləri özü eşidəcək şəkildə səslə demək fərzdir.[230]

**Üçüncü**: fatihə surəsini tərtiblə oxumaq; bu surədə on bir şəddə vardır və əgər onlardan birini və ya bir hərfi tərk edərsə və tərk etdiyini (düzəldərək) söyləməzsə (namazı) **səhih olmaz.**[231] Əgər bir ayədən artıq bilməzsə onu fatihə surəsi miqdarında təkrar edər.[232] Hər kimin ki, ayaq üstə oxuması imkansızdır, o, oturaq halda qılar və oxuyar.

---

[228] Bu, qəsdən etmədiyi, vaxtın geniş olduğu və namaz qılanın imam olmadığı hala aiddir, əks halda namaz səhih olmaz.

[229] "Allah" və "Əkbər" sözləri arasında bir söz deyilə biləcək qədər fasilə verərsə, namaz münəqid olmaz. Allahu Əkbər Kəbiiran desə, səhih olar, lakin belə etmək məkruhdur.

[230] əl-Ləbədi haşiyəsində (səh: 58) deyir: "Əgər imamdırsa səsli namazda arxadakıların onu eşidəcək şəkildə təkbiri, təsmi'i, birinci salamı və qiraəti səslə etməsi sünnətdir. İmamdan qeyrisinə isə təkbir, salam və buna bənzər yerləri səssiz etməsi sünnətdir. Məmumun səslə oxuması məkruh sayılıb, lakin ehtiyac olduqda, yəni imam məmumların hamısına eşitdirə bilmədikdə (bəzi məmumlara) təkbir, təhmid və salamı (səslə deməyi) istisna ediblər." Burada təsmi' sözü "səmi' Allahu limən həmidəh" və təhmid isə "rabbənə va ləkəl həmd" sözləridir.

[231] ət-Təğləbi deyir: "Lakin əgər səhvən tərk edərsə o zaman həmin rükət ləğv olunur, ondan sonra gələn rükət onun yerinə keçir."

[232] İbn Əbi Təğləb şərhində (1/136) deyir: "əl-Haccəvi dedi: "Əgər bir ayənin bir hissəsindən – bu, istər fatihənin, istrəsə də bir başqa surənin bir ayəsinin bir hissəsi olsun - artıq bir şey bilmirsə, onu təkrarlaması doğru deyildir, başqa bir şeyə keçməlidir." əl-Ləbədi haşiyəsində "başqa bir şeyə keçməlidir" sözlərini izah edərək deyir: "Yəni "subhanəllah val-həmdu lilləh va lə iləhə illəllah vallahu əkbəru" sözlərini fatihə qədər söyləməlidir. Əgər bunların hamısını bilməzsə, lakin bir hissəsini bilərsə bildiyini fatihə qədər təkrarlamalıdır. Əgər bunu da bilməzsə fatihə miqdarında durmalıdır."

**Dördüncü**: rukü; onun ən naqis şəkli ovucları ilə dizlərinə toxuna biləcək qədər əyilməsidir.[233] Ən kamil şəkli isə belini düz uzatmaq və başını onunla bir səviyyədə etməkdir.

**Beşinci**: ondan qalxmaq; bununla o, başqa şeyi qəsd etməməlidir. Əgər nədənsə qorxaraq qalxarsa kifayət etməz.

**Altıncı**: dikəlib durmaq; bu hal uzanarsa namaz batil olmaz.

**Yeddinci**: səcdə; ən kamil şəkli insanın alnını, burnunu, ovuclarını, dizlərini və ayaq barmaqlarının uclarını səcdə yerində yaxşıca yerləşdirməsidir.[234] Ən naqis şəkli isə hər əzadan bir hissəni yerə qoymaqdır.[235] Etibara alınan səcdə əzalarının oturmasıdır; əgər biri alnını qabarmış pambıq kimi bir şeyin üzərinə qoyarsa və alını sabit bir yerdə durmazsa, səhih olmaz. Onun öz libasının qoluna və ətəyinə səcdə etməsi səhihdir, lakin bunu üzrsüz etmək məkruhdur. Hər kim alın ilə səcdə etməkdən acizdirsə digər əzaları ilə də səcdə etməsi gərəkli deyildir[236] və imkan daxilində işarə ilə qılmalıdır.

**Səkkizinci**: səcdədən qalxmaq.

**Doqquzuncu**: iki səcdə arasında oturmaq; hər necə otursa kifayət edər. Sunnət isə sol ayağı uzadaraq onun üzərinə oturmaq, sağ ayağı dikəltmək və hər iki ayağını qibləyə yönəltməkdir.

---

[233] Burada "ən naqis şəkli" ilə rükunun keçərli olan ən az həddi qəsd olunur. Bu, ayaq üstə namaz qılanlara aiddir. Oturaraq namaz qılanlara gəldikdə isə ət-Təğləbi bu barədə deyir: "Oturaraq qılan üçün (rükunun) keçərli olan ən az həddi dizlərindən ötədəki yer ilə üzünün üzbəüz gəlməsidir."

[234] əl-Ləbədi deyir: "Yəni bu əzaların hamısının üzərinə səcdə etmək rükundur. (Əhməddən gələn) digər rəvayətə görə burun istisnadır və bir qrup alim bu görüşə üstünlük verib. Digər rəvayətə görə alın rükundur, qalan əzalar isə sünnətdir." Daha sonra əl-Ləbədi bir fayda zikr edir: "Əgər heç bir ehtiyac olmadan baş yeri ayaqlarının yerindən hündür olarsa, aşağı hissə yüksək olmazsa, bunun caiz olduğu deyilib, məkruh olduğu da deyilib, həmçinin batil olduğu da deyilib. Həmçinin çox (hündür) olduqda (batil olduğu) deyilib. Əbul-Xattab (əl-Kəlvazəni) və başqaları deyiblər: "Əgər bununla səcdə formasından çıxarsa caiz olmaz."

[235] Əgər əllərinin üst tərəfi üstündə və ya barmaqları üstündə səcdə edərsə keçərlidir, həmçinin ayaqlarının üst tərəfi üstündə səcdə edərsə keçərlidir.

[236] Yəni əgər alnını qoymaqdan aciz olarsa digər əzaları üzərində səcdə etmək vacib olmaz, həmçinin burnu üzərində də səcdə etməsi vacib olmaz.

**Onuncu**: tumə’ninə və bu, - az çəksə belə - namazın hər əməli rüknunda hərəkətsiz olmaqdır.

**On birinci**: sonuncu təşəhhüd və o, birinci təşəhhüddən yetərli olan qədərini dedikdən sonra “Allahummə salli alə Muhammməd” sözləridir. (Birinci təşəhhüddən) yetərli olan qədər isə “ət-təhiyyətu lilləhi, sələmun aleykə əyyuhən-nəbiyyu va rahmətullahi, sələmun aleynə va alə ibədilləhis-salihin, əşhədu əllə iləhə illəllah va ənnə muhamədən rasulullah” sözləridir. (Təşəhhüdün) kamil şəkli isə məşhurdur.

**On ikinci**: təşəhhüd və salamlar üçün oturmaq; əgər oturmadan təşəhhüdü oxuyarsa və ya birinci salamı oturaraq, ikincini isə oturmadan verərsə səhih olmaz.

**On üçüncü**: salamlar və bu, iki dəfə “əs-sələmu aleykum va rahmətullah”[237] deməkdir. Əlavə olaraq “va bərakətuh” deməmək daha yaxşıdır.[238]

Nafilə namazında, həmçinin cənazə namazında bir salam vermək kifayət edir[239].

**On dördüncü**: Rükunlarda bizim zikr etdiyimiz şəkildə tərtibə riayət etmək; misal üçün əgər biri qəsdən rukudən öncə səcdə edərsə onun

---

[237] Məzhəbin səhih görüşünə görə salamlarda yalnız “əs-sələmu aleykum” demək keçərli sayılmır və “əs-sələmu aleykum va rahmətullah” sözünü tam demək bir rükundur. Bu isə o anlama gəlir ki, bunu səhvən və ya qəsdən tərk etmək namazı batil edir. İmam Əhməd’dən gələn digər rəvayətə görə isə ”va rahmətullah” deməsən də keçərlidir. Bunu əl-Qadi Əbu Yalə zikr edir və əl-Məcd İbn Teymiyyə - rahiməhullah – şərhində bu rəvayətə üstünlük vermişdir.

[238] Bu, məzhəbin görüşüdür. Bu barədə “əl-İnsaf” (1/85), “əl-İqna`” (1/124), “əl-Muntəhə” (1/83), “əl-Ğayə” (1/143) kitablarında yazılıb. “əl-Muğni” kitabında (1/245) İbn Qudəmə deyir: “Əgər “va bərakətuh” deyərsə yaxşıdır, lakin birinci daha gözəldir, çünki onu rəvayət edənlər daha çox, rəvayət yolları isə daha səhihdir.”

[239] Şeyx Alləmə Mənsur ibn Yunis əl Buhutinin dediyinə görə isə, Muntəhə əl İraədət kitabının zahirinə görə nafilə ilə fərzin arasında fərqin olmamasıdır, yəni hər ikisində iki salam verməlidir. Şeyx Mənsurun tələbəsi şeyx Muhammad əl Xalvati Muntəhəyə yazdığı haşiyədə bunun məzhəbin səhih görüşü olduğunu qeyd edib. əl Həccəvinin İqnada və müəllifin əl Ğayə kitabında seçdiyi görüşə görə isə nafilədə bir salam kifayətdir. Cənazəyə gəldikdə isə bir salam kifayətdir və "va rahmatullah" sözünü deməməsi zərər verməz, lakin deməsi daha yaxşıdır.

namazı batil olar. Əgər bunu səhvən edərsə rukü etmək, sonra isə səcdə etmək üçün geri qayıtması gərəkdir.

## Fəsil

**Vacibləri səkkizdir**: Bunları qəsdən tərk etmək namazı batil edir. Səhvən yaxud bilməməzlik üzündən tərk edildikdə (qüvvədən) düşürlər.[240]

İhramdan başqa təkbirlər; lakin imama sonradan qoşulanın ihram təkbirindən sonrakı təkbiri sünnətdir[241]. Həmçinin məmum üçün deyil, imam və tək namaz qılan üçün "**səmi' allahu limən həmidəh**" sözləri, və hər biri üçün "**rabbənə va ləkəl həmd**" sözləri[242], rukúdə bir dəfə "**subhanə rabbiyəl-azım**", səcdədə bir dəfə "**subhanə rabbiyəl-a`lə**", səcdələr arasında "**rabbi-ğfirli**" sözləri[243], imamı səhvən (təşəhhüdü tərk edib) qalxan kəsdən başqaları üçün birinci təşəhhüd və onun üçün oturmaq[244].[245]

---

[240] Bu baxımdan rükun ilə vacib arasında fərq vardır. Rükun olan bir şeyi qəsdən və ya səhvən tərk etmək arasında fərq yoxdur, hər iki halda batil edir. Lakin vacibə gəldikdə isə fərq vardır, qəsdən tərk etdikdə batil edir, səhvən və ya cahillikdən tərk edərsə batil etmir. Namazın vaciblərini səhvən tərk etdikdə ona görə səhv səcdəsi etmək vacibdir.

[241] İmama sonradan qoşulan ilə qəsd etdiyi imam ruku halında daxil olandır. Bu zaman ayaq üstə ihram təkbiri gətirmək rukndur, bundan sonra isə ruku üçün təkbir gətirmək sünnətdir. Bu ikisini bir yerdə niyyət edərək bir təkbir gətirərsə, namazı səhih olmaz.

[242] İmam və tək namaz qılanlar (rükudan) qalxarkən "səmi' Allahu limən həmidəh" deyir, qalxıb tam dikəldikdən sonra "rabbənə va ləkəl həmd" deyir. Məmum isə rukudan qalxdığı vaxt "rabbənə va ləkəl həmd" deyir.

[243] əl-Ləbədi haşiyəsində (səh: 59) deyir: "Əgər "Alləhummə-ğfir li" deyərsə keçərlidirmi? Zahir olan budur ki, bəli. Bunu (İbn Muflih) "əl-Furu" kitabında bir qrup alimdən zikr edir."

[244] Çünki imam səhv edərək birinci təşəhhüdü tərk edərsə və ayağa qalxarsa ona tabe olmaq vacibdir.

[245] İbn Əbi Təğləb şərhində (1/140) deyir: "Vacib olan təkbir, təsmi', təhmid, təsbih və məğfirət diləməyin yeri (bir hərəkətdən başqasına) keçməyə başlamaq ilə qurtarmaq arasındadır. Beləliklə əgər hərəkətə başlamadan öncə həmin yerin zikrini edərsə, misal üçün aşağı əyilmədən öncə səcdə etmək üçün təkbir edərsə

**(Namazın) sünnətləri** isə sözlər və hərəkətlərdir ki, onlardan hər hansı birini qəsdən olsa belə tərk etmək namazı batil etmir. Lakin səhvən (tərk) etdikdə onun üçün səhv səcdəsi etmək mübahdır.

**Sözlü sünnətlər on birdir**: ihram təkbirindən sonra "**subhanəkə-llahummə va bihəmdikə va təbərakə-smukə va təalə cəddukə va lə iləhə ğeyruk**"[246] sözləri, təavvuz, bəsmələ[247], "**əmin**" sözü, Fatihə surəsindən sonra (əlavə) bir surənin oxunuşu[248], imamın səsli oxuması[249] - məmuma bunu etmək isə məkruhdur və tək namaz qılan isə seçim qarşısındadır[250] - , məmumdan başqalarının təhmid'dən

---

və ya əyilib qurtardıqdan sonra təkbir edərsə o təkbir onun üçün keçərli sayılmaz və vacib olan qiraəti rüku edərkən tamamlaq və ya oturmadan öncə təşəhhüdə başlamaq da bunun kimidir." Buradan anlayırıq ki, əgər rükuya başlamadan öncə təkbir gətirərsə və ya bitirdikdən sonra təkbir edərsə keçərli olmaz, səhih sayılmaz. Lakin əl-Ləbədi onun bu sözləri ilə bağlı olaraq deyir: "əl-Məcd dedi: "Bu, məzhəbin görüşünün qiyasıdır və bunun bağışlanılması da möhtəməldir, çünki belə şeydən qorunmaq çox çətindir və belə şeylərdə xətalar çox baş verir, beləliklə bununla namazı batil saymaq və ya səhv səcdəsini vacib görməkdə məşəqqət vardır." əl-Ləbədi burada əl-Məcd İbn Teymiyyənin sözlərini gətirdikdən sonra deyir: "İnsanlar üçün bundan başqası mümkün deyildir və "əl-Furu" kitabında birinci zikr olunmuş görüş budur." Bu görüşü həmçinin əl-Mərdəvi doğru görüş sayıb.

[246] Əbu Davud (776) bunu Əbu Səid əl-Xudri'dən rəvayət edib. Hafiz İbn Həcər "ən-Nətəic" kitabında (1/397) deyir: "Şeyximiz (əl-İraqi) dedi: "İsnadının raviləri etibarlıdır." Bu sözlərin izahı belədir: "Subhənəkə Allahummə", yəni "ey Allahım, Sənin bütün nöqsanlardan pak və təmiz olduğunu deyirəm, "va bihəmdikə", Sənə həmd edirəm, "va təbərakə-smukə", Sənin adını zikr etməklə bərəkət əldə edilir, "va təalə cədduk", Sənin əzəmətin çox böyükdür, uludur, "va lə iləhə ğayruk", Səndən başqa ibadətə layiq haqq məbud yoxdur. Bunu Şeyx İbn Bədran bu şəkildə izah etmişdir.

[247] Burada bəsmələ ilə qəsd olunan "bismilləhir Rahmənir Rahim" sözləridir.

[248] Əlavə surə sübh namazında və digər namazların ilk iki rükətində oxunar. Bu surəni oxumağı tərk etmək məkruhdur. Digər rükətlərdə oxumaq məkruh olmasa da, tərk etmək daha yaxşıdır. Əlavə surələri iki rükətdə Mushafda olan tərtiblə oxumaq sünnətdir, bunu tərk etmək isə məkruhdur. İki rükətdə eyni surəni oxumaq, bir surəni iki yerə bölüb oxumaq, surələrin ortalarından və sonlarından oxumaq, bir rükətdə birdən artıq əlavə surə oxumaq isə məkruh deyil.

[249] əl-Ləbədi haşiyədə (səh: 60) deyir: "Bunun sözlü sünnələrdən sayılması mübahisəli məsələdir, xüsusən qeyd ediləcəyi kimi ihram təkbirini səslə demək əməli sünnətlərdən sayılmışdır. Bunların arasında isə heç bir fərq yoxdur." Səsli oxunanlar isə sübh namazı, həmçinin məğrib və işa namazının ilk iki rükətidir.

[250] "Tək namaz qılan seçim qarşısındadır", yəni dilərsə səslə oxuyar, dilərsə səssiz oxuyar. Bu barədə əl-Ləbədi deyir: "Səslə oxumaq yoxsa səssiz oxumaq əfzəldir? əl-Buhuti və başqaları səssiz oxumağın daha əfzəl olduğunu aşkar

sonra “**mil`ə-s-səməi və mil`əl ərdı va mil`ə mə şi`tə min şeyin bə`du**”[251] duasını etməsi, ruküda və səcdədə edilən təsbihi, həmçinin “**rabbiğfirli**” sözlərini bir dəfədən artıq demək[252], sonuncu təşəhhüddə onun – aleyhissələm - ailəsinə salavat demək və həm ona, həm də ailəsinə bərəkət diləmək[253] və bundan sonra dua etmək[254].

**Əməli sünnətlər – həmçinin “hey’ət”lər adlanır - :** ihram təkbiri ilə birgə, həmçinin rukü və ondan qalxma zamanı əlləri qaldırmaq[255], bunun ardınca əllərini endirmək, sağ əli solun üzərinə qoymaq[256] və onları göbəyin altında yerləşdirmək[257], səcdə yerinə baxmaq[258], ayaq

---

şəkildə bildiriblər. Deyirəm: bir başqa rəvayətdə səslə oxumağın əfzəl olduğu deyilir, bunu “əl-Furu” kitabında zikr edib. Bunun məkruh olması barədə də bir görüş zikr etmişdir.” əl-Buhuti’nin zikr etdiyi hənbəlilər arasında məşhur olan görüşdür, əz-Zərkəşi bunun məzhəbin görüşü olduğunu deyib".

[251] Muslim, (204, 476)

[252] Rukuda və səcdədə edilən təsbihin ən aşağı kamillik sifəti üç dəfə etməkdir, ən kamil sifəti isə imama on dəfə, tək qılana isə örfdə olan qədərdir. Məmum isə imamına tabedir. Rabbiğfirli sözlərində isə kamil sifət üç dəfə deməkdir.

[253] Qeyd edildiyi kimi axırıncı təşəhhüddə peyğəmbərə – salləllahu aleyhi va səlləm – salavat gətirmək, yəni ən azından “Allahummə salli alə Muhamməd” demək bir rükundur. Burada isə ailəsin salavat gətirmək və özü ilə birlikdə ailəsinə bərəkət diləmək sünnətdir. Yəni “va alə əli Muhamməd kəmə salleytə...” sözlərini axıra qədər demək sünnətdir.

[254] əl-Ləbədi burada namaz qılanın deyə biləcəyi dualardan bəzisini zikr edir: “Allahummə innə əuzu bikə min azəbi cəhənnəm va min azəbil-qabr va min fitnəyil-məhyə val-məmət va min fitnətil-məsihid-dəccəl. Allahummə inni əuzu bikə minəl-mə’səmi val-məğram. Allahummə inni zaləmtu nəfsi zulmən kəsira va innəhu lə yəğfiruz-zunubə illə əntə fəğfir li məğfiratən min indikə varhamni innəkə əntəl-ğafurur-rahim. Rabbənə əatinə fid-dunyə həsənə va fil-əxirati həsənə va qinə azəbən-nər.” Məmumlara çətin olmayacağı və səhv etməyindən qorxmayacağı təqdirdə burada, həmçinin rukuda, səcdələrdə, sünnət olduğu yerdə qunutda ərəb dilndə olmaq şərtiylə Quranda, sünnətdə, səhabələrin və ya sələflərin əməllərində varid olan duaları edə bilər. Dünya ləzzətləri istənilməmək şərti ilə istənilən digər duanı da ərəb dilində edə bilər.

[255] Əlləri təkbirə başladığı vaxt qaldırmağa başlayır, və təkbiri bitirdiyi vaxt əlləri qaldırmağı bitirir. Bu zaman əlləri çiyinləri səviyyəsində olmalıdır. “Neylul-Məərib” kitabında (1/142) bunlar əlavə edilir: “Namaza giriş zamanı əlləri açmaq və barmaqları birləşdirmək.”

[256] “əl-Furu” kitabında İbn Muflih deyir: “Sağ əlini sol biləyin üzərinə qoyur.” Əbu Talib nəql edir ki, sağ əlin bir hissəsi sol əlin üstündə, bir hissəsi isə biləyə bitişən qolun üstündə olmalıdır.

[257] İmam Əhməd əllərin sinə üzərinə qoyulmasının məkruh olmasını birmənalı demişdir, baxmayaraq ki, sinə ləfzi gələn hədisi Müsnədində rəvayət edib.

üstə durduqda ayaqları bir birindən ayırmaq, rükuda əlləri ilə - barmaqları bir-birindən aralı şəkildə - dizləri tutmaq, bu yerdə beli (düz) uzatmaq, başı onunla eyni bərabərdə tutmaq, öncə dizləri, daha sonra əlləri, sonra alını və burunu qoymaqla səcdəni başlamaq, səcdə əzalarını yerin üzərində yaxşıca yerləşdirmək, dizlərdən savayı digər əzaları səcdə yerinə birbaşa toxundurmaq[259], - yoxsa məkruhdur - qolları böyürdən, qarını budlardan, budları isə baldırdan aralı tutmaq[260], dizləri bir-birindən ayrı tutmaq, ayaqları dikəltmək və bir-birindən aralı şəkildə ayaq barmaqlarının alt tərəfini yerə qoymaq, əlləri açılmış və barmaqları bitişik halda[261] çiyinlər ilə bir səviyyədə qoymaq, (növbəti) rükətə qalxarkən ilk olaraq (dizlərdən öncə) əlləri qaldırmaq və ayaqların ön hissəsi üzərində qalxmaq, həmin zaman əlləri dizlərə dayamaq, iki səcdə arası oturuşda və birinci təşəhhüddə iftiraş[262], ikinci təşəhhüddə isə təvarruk oturuşu[263], səcdələr arasında, barmaqlar bitişik halda əlləri açıb budun üzərinə qoymaq, – bunu həmçinin təşəhhüddə də etməlidir, lakin bu halda sağ əlin çeçələ və adsız barmaqlarını bükür, böyük barmaq ilə orta barmağı halqa şəklinə salır və Allahı zikr etdikdə şəhadət barmağı ilə işarə edir - salamlar zamanı sağa və sola çevrilmək, bununla namazdan çıxmağı niyyət etmək və sola sağdan daha çox çevrilmək[264].

---

[258] “Neylul-Məərib” kitabında (1/142) əlavə edilir: “İhram təkbirini səslə demək, Quranı tərtil ilə oxumaq, namazı yığcam qılmaq, birinci rükəti uzatmaq və ikincini qısaltmaq..”

[259] Yəni, arada paltar kimi səddin olmaması sünnətdir.

[260] Şeyx əd-Duməni haşiyəsində (səh: 373) deyir: “Bu, bu müstəhəb əməl ilə öz yanındakına əziyyət vermədiyi təqdirdə keçərlidir, yoxsa o zaman bunu tərk etmək vacib olur, çünki bunu etməklə haram olan əziyyət hasil olur.”

[261] Neylul məarib:1/144, kitabında əlavə etmişdir: Barmağların qibləyə tərəf yönəlik olması.

[262] Sol ayağının üzərində oturur və sağ ayağını isə pəncəsi üstündə dik tutur.

[263] Təvarruk oturuşunda sol ayağını sağ ayağın altında keçirib kənara çıxarırsan, sağ ayağı isə pəncəsi üstündə dik tutursan. Hər iki ayağın barmaqları qibləyə tərəf baxır.

[264] Qadının namazı kişinin namazı kimidir, hətta əlləri qaldırmaq da. Lakin qadın namazını yığcam şəkildə qılmalıdır, yəni kişi üzvlərini araladığı yerlərdə qadın onları yaxınlaşdırmalıdır. Həmçinin təvərruk oturuşunda sağ ayağını dikəltməz, yerə uzadar. Məhrəmi olmayan kişi onu eşidəcəyi təqdirdə, qadın vacib olaraq səssiz oxuyar.

## Namazda məkruh olanlar haqqında fəsil

Namaz qılana fatihə surəsi ilə kifayətlənmək, onu təkrarlamaq[265], ehtiyac olmadan çevrilmək[266], gözləri qapamaq[267], (üzərində namazdan) yayındıran bir şey daşımaq, səcdədə dirsəkləri (yerə) uzatmaq, əbəs hərəkətlər etmək, əlləri çanağın üstünə qoymaq, gərnəşmək, ağızı açmaq, ağıza bir şey qoymaq, surətə, insan üzünə[268], söhbət edən bir kimsəyə, yatan kəsə, atəşə, (namazdan) yayındıran bir şeyə tərəf yönəlmək, üzrsüz olaraq xırda daşlara əl vurmaq, torpağı hamarlamaq, yelpik ilə sərinlənmək, barmaqları şaqqıldatmaq və onları bir-birinə keçirmək, saqqalı sığallamaq,

---

[265] əl-Ləbədi haşiyəsində (səh: 61-62) deyir: "Lakin burada tez-tez baş verən bir məsələ vardır və bu, bəzən imamın səhvən səsli namazda fatihəni səssiz oxuması, sonra onu xatırlayıb dərhal yenidən fatihəni səsli oxumağa başlaması halıdır; bu, məkruhdurmu? Mənə (bu məsələdə) görünən bunun məkruh olmamasıdır. Bunu dəfələrlə belə edirdim və sonra "əl-Furu" kitabında bu sözləri oxudum: "Əbu Davud (İmam Əhmədin belə dediyini) nəql edib: "Səsli oxunan yerdə fatihəni qurtarana qədər səssiz oxuyarsa, sonra xatırlayarsa qoy fatihəni yenindən səslə oxumağa başlasın və bunun üçün (səhv) səcdəsi etsin." əl-Ləbədi'nin sözləri burada bitir. İmam Əhməd'dən gələn nəql bunun vacib olması yox, müstəhəb olması mənasında anlaşılmalıdır. Lakin əgər səsli namazda fatihənin yarısını səssiz oxuduqdan sonra xayırlayarsa, o zaman nə etməlidir? Bu barədə əl-Mərdəvi "əl-İnsaf" kitabında (2/57) deyir: "Əgər səsli namazda səsli oxumağı unudarsa və səssiz oxuyarsa, sonra xatırlayarsa məzhəbin səhih görüşünə görə səssiz oxuyaraq qaldığı yerdən səsli oxuyaraq davam etməlidir."

[266] İbn Əbi Təğləb "Neylul-Məərib"də (1/146) deyir: "Məkruh olan və namazı batil etməyən çevrilmə ilə qəsd olunan, bütövlüklə dönmədən, qibləyə arxanı çevirmədən edilən çevirmədir." əl-Ləbədi haşiyəsində (səh: 62) deyir: "Yəni əgər üzü, boynu və sinəsi dönərsə (məkruh olar), lakin nə qədər çox dönərsə o qədər məkruh olar. Lakin əgər tamamilə qiblədən yayınarsa kitabı şərh edənin də qeyd etdiyi kimi namazı batil olar."

[267] Lakin əgər haram bir şeyi görəcəyindən qorxarsa, gözlərini bağlayar. Həmçinin zövcəsi kimi özünə halal olanı lüt görərsə, və bunun səbəbiylə namazda xuşu içində qala bilməzsə, gözlərini bağlayar.

[268] əl-Ləbədi haşiyəsində (səh: 62) deyir: "Bunun kimi qarşısında namaz qılan qadına tərəf namaz qılmaq da məkruhdur."

paltarı yığmaq[269]; bunlar[270] örfdə çox sayılacaq qədər edildikdə isə (namaz) batil olur.

Həmçinin üzərinə səcdə etdiyi bir şeyi alını üçün xüsusiləşdirmək[271], alnından səcdənin izlərini silmək və ehtiyac olmadan söykənmək; əgər söykəndiyi şey götürüldükdə yıxılacaq şəkildə söykənibsə[272] namazı batil olar.

Həmçinin asqırdıqda və ya sevindirici bir şey gördükdə həmd etmək və kədərli bir anda istirca`[273] etmək.

## Namazı batil edən şeylər haqqında fəsil

**(Namazı) batil edir**: təhərəti batil edən şeylər, qəsdən övrəti açmaq; ancaq əgər külək kimi bir səbəbə görə açıldıqda onu dərhal örtərsə (batil) olmaz və həmçinin açılan miqdar baxanın gözündə çox görünməzsə (batil) olmaz[274], qibləyə yönəlmək şərt olduğu yerdə ona

---

[269] Həmçinin uzun saçı olanların saçlarının yerə dəyməməsi üçün saçlarını toplaması da paltarı toplamaq kimi məkruhdur.

[270] Yəni xırda daşlara ul vurmaq, torpağı hamarlamaq, yelpik ilə sərinlənmək, barmaqları şaqqıldatmaq, onları bir-birinə keçirmək, saqqalı sığallamaq, paltarı yığmaq.

[271] ət-Təğləbi deyir: "...çünki bu, rafizilərin şüarlarındandır." əl-Ləbədi deyir: "əl-Muntəhə'nin nəvəsi dedi: "Buna əsasən əgər alnına əlləri və burnu şərik olarsa məkruh olmaz..." Yəni yalnız alnını yox, lakin alnını, burnunu və əllərini qoymaq üçün bir şeyi xüsusiləşdirərsə məkruh olmaz, çünki bu, rafizilərin şüarlarından deyildir. əl-Muntəhə'nin nəvəsi isə məşhur alim Osman bin Əhməd'dir. Məşhur hənbəli alimi, "əl-Muntəhə" kitabının sahibi Muhamməd əl-Fətuhi'nin nəvəsidir.

[272] Namaz qılan iki cür söykənə bilər; birinci: bir şeyə elə söykənir ki, söykəndiyi şeyi çəkdikdə yıxılmır, ikinci: elə söylənir ki, söykəndiyi şeyi çəkdikdə yıxılır. Birinci hal məkruhdur, ikinci hal isə namazı batil edir, çünki "qiyəm", yəni ayaq üstə durmaq fərz namazının rükunlarından biridir.

[273] İstirca` : "innə lilləhi va innə ileyhi raciun" sözlərini deməkdir.

[274] Beləliklə namazda övrətin açılması ilə bağlı burada birdən çox hal ola bilər: birinci: əgər özü qəsdən açarsa açılan miqdarın az və ya çox olmasından, dərhal bağlayıb bağlamamasından asılı olmayaraq namaz batil olur. Ikinci: əgər külək və ya buna bənzər səbəblər ilə açılarsa və dərhal örtərsə, açılan miqdar böyük olsa da namaz batil olmaz, lakin dərhal örtməzsə və açılan miqdar başqalarının nəzərində çox sayılarsa namazı batil olar. Üçüncü: yenə külək və bənzəri

arxanı çevirmək, nəcasətin ona toxunması; lakin onu dərhal kənarlaşdırması istisnadır[275], zərurət olmadan[276] adətdə çox sayılacaq qədər namaza aid olmayan hərəkətlər etmək[277], üzr olmadan (bir şeyə) möhkəm söykənmək, qiraətə başladıqdan sonra təşəhhüdü etmədiyini bilərək və xatırlayaraq ona dönmək[278], qəsdən əməli bir rükun əlavə etmək[279], qəsdən rükunlardan bəzisini digərlərindən önə keçirmək, namazı bitirmədən öncə qəsdən salam vermək, qəsdən qiraətin mənasını dəyişmək[280], çılpaq olduğu halda uzaqda yerləşən örtüyün mövcud olması[281], niyyəti ləğv etmək,

---

səbəblər ilə açılarsa və açılan miqdar başqalarının nəzərində az olarsa, dərhal örtməsə belə namazı səhihdir, batil olmaz.

[275] Bu, quru nəcasətdə mümkündür.

[276] ət-Təğləbi zərurət olan hallara misal olaraq düşməndən, seldən və ya yırtıcı heyvandan qaçmaq və ya qorxmağı zikr edir. əl-Ləbədi deyir: "Zərurətə dözülməz qaşınması olan da daxilir, necə ki, bunu İbnul-Cəvzi zikr edib."

[277] Namaza aid olmayan fellərə isə ruku, səcdə, oturmaq və durmaq olmayan digər əməlləri misal verə bilərik: geyinmək, soyunmaq, əlləri oynatmaq, qaşınmaq, sağa-sola dönmək və s. Bu cür fellərin namazı batil etməsi üçün iki şərt gərəklidir: felin ardıcıl edilməsi və örfdə çox sayılacaq qədər edilməsi. Bu zaman cahil olsa və ya səhvən etsə belə namazı batil olar. Əgər çox edərsə, lakin yarısını namazın əvvəlində, yarısını isə namazın sonunda edərsə və bunlar ayrı ayrılıqda deyil, yalnız bir yerdə hesablananda çox hesab olunur, namaz batil olmaz. Lakin bunu ehtiyac olmadan etmək etmək məkruhdur.

[278] Lakin cahil olduğu üçün və ya unudaraq dönərsə namazı batil olmaz. Əgər qayıtdıqdan sonra təşəhhüddə olarkən bunun haram olduğunu bilərsə və ya xatırlayarsa dərhal ayağa qalxmalı və təşəhhüdü tamamlamamalıdır. İmamın arxasında namaz qılanlar isə əgər imamın birinci təşəhhüdü demədən qalxdığını görsələr "subhənallah" deməlidirlər, bunu imam ayağa durub tam dikəlmədən əvvəl edərlərsə, lakin imam qayıtmazsa, o zaman özləri təşəhhüdü dedikdən sonra qalxım imama qoşulmalıdırlar. İmam tam dikəldikdən sonra edərlərsə və imam qayıtmazsa, təşəhhüdü tərk edib ona tabe olarlar. Həmçinin əlavə olaraq qeyd edək ki, əgər bir rükətdəki rükunlardan birini unudarsa və ondan sonrakı rükətin qiraətinə başlayıbsa, əvvəlki rükət hesaba alınmır və geri qayıdıb həmin rükəti düzəltmək olmaz. Lakin əgər qayıdarsa rükət artıq batil olduğu üçün həmin rükətdən ötürdüyü əməlləri yenidən etməsi hesaba alınmayacaq. Digər rükətin qirayətinə başlamaqdan əvvəl xatırlasa isə, unutduğu rükna qayıdar və oradan namazına davam edər.

[279] Əməli ruknlara ruku, səcdə, oturmaq və qiyam aiddir, beləliklə bunlardan birini bilərək əlavə edənin namazı dərhal batil olar.

[280] "Misal olaraq "ihdinə" sözündə həmzəni fəthəli oxumaq, "ən`amtə" sözündə "tə" hərfini damməli oxumaq, "iyyəkə" sözündə "kəf" hərfini kəsrəli oxumaq." ("Neylul məarib", 1/150)

[281] Çünki örtünmək üçün bir şey olduğu halda çılpaq namaz qılmaq caiz olmur və örtünmək vacib olur. Uzaqda olan örtünü əldə etmək üçün ora qədər yürümək lazımdır və namazda çox hərəkət etmək namazı batil edir. Yaxında olduğu halda

niyyətin ləğv edilib edilməməsində tərəddüdün olması, onu ləğv etməyə əzm etmək, niyyətdə şəkk etdikdən sonra həmin şəkk əsnasında bir əməl etməsi[282], dünya şəhvətlərini istəyərək dua etmək[283], Allah və elçisi Əhməd'dən qeyrisinə "əl-kəf" xitab ədatı ilə müraciət etmək [284], qəhqəhə ilə gülmək, səhvən olsa belə danışmaq[285], məmumun imamdan önə keçməsi[286], imamın namazının batil olması, imamdan öncə qəsdən və ya səhvən salam verib onu yenidən təkrarlamamaq[287], unutmuş və cahil biri üçün örfdə az sayılacaq miqdarı istisna olmaqla yemək və içmək; əgər insan (qəsdən) dişlərinin arasında olanı çeynəmədən udarsa namazı batil olmaz.[288]

---

isə, əgər çox əməl etmədən bu örtünü geyinə bilirsə, bunu etməli və namazına davam etməlidir.

[282] Məlumdur ki, namazda davamlı niyyət üzərində olmaq şərtdir və əgər namazda olarkən niyyət edib etməməsində şəkk edərsə bu, namazı batil etmir, yəni şəkkin özü namazı batil etmir. Əgər şəkk edərsə və niyyət edib etməməsini xatırlamazsa o zaman namazı yenidən başlamalıdır. Lakin əgər şəkdə olduğu zaman namazın feli və ya qövlü əməllərindən bir şey edərsə, namazı batil olar.

[283] İbn Bədran deyir: "Yəni dünyaya xas bir şey istəmək; misal üçün belə demək: "Allahım, mənə geniş bir ev ver və bostanlar, bağlar ver!" Lakin "Allahım, mənə xeyir üçün sərf etməyə var-dövlət ver!" deyərsə və ya "qonaq qəbul etmək üçün geniş ev ver!" deyərsə batil olmaz."

[284] Yəni namazda ərəb dilində deyilən sözlərdə Allah və peyğəmbərinə - salləllahu aleyhi va səlləm – "sən" deyərək xitab etmək olar, lakin digərlərinə "sən" və ya "siz" deyərək xitab etmək namazda danışmaq kimi sayıldığı üçün namazı batil edir. əl-Ləbədi burada deyir: "Yəni salamlardan başqa halda." Belə ki, salamlarda "əssələmu aleykum va rahmətullah" sözləri Allah və elçisindən başqalarına xitabdır və istisna edilmişdir.

[285] Hətta vacib bir danışma olsa belə namazı batil olur. Misal üçün təhlükədə olan bir insanı xilas etmək üçün danışmaq vacibdir və namazda olarkən danışması vacib olsa da danışmaqla namazı batil olur. Həmçinin danışılmağa məcbur edildikdə də danışmaq namazı batil edir.

[286] Məmum ya imam ilə bir bərabərdə, ya da ondan arxada durmalıdır. Qabağı keçərsə namazı batil olar. Bu zaman etibara alınan ayağın barmaqları deyil, lakin ayağın daban hissəsidir. Əgər məmum imamdan boyda hündür olduğu üçün səcdə edərkən başı ondan önə çıxarsa bunda heç bir problem yoxdur, əsas olan ayaqlarının önə keçməməsidir. Bunu ət-Təğləbi şərhində zikr edir. Oturduğu halda isə etibar insanın yanlarına görədir.

[287] Əgər qəsdən imamdan öncə salam verərsə namazı batil olar, lakin səhvən salam verərsə gözləməli və imamdan sonra verməlidir, əgər imamdan sonra verməzsə namazi batil olar.

[288] Həmçinin nafilə namazında qəsdən azca bir şey içərsə və ya ağızda əriyən bir şeyi udarsa nafilə namazı batil olmaz. Bunu ət-Təğləbi deyir.

Həmçinin ehtiyac olmadan öskürdükdə və ya (Allah) qorxusundan başqa səbəbə görə hönkür-hönkür ağladıqda və ya üfürdükdə iki hərfin eşidilməsi (hökmdə namazda) danışmaq kimidir. (Namazda) yatmaq[289] səbəbi ilə danışdıqda və ya qiraət zamanı dildə xəta etdikdə və ya özünü idarə edə bilmədən öskürdükdə və ya asqırdıqda və ya əsnədikdə və ya ağladıqda (iki hərfin eşidilməsi ilə) namaz batil olmur.

## Səhv səcdəsi bölümü

Əgər səhvən məşru olan bir sözü (namazın) başqa yerində deyərsə[290] (səhv səcdəsi etmək) sünnətdir. Əgər namazın sünnətlərindən birini (səhvən) tərk edərsə (səhv səcdəsi etməsi) mübahdır.[291] Əgər əlavə rüku edərsə və ya əlavə səcdə edərsə və ya əlavə olaraq ayaqda durarsa və ya istirahət oturuşu qədər olsa belə əlavə olaraq oturarsa[292] və ya bitirmədən öncə (səhvən) salam verərsə[293] və ya

---

[289] Namazda yatmaq ya ayaq üstə durarkən, ya da oturarkən mümkündür və bu zaman yuxunun az olması şərtdir. Belə halda nə dəstəmaz, nə də namaz batil olmur. Bu əsnada özündən asılı olmadan danışarsa namazı batil olmaz.
[290] Namazda məşru olan söz ilə namazda deyilən sözləri qəsd edir. Misal üçün səcdədə və ya oturarkən qiraət edərsə və ya ayaq üstə olarkən təşəhhüdün sözlərini deyərsə və ya axırıncı iki rükətdə əlavə surə oxuyarsa səhv səcdəsi etməsi sünnətdir, vacib deyildir. Bunu qəsdən etdiyi təqdirdə isə namazı batil olmaz və səhv səcdəsi edilməz, lakin belə etməsi məkruhdur.
[291] Burada qəsd olunan namazın sözlə deyilən sünnətləridir, yoxsa feli sünnətlərin tərkinə görə səhv səcdəsi etmək məşru deyildir, çünki onsuz da feli sünnətlər o qədər çoxdur ki, onların hamısını etmək çox çətin şeydir və bütün namazlarda hansısa feli sünnət tərk olunur, buna görə də alimlər feli sünnətə görə səhv səcdəsini məşru görməyiblər. Lakin onu da deyiblər ki, əgər səhv səcdəsi edərsə namazı batil olmaz.
[292] Bütün bunları qəsdən edərsə namazı batil olar. Lakin səhvən edərsə axırda səhv səcdəsi etmək vacibdir.
[293] Şeyx əl-Ləbədi haşiyəsində (səh: 65-66) deyir: "Sonra əgər örfdə az sayılacaq qədər üstündən vaxt keçərsə, hətta qiblədən yayınmış olsa belə, məsciddən çıxmış olsa belə, namazını tamamlamalı və səhv səcdəsi etməli və salamları verməlidir. Əks təqdirdə isə namazını yenidən başlamalıdır, həmçinin (namazı bitirmədən öncə səhvən salam verdikdən sonra) danışarsa və ya dəstəmazını pozarsa belə etməlidir (yəni namazı yenidən qılmalıdır). Əgər səhv etdikdən sonra bu səhv üçün səhv səcdəsinin vacib yoxsa sünnət yoxsa mübah olmasında

namazın sözlərini onların mənasını dəyişdirəcək şəkildə (səhvən) tələffüz edərsə və ya bir vacibi (səhvən) tərk edərsə və ya əlavə (hərəkət) etdiyi zaman bunu əlavə olaraq edib etməməsində şəkk edərsə[294] (səhv səcdəsi etməsi) vacibdir.

Vacib olan səhv səcdəsini qəsdən tərk etmək (namazı) batil edir[295], lakin namazı bitirmədən öncə salam vermək ilə vacib olan (səhv səcdəsini)[296] tərk etmək batil etmir.[297]

---

və ya mübah olmamasında şəkk edərsə necə? Mənə aydın olan budur ki, buna görə salamdan sonra səcdə etməlidir, əgər məşru bir səcdədirsə deməli yerinə yetirmiş olur, əks halda (yəni məşru bir səcdə deyildisə) namazdan kənarda etmiş olur və bunun namaza zərəri yoxdur."

[294] Misal üçün axırıncı rükətin əlavə rükət olub olmamasında şəkk edərsə və ya səcdə edərkən səcdəsinin artıq bir səcdə olub olmadığında şəkk edərsə, namazın sonunda səhv səcdəsi etmək vacibdir. Bununla bağlı daha bir məsələ vardır; namaz tamamlanmadan öncə şəkk aradan qalxarsa səhv səcdəsi etməsi lazımdır ya yox? ət-Təğləbi şərhində (1/154) deyir: "Əgər şəkk aradan qalxarsa və etdiyinin doğru olduğu aydınlaşarsa həmin şəkkə görə səcdə etməməlidir." Şeyx əl-Ləbədi haşiyəsində (səh: 66) onun bu sözləri haqqında deyir: "Bu, (əl-Mərdəvi'nin) "əl-İnsaf" kitabında səhih saydığı görüşdür və (əl-Haccəvi) "əl-İqna" kitabında bu görüşə tabe olub. əl-Fətuhi isə ona "əl-Muntəhə" kitabının şərhində müxalif olmuşdur."

[295] Səhv səcdəsini səhvən tərk etməyə görə səcdə etmək məşru deyildir.

[296] Məzhəbin görüşünə görə namazdakı bütün xətalar üçün salamlardan öncə səhv səcdəsi edilir, yalnız namazı tamamlamadan önvə səhvən salam verdikdə səhv səcdəsi salamdan sonra etməlidir. Bu müstəhəb olan sifətdir, lakin istəsə istənilən səhv səcdəsini salamdan əvvəl və ya sonra edə bilər.

[297] Çünki salamdan sonra olan səhv səcdəsi namazdan kənardadır və onu tərk etmək namazı batil etmir, necə ki, azan vermək vacib olduğu halda onu tərk etmək namazı batil etmir. Lakin tərk edən günah qazanır. Lakin burada bir başqa qeydə yer vermək lazımdır. Səhv səcdəsini həm salamdan öncə, həm də əvvəl vermək olar, lakin salamdan əvvəl vermək əfzəldir və burada bir hal istisnadır, o da namazı tamamlamadan öncə salam vermək halıdır ki, burada səhv səcdəsini salamdan sonra etmək lazımdır. Əgər kimsə edilməsi vacib olan səhv səcdəsini salamdan sonra etməyi niyyət edərsə və sonra qəsdən tərk edərsə namazı batil olar. əl-Ləbədi deyir: "Əgər sən "alimlərin (namazı tamamlamadan öncə salam verən kəsin) səhv səcdəsini qəsdən tərk etməsi halında namazının batil olmayacağını dedikləri halda bunun vacib olduğunu deməklərinin nə mənası var, məgər bu, onu sünnət və ya mübah olan səhv səcdəsi ilə bir etmirmi?" sualını versən deyərik ki, bunun mənası budur ki, onu tərk etməklə günah qazanır, lakin namazı batil etmir, çünki (həmin səhv səcdəsi) namazdan kənardadır, beləliklə bu, kitabı şərh edənin (yəni ət-Təğləbinin) dediyi kimi azan kimidir. Onların bu şəkildə qeydsiz-şərtsiz söyləməklərindən anlaşılan budur ki, salamdan öncə edilən səhv səcdəsini hətta salamdan sonraya saxlasa belə qəsdən tərk etmək namazı batil edir; əgər salamdan sonra etmək niyyəti ilə gecikdirərsə, sonra

Əgər istəsə iki səhv səcdəsini salamdan öncə yaxud sonra edə bilər. Lakin əgər onu salamdan sonra edərsə vacib olaraq təşəhhüd edər[298] və salam verər.

Əgər səhv səcdəsini unudarsa və aradan örfdə uzun sayılacaq qədər bir fasilə keçərsə və ya təharətini pozarsa və ya məsciddən çıxarsa (səhv səcdəsi hökmdən) düşər.[299]

Namazın əvvəlindən imama qoşulan namazında səhv edərsə ona səcdə etmək vacib deyildir[300].

Əgər imamı səhv edərsə səhv səcdəsində onun imama tabe olması lazımdır;[301] lakin əgər onun imamı səcdə etməzsə onun özünə bunu etmək vacib olar.[302]

Kim artıq rükət üçün qalxarsa xatırladığı zaman oturmalıdır[303].

Əgər birinci təşəhhüdü unudaraq ayağa qalxmağa başlayarsa təşəhhüdə geri qayıtması lazımdır; əgər qalxıb tam dikəlibsə (qayıtması) məkruhdur. Məmumun isə ona tabe olması lazımdır.

---

qəsdən tərk edərsə namazı batil olar. Eynilə salamdan sonra edilməsi münasib olan səhv səcdəsini salamdan öncə etməyi niyyət edərsə, onu tərk etmək namazı batil etmir. Alimlərin sözlərinin zahiri budur."

[298] Burada səhv səcdəsini əvvəldən salamlardan sonra etməyi niyyət etmək ilə onu salamlardan əvvəl etməyi niyyəd edib, sonra unutmaq arasında fərq yoxdur. Hər iki halda salamları verdikdən sonra səhv səcdəsini edirsən, sonra namazda axırıncı təşəhhüd kimi bir təşəhhüd edirsən və sonra bir daha salamları verirsən. Bu halda təşəhhüd etməyin vacib olmadığı da deyilmişdir və Şeyxul-İslam İbn Teymiyyə bu görüşə üstünlük verib. Səhv səcdəsi salamlardan əvvəl edildiyi təqdirdə isə təşəhhüdü təkrarlamaq lazım deyil.

[299] Yəni vacib olan səhv səcdəsini etməyi unudarsa və namazdan sonra aradan uzun fasilə keçərsə və ya dəstəmazı pozarsa və ya məsciddən çıxarsa həmin səhc səcdəsi vaciblik hökmünü itirir, namazı isə səhih olaraq qalır.

[300] İmama sonradan qoşulan isə istər imamla qıldığı müddətdə, istərsə də tək qıldığı müddətdə etidiyi səhvlər üçün səhv səcdəsi etməlidir.

[301] İbn Əbi Təğləb şərhdə (1/155) deyir: "Əgər imama iki səhv səcdəsindən ikincisində qoşularsa onunla birlikdə səcdə edər və imam salam verdikdə məmum səhv səcdəsinin ikincisini edər, sonra (imamla qıla bilmədiyi) namazı qəza edər." Qəza ilə ayağa qalxıb namazdan ötürdüyü hissəni qılması qəsd olunur.

[302] Əgər məmum daha sonradan namaza qoşulubsa və əgər imam axırda səhv səcdəsi etməzsə, o zaman ayağa qalxar və namazın qalan hissəsini qəza etdikdən sonra özü səhv səcdəsi edər.

[303] Namazın cinsindən olan əlavə fel edərsə də hökm eynidir - dərhal tərk etməlidir.

Əgər (təşəhhüdü unudub qalxdıqdan sonra) qiraətə başlayarsa artıq geri qayıtmaq olmaz.

Namazda olarkən hər hansı bir rükunda və ya rükətlərin sayında şəkk edərsə yəqinliklə bildiyinin – və bu, ən az olandır - üzərinə əməl edər və səhv səcdəsi edər. Namazın bitməsindən sonra isə şübhənin heç bir təsiri yoxdur.

## Könüllü namaz bölümü

O, cihad və elmdən sonra ən fəzilətli könüllü bədən əməlidir. Onun ən fəzilətlisi camaat şəklində edilməsi sünnət olandır.

Ən çox təkid olunmuşu kusuf, sonra istisqa, sonra təravih, sonra isə vitrdir[304]; (vitrin) ən azı bir rükət[305], ən çoxu on bir rükətdir[306] və kamil şəklinin ən aşağı həddi iki salam ilə üç rükətdir. (Üç rükəti) arada təşəhhüd etmədən bir salam ilə qılmaq caizdir. Vitrin vaxtı işa namazı ilə sübh namazı arasındakı zaman kəsiyidir[307].

Vitr namazında rukudan sonra müstəhəb (bir əməl) olaraq qunut tuta bilər. Təkbir gətirib əlləri qaldırdıqdan sonra rukudən öncə qunut tutmaq caizdir. Qunutda dilədiyi duanı etməsində heç bir problem yoxdur. Varid olan dualardan bəzisi budur: "Allahummə-hdinə fimən hədeytə va ’afinə fimən ’afeytə va təvallənə fimən təvalleytə va bərik lənə fimə ə`ataytə va qınə şərra mə qadeytə innəkə təqdı va lə yuqda aleykə innəhu lə yəzillu mən valeytə va lə

---

304 Vitri davamlı olaraq tərk edənin şəhadəti qəbul olunmaz. Bunu İmam Əhməd deyib.

305 Məzhəbin səhih görüşünə görə vitri bir rükət qılmaq məkruh deyil. Digər rəvayətə görə isə üzrsüz bir rükət qılmaq məkruhdur.

306 On bir rükəti iki-iki qılıb sonda bir rükətlə tamamlamaq ən kamil sifətdir. İstəsə on bir rükəti dalbadal qıla bilər, bu zaman onuncu rükətdən sonra ilk təşəhhüdü edər, on birinci rükətdən sonra isə axırıncı təşəhhüdü edər və salam verər.

307 İşa namazını məğribin vaxtında məğribə birləşdirib qılsa belə ondan sonra vitr namazını qıla bilər. Gecənin son hissəsində dura biləcəyini bilənə vitri bu vaxta qədər gecikdirmək daha əfzəldir, əks halda isə gecənin əvvəlində qılmaq daha yaxşıdır.

yəizzu mən adeytə təbaraktə rabbənə va təaleyt”[308] “Allahummə innə nəuzu biridakə min səxatikə va bi ’afvikə min ’uqubətikə va bikə minkə lə nuhsı sənəən aleykə əntə kəmə əsneytə alə nəfsik”[309]

Daha sonra peyğəmbərə - sallallahu aleyhi və sələm - salavat deyir[310], məmum isə bu an “əmin” deyir[311], sonra burada və namazdan kənarda əllərini üzünə sürtür[312].

Vitrdən başqa namazlarda qunut tutmaq məkruhdur[313].

Ratibə namazlarının ən fəzilətlisi sübhün, daha sonra isə məğribin sünnətidir. Digər sünnətlər isə eynidir.

Təkid olunmuş ratibə namazları ondur: zöhr namazından öncə və sonra iki rükət, məğrib namazından sonra iki rükət, işa namazından sonra iki rükət və sübh namazından öncə iki rükət.

Ratibə namazlarının[314] və vitrin qəzasını qılmaq müstəhəbdir, lakin fərz ilə birlikdə ötürülmüş və sayca çox olanlar müstəsnadır, tərk

---

[308] Əbu Davud:1425.Tirmizi:464.Hədisi Həsən ibn Əli (r.a) rəvayət etmişdir.Hafiz ibn Hacər “ən-nətəic:1/147” kitabında demişdir: Bu, həsən, səhih hədisdir.Orada “va lə yəizzu mən adeytə” sözləri yoxdur. Bu hədisi həmçinin Beyhaqi rəvayət etmişdir.
[309] Əbu Davud:1427.Nəsai:1100.Hədisi Əli ibn Əbu Talib (r.a) rəvayət etmişdir.Hafiz ibn Hacər “ən-nətəic:3/26” kitabında demişdir: Bu, səhih hədisdir.
[310] Zədul mustəqnə`:18 səh, “va əlihi” sözlərini əlavə etmişdir. əl-İqna`da:1/143 demişdir: Bunda heç bir qəbahət yoxdur.
[311] İmamın duasın eşidərsə. Eşitməsə, qunut tutar və özü dua edər.
[312] Yəni, həm burada həmdə istənilən duadan sonra əlləri üzə sürtmək sünnətdir. İmam Əhməd bunu birmənalı olaraq bildirib.
[313] Müsəlmanların başına bir fəlakət gəlməsi halı istisnadır. Bu zaman İmam Ə`zama namazlarda qunut tutmaq müstəhəbdir. Səsli namazlarda onu səsli edər. Ondan başqası üçün isə bunu etmək mübahdır.
[314] əl-Ləbədi haşiyədə: 68 səh, demişdir: "əl-Muntəhənin şərhində demişdir: Onu tərk etmək məkruhdur. Onu dava-miyyətli şəkildə buraxanın adillik vəsfi itir. İmam Əhməd (r.h) onu davamiyyətli şəkildə tərk edən barəsində demişdir: Pis adamdır. O, bununla bu əməlin haram olduğuna işarə edir. Ola bilsin Qadı Əbu Yə`lənin sözü buna qüç qat-maqdadır: Hər kim ratibə sünnələrini davamiyyətli şəkildə tərk edərsə günah qazanar".
Zövcəyə, uşaqa, qula və ücrət ilə işləyənə bu namazları qılmağı qadağan etmək haramdır.

edilməsi daha yaxşıdır[315]. Onların hər birini evdə qılmaq daha fəzilətlidir.

Fərz namazı ilə sünnətinin arasında ayağa durmaq və ya danışmaq yolu ilə bir fasilə vermək müstəhəbdir.

Təravih namazları isə ramazan ayında iyirmi rükət qılınır[316] və qılınma vaxtı işa ilə vitr arasındadır[317].

## Fəsil

Gecə namazı günorta namazından daha fəzilətlidir. Gecənin axır yarısı ilk hissəsindən daha fəzilətlidir[318]. Yatıb durduqdan sonra qılınan gecə namazına təhəccüd deyilir.

Gecə namaza durmaq, namazı iki xəfif rükətlə başlamaq və yatarkən onu niyyət etmək sünnətdir.

Könüllü namazı bir rükət olaraq qılmaq səhihdir.

Üzr olmadan oturaraq namaz qılanın əcri ayaq üstə qılanın əcrinin yarısı qədərdir.

(Könüllü namazlarda) rukü və səcdəni çoxaltmaq qiyamı uzatmaqdan daha əfzəldir.[319]

---

315 Sübh namazının sünnəti istisnadır, onu tərk etməməsi yaxşıdır. Hənbəlilər kitablarında bu cür zikr edirlər. Ola bilər ki, vitrdə bura aiddir, çünki ondan daha müəkkəddir.

316 Məzhəbə görə camaat ilə qılınması daha fəzilətlidir.

317 Burada da işanı məğriblə birləşdirsə, ondan sonra dərhal təravihi qıla bilər. Təravihi işa namazının sünnətindən sonra qılmaq daha yaxşıdır, çünki işa namazının sünnətini gecənin üçdə birindən sonraya gecikdirmək məkruhdur. Həmçinin, istəsə təravihi vitr namazından sonra qıla bilər, lakin vitri gecənin son namazı etmək sünnətdir.

318 Hənbəli məzhəbinə görə gecənin ən fəzilətli vaxtı gecənin yarısından sonra başlayır və gecənin üçdə biri qədər davam edir. Əgər gecə on iki saatdırsa, gecənin yarısından sonrakı dörd saat ən fəzilətli vaxt hesab olunur.

319 əl-Ləbədi haşiyədə:71 səh, demişdir: Həmçinin bunun əksi deyilmişdir. Şeyx Təqiyuddin demişdir: Qiyamın zikri olan qiraətin rukünün və səcdənin zikri olan

Duha namazını ara-sıra qılmaq müstəhəbdir; onun ən azı iki rükət, ən çoxu isə səkkiz rükətdir. Vaxtı isə qadağan olunmuş vaxtın çıxmasından günəşin zenitdə olmasından bir az öncəki vaxta qədərdir. Onun ən əfzəl vaxtı qızmar isti olan vaxtıdır.

Məscidi salamlama namazını, dəstəmaz sünnətini qılmaq və məğrib ilə işa arasında namaz qılmaq sünnətdir; məğrib ilə işa arasında qılınan namaz gecə namazlarından sayılır.

## Fəsil

Quranı oxuyan və dinləyən üçün qısa aranın olması ilə tilavət səcdəsi etmək sünnətdir[320]. Bu, etibara alınan şərtlər baxımından nafilə namazı kimidir[321].

İhram təkbiri etmədən, səcdə etdikdə və (səcdədən) qalxıqda bir təkbir gətirir və (səcdədən qalxdıqdan sonra) oturur və təşəhhüd etmədən salam verir[322].

Əgər məmum öz qiraəti üçün və ya imamından başqasının qiraəti üçün qəsdən səcdə edərsə namazı batil olar.

Məmumun səsli namazda imama [səcdə etdikdə][323] tabe olması lazımdır[324]. Əgər ona tabe olmağı qəsdən tərk edərsə namazı batil olar.

---

təsbih və duadan daha fəzilətli olması məlumdur. O ki, qaldı rukü və səcdənin özünə, onlar qiyamın özündən daha fəzilətlidirlər, bu səbəbdən onlar mötədildir. Dedi: Bu üzdən namaz mötədildir. Əgər insan qiyamı uzadırsa, buna uyğun olaraq bir-birinə yaxın olsun deyə rukü və səcdəni həmçinin uzadır. Bax: əl-İxtiyarat: 65 səh.

[320] Yəni, səcdə ayəsini oxuduqdan və ya dinlədikdən sonra arada örfdə uzun sayılacaq fasilə keçmədən səcdə etmək sünnətdir, uzun fasilə keçərsə səcdənin yeri ötürülmüş hesab olunacaq. Bir neçə səcdə ayəsi eşitsə və ya dinləsə, səcdələrin sayını ayələr qədər çoxaldar.

[321] Yəni, səcdə edən təharətli olmalı, qibləyə yönəlmlidir, nəcasətdən təmiz olmalıdır, və nafilə namazı üçün etibara alınan digər şərtləri də ödəməlidir.

[322] Bu namazdan kənar olan hala aiddir. Namazda isə səcdədən qalxır və oturmadan və salam vermədən namazına davam edir.

Quran oxuyanın dinləyənə imam kimi yararlı olub olmaması etibara alınmalıdır; beləliklə (oxuyan) səcdə etməzsə o da səcdə etməməlidir. (Oxuyanın) önündə və ya sağında boş yer olduğu halda onun solunda səcdə etməməlidir[325]. Habelə kişi, qadının və xonsanın tilavətinə görə səcdə etmir, lakin (doğru oxumağa bacarmayan) savadsızın, (ayağa qalxa bilməyən) qocanın və mumeyyiz uşağın tilavətinə görə səcdə edə bilər.

Nemətlərin təzələnməsi və bəlaların ötüşməsi zamanı şükr səcdəsi etmək müstəhəbdir[326]. Əgər insan bilərək və xatırlayaraq namazda şükr səcdəsi edərsə namazı batil olar. Edilmə şəkli və əhkamlarında (şükr səcdəsi) eynilə tilavət səcdəsi kimidir.

## Qadağan olunmuş vaxtlar haqqında fəsil

Bunlar aşağıdaki vaxtlardır:

---

323 Bu hissə kitabın əslində yoxdur, lakin ət-Təğləbi'nin "Neylul-Məərib" şərhinin Şeyx Süleyman əl-Əşqar tərəfindən təhqiqində yer almışdır. Məna baxımından da məzmuna uyğundur, çünki bu fəsil tilavət səcdəsi haqqındadır.

324 İmamın qirayətin eşitməsə belə. Səssiz namazda isə imam səcdə etdikdə istəsə ona tabe olar, istəsə isə səcdə etməz.

325 Oxuyanın önündə mütləq olaraq, solunda isə sağı boş olduğu halda səcdə edə bilməz. Bəs arxasında tək səcdə edə bilər mi? Müəllifin əl Ğayə kitabında dediyinə görə, oxuyanın arxasında tək səcdə edə bilməz, və bu hənbəlilərin "tilavət səcdəsi nafilə namazı kimidir" sözlərinə müvafiqdir. Kitabı şərh edən alləmə ər Ruheybəni isə oxuyanın arxasında olan səffin arxasında da tək səcdə edilməyəcəyini vurğulayıb.

326 Səcdə edilən nemət və ya qarşısı alınan bəlanın zahir olması lazımdır. Burada bunun səcdə edənə xas olması ilə bütün müsəlmanları şamil etməsi arasında fərq yoxdur. Mətndən anlaşılan odur ki, nemətin davam etməsi üçün səcdə məşru deyil.

Sübh açılandan günəşin nizə boyda yüksəlməsinə qədər, əsr namazından günəş batana qədər və günəş (zenitdə) durduğu zamandan oradan çəkilənə qədər.[327]

Bu vaxtlarda könüllü namaz qılmaq haramdır və qadağa vaxtının olmasından və (bu vaxtda namaz qılmağın) haram olmasından cahil olsa belə (bu vaxtlarda qılınan namazlar) munəqid deyildir[328]. Lakin sübh namazının sünnətini namazdan öncə, iki rükət tavaf namazını, cəm edildiyi zaman zöhrün sünnətini (əsrdən sonra) və (fərzi qıldıqdan sonra) məsciddə olarkən iqamə verildikdə camaatla yenidən qılmaq istisnadır[329].

Bu vaxtlarda fərzlərin qəzasını, nəzir edilmiş – qadağan olunmuş vaxtda nəzir etmiş olsa belə - namazları qılmaq caizdir.

Əsr namazından sonra (namaz qılma) haramlığı üçün etibara alınan namaza başlamaq deyil, lakin namazın özünü bitirməkdir; beləliklə əgər namaza başlayarsa, sonra onu nafilə namazına çevirərsə[330]

---

[327] Məzhəbin səhih görüşünə görə bu vaxtların sayı beşdir, lakin müəllif – rahiməhullah – bunları üç vaxt içində zikr edib; əgər bu üç vaxtı beş vaxta ayırsaq vaxtları belə qeyd etmək olar: 1) Fəcr girdikdən günəşin çıxmağa başlamasına qədər, 2) günəşin çıxmağa başlamasından insan gözündə nizə boyda yüksələnə qədər, 3) əsr namazından sonra günəş batmağa başlayana qədər, 4) günəş batmağa başlayandan batana qədər və 5) günəş zenitdə durduqdan sonra oranı tərk edənə qədər. Zahirən birinci və ikinci vaxtın bir vaxt, üçüncü və dördüncü vaxtın da ayrı bir vaxt olduğu görünür, lakin bu, belə deyildir. Buna görə də bəzi hənbəli alimləri bunu üç vaxt olaraq qeyd ediblər. Müəllif özü "Ğayətul-Muntəhə" adlı digər kitabında bunun sayının beş olduğunu deyib, ola bilsin ki, burada kitabı müxtəsər etdiyi üçün bu şəkildə üç vaxt olaraq zikr edib. Lakin vaxtların beş vaxt olmasını göstərən incəliklərdən biri budur ki, günəş batmağa başlayandan batana qədərki vaxt həm əsr namazını qılmış kəslərə, həm də qılmamış kəslərə aiddir, lakin ondan əvvəlki vaxt isə yalnız əsri qılmış kəslərə aid olur. Bunu İbnun-Nəccər əl-Fətuhi "Məunətu Ulin-Nuhə" kitabında zikr edir. Həmçinin günəş çıxmaqdan əvvəlki vaxtda sübh namazının ratibəsini ondan qabaq qılmaq caizdir, lakin bu vaxtdan sonra günəş nizə qədər qalxana kimi sübh namazının fərzi qılınar, ratibəsini isə qılmaq caiz deyil.

[328] Namazda olduğu halda qadağan olunmuş vaxt girsə necə? Mənsur əl Buhutinin dediyinə görə bu vaxt namaz səhihdir, lakin namazı davam etməsinə görə günah qazanır.

[329] Lakin əgər iqamə verdikdən sonra məscidə daxil olarsa, namazı iadə etməsi caiz olmaz, və bu halda məscidə girmək özü özlüyündə müstəhəb deyil.

[330] Və ya namazını yarımçıq kəsərsə

(fərzi qılmayana qədər başqa) könüllü namazları qılmaq qadağan olmaz.

Yol üstündə və kiçik hadəs ilə və həmçinin paltarda, bədəndə və ağızda nəcasət ola-ola Quran oxumaq mübahdır. Quranı əzbərləmək fərzu-kifayədir. Namazda vacib olanı əzbərləmək isə hər bir kəsə fərzdir.

## Camaat namazı bölümü

Camaat namazı[331] azad və qadir kişilərin üzərinə hadarda və səfərdə vacibdir[332].

(Camaatın) ən az sayı bir imam və bir məmum ilə - qadın olsa belə - olur.

Fərz namazında isə mumeyyiz uşaq ilə (camaat namazı) münəqid olmur.

Camaat namazının məsciddə qılınması və qadınların kişilərdən ayrılıqda (camaat namazı) qılması sünnətdir[333].

Daimi imamı[334] olan məsciddə bir başqasının imamlıq etməsi haramdır və vaxt darlığı olmadığı müddətcə (başqasının imamlıq

---

331 Beş vaxt əda edilən namaz qəsd olunur.
332 Lakin məzhəbin səhih görüşünə görə şərt deyildir, qəsdən və üzürsüz tərk olunduğu halda haram olsa da, namaz səhihdir.
333 Gözəl qadınlara kişilərlə bir yerdə namaz qılmaq məkruhdur, digərləri üçün isə mübahdır.
334 Ərəb dilində "iməmun ratibun" adlanır və bu barədə Şeyx əl-Ləbədi haşiyəsində (səh: 78) deyir: "yəni imamlıq üçün əhliyyəti olarsa. Burada aşkar göründüyü kimi ondan öncə və ya onunla eyni zamanda qəsd olunur, ondan sonra qəsd olunmur. "əl-İqna" kitabında deyir: "İmamla düşmənçilik edən müstəsna olmaqla..." əl-Ləbədi'nin bura qədər dediklərindən anladığımız budur ki, imam olmağa əhliyyəti olmayan "ratib" imamın, yəni daimi imamın izni şərt deyildir. Misal üçün fasiq biri bir məscidin daimi imamı olsa onun izni şərt olmaz, lakin yenə də məsləhətə görə hərəkət etmək lazımdır. Həmçinin anlayırıq ki, bu, daimi imamdan öncə və ya onunla eyni zamanda başqa bir camaata imamlıq etməyə aiddir, yoxsa daimi imamın qıldırdığı namazdan sonra yeni bir camaat

etməsini) xoş qarşılamadıqda onun izni olmadan (qılınan camaat namazı) səhih deyildir[335].

İmam birinci salamı vermədən öncə (namaza daxil olaraq) təkbir gətirən kəs camaat namazına yetişmiş sayılır.[336]

---

qılmaq üçün imamın izni şərt deyildir. Yenə anlayırıq ki, "əl-İqna" kitabının sahibinə görə daimi imam namazı qıldırdıqda sonra belə ona qarşı düşmənçilik edən birinin əlavə namaz qıldırması haramdır, çünki bu, fitnəyə səbəbdir. Daha sonra əl-Ləbədi deyir: "(ət-Təğləbi'nin) sözündən anlaşılır ki, evin sahibi imamlıq əhliyyətinə sahib olarsa onun izni olmadan evində başqasının imamlığı səhih deyildir, yoxsa bunun sadəcə haram olması qəsd olunmur, xüsusilə də daimi imamı ona qiyas ediblərsə (səhih olmamalıdır) və bu, şeyxlərimizin şeyxi əş-Şeyx Həsən əş-Şəti'nin – rahiməhullah – təhqiq etdiyi kimi belədir." əl-Ləbədi'nin bu sözlərindən anlayırıq ki, imamlıq əhliyyətinə sahib olan birinin izni olmadan onun evində imamlıq etmək səhih deyildir, çünki hənbəli alimləri bu məsələdə daimi imamı ev sahibinə qiyas ediblər. Yenə əhliyyət şərtindən anlayırıq ki, ev sahibi fasiqdirsə onun izni şərt olmur. Daha sonra əl-Ləbədi – rahiməhullah – daimi imamın kim olduğunu izah edərək deyir: "(Həsən əş-Şəti) dedi: "Daimi imam (müsəlman) dövlət başçısının və onun naibinin təyin etdiyi imamdır. Bunu əl-Xalvati deyib."

[335] Daimi imam namazın adətən qılındığı vaxt məscidə gəlməzsə məsafənin uzaq olmaması və məşəqqətin olmaması şərtiylə onun dalınca kimsə göndərilməlidir. Məsafə uzaq olarsa, və ya imamın dalıyca getməkdə məşəqqət varsa, və ya imamın gəlməyəcəyi zənn edilirsə, cammat imam seçib qılar.

[336] Hənbəli məzhəbinə görə namaza sonradan qoşulanın qıldığı rükət onun birinci rükəti deyildir, lakin camaatın qıldığı rükətin sayı onun da rükətinin sayıdır. Əgər camaat ikinci rükətə başlayarsa və o, rükudan öncə qoşularsa onun üçün də ikinci rükət sayılır, qoşularkən istiftəh və təavvuz dualarını etməməlidir. Camaat namazı bitirdikdə o, salamları vermədən ayağa qalxar, istiftəh və təavvuz dualarını söyləyər və namazının birinci rükətini qılar, qılarkən əlavə bir surəni də oxuyar. Əgər camaatın üçüncü rükətində qoşularsa onun üçün də üçüncü rükət sayılır, axırda salamları vermədən qalxar və ötürdüyü birinci rükəti istiftəh və təavvuz duaları ilə başlayar, həm birinci, həm də ikinci rükətində əlavə surə oxuyar. Bunu İbrahim bin Əbi Bəkr əs-Salihi əl-Aufi əz-Zinnəbi "Dəlilut-Talib" kitabına yazdığı "Məsləkur-Rağib li Şərhi Dəlilit-Talib" adlı kitabında deyir.
Təşəhhüdlərə gəldikdə isə, məmum özünə hesab olunan birinci rükətdən sonrakı rükətdə ilk təşəhhüdü, qıldığı son rükətdə isə son təşəhhüdü etməlidir, qıldığı rükətin hökmən hansı olduğundan asılı olmayaraq. Misal olaraq, imama dördüncü rükətin rukusundan əvvəl yetişənə bu rükət hesaba alınacaq və hökmən dördüncü rükəti olacaq. Bu rükət hesaba alındığına görə, məmum imam salam verndən sonra qıldığı rükətin sonunda ilk təşəhhüdünü etməlidir, baxmayaraq ki, bu hökmən birinci rükətdir. Həmçinin qılacağı son rükət hökmən üçüncü rükət olacaq, lakin namazda qıldığı son rükət olduğu üçün burda son təşəhhüdü etməlidir. Lakin irəlidə gələcək ki, əgər məmum ilk təşəhhüdə oturacağı yerdə imamın təşəhhüdə oturacağı yer deyilsə, məmum imama tabe olar və imam onun təşəhhədünü öz üzərinə götürər.

Kim (imam rükudan başını qaldırmadan öncə) şəkk etmədən[337] rükuya yetişərsə rükətə yetişmiş sayılır[338] və bir anlıq hərəkətsiz durmalı, sonra namazına davam etməlidir.

Məmumuna (namazın) harasında imama çatıbsa, orada imama qoşulması sünnətdir[339].

İmama sonradan qoşulan kəs imam ikinci salamı vermədən öncə ayağa qalxarsa və geri qayıtmazsa, namazı nafiləyə çevrilər[340].

Əgər imamı ilə birlikdə qılmaq istədiyi namaz üçün iqamə verilərsə nafilə qılmaq münəqid olmaz[341]. Əgər nafilə namazında olarkən iqamə verilərsə onu yığcam şəkildə tamamlamalıdır[342].

Hər kim (fərz) namazını qıldıqdan sonra camaat namazına iqamə verilərsə onu yenidən (camaatla) qılmaq sünnətdir və birinci qılıdığı namaz fərz sayılır[343].

Məmumun əvəzində imamın öz üzərinə götürdüyü bunlardır: qiraət, səhv səcdəsi[344], tilavət səcdəsi[345], sütrə, qunut duası, həmçinin dörd rükətli namazda ilk rükətə yetişməyən üçün birinci təşəhhüd[346].

---

[337] ət-Təğləbi “Neylul-Məərib”də (1/171) deyir: “Buradan başa düşürük ki, (imam) rükuda olarkən yetişib yetişmədiyində şəkk edərsə, həmin rükət hesaba alınmaz və (axırda) səhv səcdəsi edər.”

[338] İbn Bədran rükətə çatmaq üçün üç şərtin olduğunu deyir: 1) təkbiri ayaq üstə vermək, 2) rükuya gedərkən imamın hələ də rükuda olması, 3) rüku edərkən bunu imamın rükuda olarkən yoxsa rükudan qalxarkən edib etməməsi barədə şəkkə düşməməsi.

[339] Yəni, imama rukudan sonra çatarsa, imamın növbəti rükətə başlamasını gözləməməlidir, əksinə dərhal daxil olması müstəhəbdir.

[340] Burada bunu qəsdən, və ya səhvən, və ya cahil olduğu üçün etdiyi arasında fərq yoxdur.

[341] Qılmaq istədiyi nafilə ratibə sünnəti olsa belə. Həmçinin bu hökm haqda cahil olsada hökm eynidir.

[342] Birinci rükətdədirsə iki rükət olaraq tamamlayar, üçüncü rükətdədirsə dörd rükət olaraq tamamlayar, lakin istəsə namazını bir və ya üç rükətdə edə bilər. Camaat namazından bir rükətin ötəcəyindən qorxsa da belə etməlidir, yalnız əgər camaat namazını tamamilə buraxacağından qorxarsa, namazını kəsər və camaata qoşular.

[343] Məğrib namazı istisnadır, onu iadə etmək müstəhəb deyil. İadə etdiyi namazı ya iadə ya da nafilə olaraq niyyət edir.

[344] İbn Bədran deyir: “Əgər namaza sonradan qoşulan biridirsə (camaat namazı bitdikdən sonra qalxıb) namazın qəza etdiyi hissəsində xəta edərsə imam onun

Məmumun səsli namazlarda istiftah və təavvuz duasını, imamın susduqu yerlərdə[347] fatihə surəsini və şəriətdə göstərilmiş yerlərdə (əlavə) bir surəni oxuması müstəhəbdir. İmamın susması isə fatihədən öncə və sonra[348] və qiraəti tam bitirdikdən sonradır.

(İmamın) səssiz oxuduğu yerlərdə (məmum) istədiyi vaxt oxuya bilər.

## Fəsil

Hər kim imamı ilə bir vaxtda və ya (imam) ihram təkbirini tamamlamadan öncə namaza daxil olarsa namazı münəqid olmaz[349].

Məmumun namazın fellərini imamdan sonra etməyə başlaması daha doğrudur[350]. Əgər bu işləri və ya salamı onunla eyni zamanda edərsə məkruh olar, ondən öncə edərsə haram olar[351].

---

əvəzinə o xətasını öz üzərinə götürmüş sayılmaz." Yuxarıda qeyd etmişik ki, namaza sonradan qoşulan imamla bir yerdə qıldığı vaxta etdiyi səhv üçün də səcdə etməlidir.

[345] Əgər səssiz namazda imam özü tilavət səcdəsi edərsə məmumun imama tabe olmaq seçimi vardır; diləsə tabe olaraq o da səcdə edər, diləsə etməz.

[346] Bu məsələni yuxarıda izah etmişik. Burada məmum təşəhhüdə oturmalı olan yerdə imam təşəhhüdə oturmayacaq və bu halda məmum imamına tabe olmalıdır.

[347] əl-Ləbədi haşiyədə (səh: 81) deyir: "Əgər susmazsa məmumun oxuması məkruh olar. "əl-İqna" kitabında keçdiyi kimi (İmam Əhməd bunu) bir mənalı olaraq bildirib. "əl-Furu" kitabında deyir: "(İmam Əhməddən gələn) hənəfilərə və malikilərə müvafiq olan bir başqa rəvayətə görə (imam) heç bir halda məmumun oxuması üçün susmaz, hətta hənəfilərin sözlərinə görə susması haramdır, çünki oxumadan susmaq haramdır."

[348] İmama Fatihədən sonra məmumların oxuması üçün Fatihə qədər susması müstəhəbdir.

[349] Burdan anlayırıq ki, məmum imam ihram təkbirini bitirəndən sonra öz təkbirini gətirməlidir. Burada bunu qəsdən etmək ilə səhvən və ya cahil olduğu üçün etmək arasında fərq yoxdur.

[350] Qəsd olunan imam başlayandan sonra biraz sonra başlamaqdır, imam feli bitirəndən sonra başlamaq deyil. Bunu Osman ən Nəcdi deyib.

Hər kim qəsdən imamından öncə rukü və ya səcdə edərsə və ya qalxarsa, onu imamla birgə etməsi üçün geri qayıtması lazımdır. Əgər bunu etməkdən (vacibliyini) bildiyi halda qəsdən imtina edərsə namazı batil olar[352]. Unudanın və bilməyənin (namazı) isə batil olmaz.

Məmum (özü namazın) uzanmasına üstünlük vermədiyi müddətcə imamın namazı tam qılmaq ilə birlikdə onu yüngülləşdirməsi[353] və məmuma ağır gəlməyəcəyi təqdirdə namaza daxil olan birini gözləməsi müstəhəbdir.

Bir kimsənin zövcəsi və ya kənizi ondan məscidə getməyə icazə istəyərsə onlara mane olmaq məkruhdur. İstənilən halda qadının evi onun üçün daha xeyirlidir.

## İmamlıq haqqında fəsil

Buna ən layiq qiraəti ən gözəl olan və (namazın) fiqhini ən yaxşı biləndir. Namazın fiqhini bilməyən, lakin Quranı gözəl oxuyan fiqhini bilən, lakin yaxşı oxuya bilməyəndən önə keçirilməlidir. Sonra ən yaşlı, sonra ən şərəfli, sonra ən təqvalı olan irəli keçirilməlidir, sonra püşk atılır.

---

[351] İhram təkbirindən və salamdan savayı namazın digər qövllərində imamdan qabağa keçmək məkruh deyil. Namazın fellərində isə imamdan qabağa keçmək haram, onunla bir yerdə etmək isə məkruhdur.

[352] Bunu qəsdən edənə, və ya səhvən edib sonradan haramlığını xatırlayana imam ona qabağladığı ruknda çatmamış geri qayıdıb imam ilə bu ruknu etməsi vacibdir. Əgər bunu etməzsə namazı batil olar. Lakin ola bilər ki, bunu səhvən edənə geri qayıtmaq mümkün olmasın, misal üçün bunu çox gec xatırlayarsa və imam artıq ona bu ruknda yetişibsə, səhvən etdiyi üçün namazı və rükəti səhih olacaq.

[353] Şeyx ət-Təğləbi "Neylul-Məərib"də (1/175) deyir: "Məmuma edilməsi sünnət olan namazın sünnətlərini etməyə mane olacaq şəkildə imamın (namazı) sürətlə qılması məkruhdur."

Evin sahibi və məscidin imamı – qul olsa belə - daha çox layiqdir. Azad (müsəlman imamlıqda) kölədən daha münasibdir.

Hadarda olan, gözü görən və dəstəmazlı kəslər (imamlıqda bu xüsusiyyətlərdə) özlərinə zidd olanlardan[354] daha münasibdirlər.

(İmam olmağa) daha münasib olanın izni olmadan imamlıq etmək məkruhdur[355].

Başqasının axrasında qılmaq mümkün olmadığı təqdirdə cümə və bayram namazlarından başqa namazlarda fasiqin[356] imamlığı səhih deyildir.

Eyni zamanda kor və kar, xitən etməmiş kimsənin[357], mənanı dəyişdirmədən çoxlu dil xətalarına yol verənin[358] və "tə" hərfini tez-tez təkrar edənin imamlığı məkruh olmaqla yanaşı səhihdir.

Bir şərti və ya bir rükunu yerinə yetirməkdən aciz olanın imamlığı yalnız özü kimilər ilə səhihdir. Lakin xəstəliyinin aradan qalxması ümid edilən daimi məscid imamı müstəsnadır; o, oturaraq qılmalı və

---

[354] Hadarda olanın ziddi musafirdir, gözü görənin ziddi kör, dəstəmazlının ziddi isə təyəmmüm edəndir.

[355] Ev sahibi və məscid imamı istisna, zikr olunduğu kimi onların icazəsi olmadan imamlıq etmək haramdır.

[356] əl-Ləbədi haşiyədə (səh: 83) fasiq haqqında deyir: "o, böyük günah edən və kiçik günah etməyə vərdiş edəndir." Məzhəbin səhih görüşünə görə burada etiqadı və ya əməli ilə fasiq olması, fisqini açıq aydın elan etməsi və ya gizlətməsi, məmumun bunu namazdan əvvəl və ya sonra bilməsi arasında fərq yoxdur, hər bir halda məmumun namazı səhih deyil. Fasiq imamın adil naibinin arxasında namaz isə səhihdir. Başqasının arxasında imkan olmadığı təqdirdə fasiqin arxasında qılınan cümə və bayram namazlarını isə iadə etmək lazım deyildir.

[357] əl-Ləbədi haşiyədə (səh: 83) deyir: "Yəni, əgər xitən olunmağı üzrsüz olaraq tərk etməzsə; əks halda fasiq olar və imamlığı səhih olmaz. Mənə aydın olan budur. Allah daha yaxşı bilir. Daha sonra mən "əl-Ğayə" kitabında belə yazıldığını gördüm: "Xitən olunmamışın imamlığı məkruhdur. "Heç bir üzr olmadan, həddi-buluğa çatdığı halda israr edib xitəni tərk edərsə, fasiq olacağına görə (namazının səhih) olmaması" əsaslı görüşdür. Şeyxlərimizin şeyxi (Həsən əş-Şəti) dedi: "Bu, "əl-İnsaf"da və digər kitablarda aşkar şəkildə ifadə olunmuşdur."

[358] Misal üçün "əl-həmdu" sözündə "dəl" hərfini kəsrəli oxuması, "Lilləhi" sözündə "hə" hərfini fəthəli oxuması, "Rabbi" sözündə "bə" hərfini fəthəli oxuması və sair, çünki ləfzin dəlalət etdiyi məna olduğu kimi qalır və o, Uca Rəbbin kəlamından anlaşılır, lakin bunun belə olması məkruhdur." ("Neylul-Məərib", 1/177)

arxasındakılar da həmçinin otururlar, (lakin) ayaq üstə də səhihdir[359].

Əgər imam, üzərində ixtilaf edilmiş bir rükunu və ya bir şərti təqlid edərək tərk edərsə (namazı) səhih olar. Hər kim onun arxasında onun namazının batil olduğunu etiqad edərək[360] namaz qılarsa namazını yenidən qılmalıdır və ictihad məsələlərində (müxalif) inkar edilməz.

Qadının kişilərə imamlıq etməsi, həmçinin uşağın həddi-buluğa çatmış birinə fərz namazında imamlıq etməsi səhih deyildir; lakin onun (uşağın) nafilə namazında (həddi-büluğa çatmış birinə) və fərz namazında isə öz taylarına imam olması səhihdir.

Təharəti olmayanın və nəcasətə bulaşmış birinin bundan xəbəri varsa imam olması səhih deyildir. Əgər o və məmum namaz bitənə qədər bundan xəbərsiz olarsa yalnız məmumun namazı səhih olar[361].

“Ummi”nin – və o, fatihəni doğru oxuya bilməyən kəsdir - özü kimilərdən başqası üçün imamlıq etməsi səhih deyildir.

Fərz namazında (imamın) arxasında nafilə namazını qılmaq səhihdir, lakin əksi belə deyildir[362].

(Namazlar) adlarında eyni olduqda qəza namazını vaxtında qılınan namazın arxasında qılmaq və həmçinin bunun əksi səhihdir[363].

---

359 Yəni, qiyam ruknundan aciz olan daimi imam. Qeyd edək ki, əgər imam namaz əsnasında bu rukndan aciz olar və oturarsa, məmumların namazı ayaq üstə bitirməsi lazımdır. Lakin əgər namazın əvvəlindən oturubsa, mətndə də zikr olunduğu kimi oturmları daha yaxşıdır, ayaq üstə isə səhihdir.

360 Ola bilər ki, məmum imamın tərk etdiyi ruknun üzərində ixtilaf olduğunu bilmir, əksinə vacibliyində ittifaq olduğuna inanır. Bu zaman məmum namazını iadə etməlidir, hətta sonradan səhv bildiyi aşkar olsa da. Lakin ruknun ixtilaf olunduğunu bilərsə, və imamın namazının səhihliyinə etiqad edərsə, iadə etmək lazım olmaz, hər ikisinin namazı səhihdir.

361 Burdan anlaşılan odur ki, imam və ya məmumlardan biri bunu namaz əsnasında bilsə, hamısı namazı yenidən qılmalıdır.

362 Bayram namazı istisnadır, belədir ki, onu fərz etiqad edənə nafilə etiqad edənin arxsında qılması səhihdir.

363 Həmçinin eyni namazı bir gündən qəza edənin digər gündən qəza edənə imamlıq etməsi səhihdir. Lakin namazların adları eyni olmasa, imam olması səhih deyil, zöhr namazını qılana əsri qılana imam olması səhih deyil.

## Fəsil

İmamın məmumların ortasında durması səhihdir, sünnət isə onlardan qabaqda durmasıdır.

Tək bir nəfər isə onun sağında onunla çiyin-çiyinə durur və (imamın) sağ tərəfi boş olduğu halda onun arxasında və ya solunda durması səhih deyildir. Qadın isə arxasında durur[364].

Əgər tək bir nəfər cərgənin arxasında tək olaraq bir rükət belə qılarsa, namazı batildir[365].

Əgər məmumun imama, onların arasında üç yüz ziradan çox bir məsafə olsa belə uymaq imkanı olarsa, imamı və ya onun arxasındakıları gördüyü təqdirdə (ona uyması) səhihdir.[366] Əgər həm imam, həm də məmum məsciddə olarsa (imamı) görmək şərt deyildir, onun təkbirinin eşidilməsi kifayət edir[367]. Əgər onların

---

[364] Sağında dursa namazı səhih olar.

[365] Rükət ilə qəsd olunan imam rukudan qalxdığı ana qədərdir. İmamla namaza daxil olub, o rukudan qalxana qədər səffə daxil olarsa, və ya imamın yanında durarsa, və ya başqa birisi onun yanına durarsa, namazı səhih olar, əks halda isə səhih olmaz. Bu zikr etdiyimiz rükəti buraxmaqdan qorxmayana aiddir. Lakin dərhal ruku etməsə rükəti buraxacağından qorxana isə ruku edib, imamı səcdə etmədən əvvəl tək durmaq hökmündən xilas olması lazımdır. Göründüyü kimi, bu halda hökm daha xəfifdir.

[366] Buradan anlaşılır ki, məscidin içində yer olmadığı üçün məsciddən kənarda namaz qılmalı olanlar əgər imamı və ya məscidin içində imamın arxasında namaz qılanlardan heç kimsəni heç bir halda görə bilmirlərsə namaz səhih deyildir. Bunu İbn Bədran bu şəkildə izah edərək deyir: “Əgər imam məsciddə, ona uyanlar isə məsciddən xaricdə olarsa imamı və ya məsciddə olan məmumların bir hissəsini bəzi vaxtlarda görməkləri və imamın hərəkətləri barədə xəbərdar olmaqları şərtdir.”

[367] Xülasə olaraq hökm budur ki, həm imam həmdə məmum məsciddə olarsa, təkbirləri eşitməkdən və ya imamı yaxud arxasında olanlardan bəzilərini görməkdən biri kifayətdir. Digər hallarda isə görmək labüddür. Məscid ilə qəsd olunan binanın özü və mövcud olduğu halda onun həyətidir.

arasında, içində gəmilərin üzdüyü bir çay və ya bir yol varsa[368] (belə halda imama uymaq) səhih olmaz.

İmamın məmumdan yüksəkdə olması məkruhdur[369], bunun əksi isə (məkruh) deyildir.

Soğan və ya turp və buna bənzər şeylər yeyənin məscidə gəlməsi məkruhdur[370].

## Fəsil

Xəstə, xəstələnməkdən qorxan, ayaq yolundan ötrü özünü sıxan, itmiş bir malının (tapılacağını) gözləyən və ya malının itməsindən və ya əldən çıxmasından və ya ona zərər gəlməsindən qorxan və ya bostan gözətçisi kimi qoruması üçün ücrət aldığı maldan ötrü qorxan[371] və ya yağış, palçıq, qar, buz və zülmət gecədə soyuq külək səbəbilə və ya imamın (namazı) uzatması səbəbi ilə əziyyət olmasından qorxan kəslər cümə və camaat namazını tərk etməkdə üzrlüdürlər.

---

368 Yuxarıda zikr olunduğu kimi, cümə və bayram namazlarında izdihama görə yollarda qılınan namaz səhihdir.

369 Məmumlardan tək bir nəfər belə imamla eyni səviyyədə və ya ondan yuxarıda olarsa, məkruhluq hökmü aradan qalxar. Həmçinin imamın yüksəkliyi ilə qəsd olunan bir ziradan çox olan yüksəklidir.

370 Bunun zahiri odur ki, məsciddə heç kim olmasa da hökm eynidir. Həmçinin məsciddə deyil başqa yerdə iqamə olunan camaat namazına bu halda gəlmək məkruhdur. Zikr olunanlardan başqa səbəblərə görə də insanlara əziyyət verəcək iyi olan insana da bunar məkruhdur.

371 Lakin qəsdən bu cür işlərdə işləməsi doğru deyildir. Ehtiyacı olduğu və başqa iş tapmadığı, və ya ictimayət üçün labüd olan iş istisnadır.

## Üzr əhlinin namazı bölümü

Xəstə birinin fərz namazını (bir şeyə) söykənmək yolu ilə olsa belə ayaq üstə qılması lazımdır. Əgər bacarmazsa oturmuş halda qılar və əgər (ona da) güc yetirməzsə böyürü üstündə qılar; bu zaman sağ böyür daha əfzəldir. (Namazda) rüku və səcdəni işarə ilə yerinə yetirər və səcdəni daha aşağı əyilərək edər. Əgər bunu etməyə aciz olarsa gözü ilə işarə edər və (edəcəyi) hərəkəti qəlbindən keçirər. Eynilə bu şəkildə dili ilə deməyə aciz olduqda sözləri də (qəlbindən keçirər). Ağlı yerində olduğu müddətcə (xəstə üçün namazın vacibliyi hökmdən ) düşmür.

Namaz əsnasında ayaq üstə durmağa və ya oturmağa qadir olan bunu etməlidir.

Hər kim tək namaz qılarkən ayaq üstə durmağa, camaat namazında isə oturmağa qadir olarsa (camaata gəlib gəlməmək məsələsində) seçim qarşısında buraxılar.

Yağış, palçıq və buna bənzər səbəblərdən əziyyət çəkənin və ya endiyi təqdirdə (başına bir şeyin gələ biləcəyinə görə) canından qorxanın namazını miniyin üzərində qılması səhihdi. Ona (qibləyə) üz tutmaq[372] və bacardığını etmək vacibdir.

Su və palçığın içində olan namazını işarələr ilə qılmalıdır.

## Səfərdə olanın namazı haqqında fəsil

---

[372] Əgər qibləyə yönəlmək mümkündürsə. Mümkün olmadığı təqdirdə fərzlik hökmündən düşər.

Müəyyən bir yerə on altı fərsəxə qədər mübah bir səfər etməyi niyyət edənə[373] yaşadığı yerin yaşayış evlərini keçdikdən sonra dörd rükətli namazı qısaltmaq (onu tam qılmaqdan) daha əfzəldir; (istilik və soyuqluqda) mötədil olan bir zamanda yüklü heyvan sürəti və ölçülü addımlarla (uzunluq və qısalıqda) mötədil olan iki günlük yürüşdür.

Namazı qısaldan, sonra məsafəni tamamlamadan qayıdan kəs namazı yenidən qılmalı deyildir.

Hadarda olarkən (namazın) vaxtı girərsə və ya (namazı) tam qılan birinin arxasında namaz qılarsa və ya namaza başladığı zaman (namazı) qısaltmağı niyyət etməzsə və ya mütləq şəkildə[374], ya da dörd gündən[375] artıq iqamə etməyi niyyət edərsə və ya bir ehtiyacına görə iqamə edərsə və yalnız dörd gündən sonra (ehtiyacının) həll olacağını güman edərsə və ya namaz üçün vaxtın az qalacağı şəkildə üzr olmadan gecikdirərsə, (bütün bu hallarda) səfərdə olanın namazını tam qılması lazımdır.

Əgər dörd gündən artıq qalmaq niyyəti olmadan bir ehtiyacı üçün qalarsa və (onun) nə vaxt həll olacağını bilməzsə və ya haqsız yerə həbs olunarsa, ya da yağışa görə (həmin yerdə ilişib qalarsa) illərlə qalsa belə namazını qısaldaraq qılar.

## Namazları birləşdirmək haqqında fəsil

---

[373] ət-Təğləbi bu sözlərin şərhində (1/185) "Bu, "əl-Muntəhə", "əl-Muharrar" və "ət-Tənqih" əsərlərində işlədilən sözdür və bu söz, "əl-Muqni`" kitabında keçən – "kim səfər edərsə" - sözündən daha münasibdir, çünki ("əl-Muqbi" kitabındakı) bu sözə itənini yaxud qaçmış kölәsini axtarmağa çıxıb məsafəni qət edən də daxildir, halbuki belə birinə namazı qısaltmaq olmaz, çünki o, bunu niyyət etməyib. əl-Həccəvi demişdir: "Əgər "əl-Furu`" və başqa kitablarda gəldiyi kimi "səfər başlayandan" sözünü deyərsə daha yaxşı olardı, çünki o, bəzən səfər niyyəti tutur lakin səfər etmir."

[374] Yəni müəyyən vaxtı niyyət etmədən.

[375] Dörd gün ilə qəsd olunan iyirmi namazdır. Qalacağı yerdə iyirmi namazdan artıq qılacağını niyyət edərsə, namazını qısalda bilməz.

Namazı qısaltmağa imkan verən səfərdə zöhr ilə əsri və işa ilə məğribi onlardan birinin vaxtında birləşdirmək mübahdır[376].

Birləşdirmədikdə məşəqqətlə üzləşəcək muqim olan xəstəyə, nəcasətin çoxluğundan doğan məşəqqət səbəbilə süd verən qadına, hər namaz üçün təharət[377] almaqdan aciz olana və cümə və camaatı buraxmağı icazəli edən bir üzr və ya məşğuliyyət sahibinə (namazları bu şəkildə birləşdirmək) mübahdır.

Məğrib və işa namazlarını – evində qılsa belə - birləşdirməyin caizliyi qara, buza, palçığa, şiddətli və soyuq küləyə, paltarı yaş edən və bununla birlikdə məşəqqətə səbəb olan yağışa xasdır.

Birinci vaxtda birləşdirmək ilə sonrakı vaxtda birləşdirməkdən ən yüngül olanı etmək daha əfzəldir[378].

Əgər namazları birinci vaxtda birləşdirərsə birləşdirmənin səhih olması üçün ilk namaza başlayarkən (birləşdirmək) niyyətini etmək, onların arasında nafilə və bənzəri bir şeylə ara verməmək - əksinə bir iqamə müddəti qədər və yüngül dəstəmaz alma müddəti qədər (ara verə bilər) - , hər iki namaza başlayarkən üzrün olması və ikincisi namazın bitməsinə qədər (həmin üzrün) davam etməsi şərtdir.

Əgər (namazları) ikinci namazın vaxtında birləşdirərsə (bunun) səhih olması üçün ikinci namazın vaxtına birinci namazı qıla biləcək vaxtdan az qalmadan öncə birinci namazın vaxtında birləşdirmək niyyətini etmək[379] və ikinci namazın vaxtı girənə qədər üzrün qalması şərtdir, başqa bir şey şərt deyildir[380].

Birləşdirmənin səhih olması üçün (hər iki namazda) imam və məmumun eyni şəxslər olması şərt deyildir; əgər iki namazı iki ayrı

---

[376] Həccdə Ərəfədə və Muzdəlifədə cəm edən istisna, cəmi tərk etmək daha yaxşıdır.
[377] Dəstəmaz və ya təyəmmüm etməyə.
[378] Eyni olduqda, ikinci vaxta saxlamaq daha yaxşıdır.
[379] Bu şərti izah etməyə çalışaq. Tutalım ki, zöhr namazını qılmaq üçün beş dəqiqəyə ehtiyacımız var. Deməli zöhr namazının vaxtına beş dəqiqədən az vaxt qalana qədər əsrin vaxtında cəm etməyi niyyət etmək şərtdir. Əgər beş dəqiqədən az vaxt qalandan sonra niyyət edərsə, cəm etməsi səhih olmaz.
[380] Müəllifin zikr etməyi bir şərt vardır ki, bu şərt həm birinci həmdə ikinci vaxta birləşdirməyin şərtidir, və bu namazlar arasında mütləq tərtibə riayət etməkdir. Bu şərt nə cahillik nə də səhvə görə hökmdən düşməz.

imamın arxasında qılarsa və yaxud birinci namazı bir məmuma, ikincisini isə bir digər məmuma qıldırarsa və ya namazları birləşdirməmiş birinin arxasında qılarsa və ya birini tək digərini isə camaat ilə qılarsa və ya namazları birləşdirməyən birinə imamlıq edərsə, (bütün bu hallarda namaz) səhihdir.

## Qorxu namazına dair fəsil

Əgər döyüş mübah olarsa həm hadarda, həm də səfərdə qorxu namazını qılmaq səhihdir.

Qorxunun namazın rükətlərinin sayının dəyişməsinə heç bir təsiri yoxdur, lakin qılma şəklinə və bəzi şərtlərinə təsir edir.

Qorxu şiddətləndiyi zaman qibləyə və digər istiqamətə piyada və minik üzərində namaz qılınmalıdır. Mümkün olsa belə (bu halda namazını) qibləyə tərəf yönələrək başlaması vacib deyildir. Hər bir kəs bacardığı qədər işarə ilə namazını qılmalıdır.

Habelə (mübah olduğu halda) düşməndən və ya seldən və ya vəhşi heyvandan və ya atəşdən, ya da zalım borc sahibindən qaçış halında və yaxud Ərəfat dağında duruş vaxtının qaçırılması qorxusu olduğu halda və yaxud öz canına və ya ailəsinə və ya malına görə qorxarsa və yaxud da bunları və başqasının canını qoruyarsa (hökm eynidir).

Əgər kimsə yoldaşlarından geri qaldıqda düşməndən qorxarsa, buna görə qorxu namazı qılarsa və sonra yolun əmin olduğu bəlli olarsa (namazı) yenidən qılmaq lazım deyildir.

Əgər bir kimsə namaz əsnasında qorxu halı və əmin-amanlıq halı ilə üzləşərsə, (həmin hala uyğun namaza) keçər və namazını bunun üzərinə davam edər.

Məsləhət üçün namaz qılana (düşmənə) hücum etmək və (düşmənin hücumundan) geri çəkilmək olar və bunun uzan müddət davam etməsi namazı batil etmir.

Ehtiyac üçün üzərində nəcasət daşıması caizdir və namazı yenidən qılmaq lazım deyildir.

## Cümə namazı bölümü

Üzrü olmayan hər bir müsəlman, mükəlləf, azad kişiyə vacibdir. Habelə namazı qısaltmağa icazə verməyən bir səfərdə olan kəsə və yaşayış məntəqəsindən kənarda yaşayan birinə cümə keçirilən vaxt onlar ilə cümə arasında bir fərsəx və daha az məsafə olarsa (vacibdir).

Namazını qısaltmağa haqqı olan kəsə, köləyə, bir hissəsi azad olan köləyə və qadına cümə vacib deyildir. Onlardan kim cümədə iştirak edərsə onun üçün keçərlidir; lakin nə onlar, nə də həmin yerin əhalisindən olmayanlar (cümənin səhihliyi üçün şərt görülmüş) qırx nəfərdən sayılmaz və onların imamlığı səhih deyildir.

Cümənin səhih olması üçün dörd şey şərt qoşulub:

**Birinci**: vaxt;[381] və bu, bayram namazının ilk vaxtından zöhr namazının son vaxtına qədərdir və (cümə) günəşin zeniti keçməsi ilə vacibləşir, (bu vaxtdan əvvəl yox,) sonra qılınması daha əfzəldir.

**İkinci**: ən azı qırx nəfərin oturaq şəkildə - nə yayda, nə də qışda köç etmədən - məskunlaşdığı yaşayış məntəqəsində - (evləri) qamışdan olsa belə - keçirilməsidir. Binalara yaxın olan səhrada keçirilməsi də səhihdir.

---

[381] əl-Ləbədi haşiyədə (səh: 95) deyir: “Müəllifin digər namazlarda olduğu kimi “vaxtın girməsi” ifadəsini işlətməməsinə səbəb, cümənin vaxtından öncə və sonra səhih olmamasıdır. Digər namazlar isə belə deyildir, vaxtından sonra səhih ola bilərlər.”

**Üçüncü**: qırx nəfərin iştirak etməsi; əgər cüməni tamamlamadan öncə sayları azalarsa yenidən başlayaraq zöhr namazını qılmalıdırlar[382].

**Dördüncü**: (namazdan öncə) iki xütbənin verilməsi.

**İki xütbənin səhih olması şərtinə beş şey aiddir**: vaxt, niyyət, hər ikisinin hadarda baş verməsi, qırx nəfərin iştirakı və cümədə imamlığı səhih olan şəxs tərəfindən olması.

**Bu iki xütbənin rükunları isə altıdır**: Allaha həmd etmək, Allahın elçisinə - sallallahu aleyhi və səlləm - salavat gətirmək, Allahın kitabından bir ayə belə oxumaq, Allahdan qorxmağı tövsiyə etmək[383], xütbələr və onlar ilə namaz arasında uzun bir fasilə verməmək, heç bir əngəl olmadığı təqdirdə mötəbər sayda insanların eşidəcəyi şəkildə səsi ucaltmaq.

**Onun sünnətləri**: təharət, övrətin örtülü olması, nəcasətin kənarlaşdırılması, müsəlmanlar üçün dua etmək, xütbələr ilə namazi bir nəfərin yerinə yetirməsi, xütbələr əsnasında bacardığı qədər səsi ucaltmaq, yüksək bir yerdə ayaq üstə duraraq, qılınca[384] və ya əsaya söykənərək xütbə vermək və xütbələr arasında azca oturmaq; əgər

---

[382] Əgər mötəbər ədəd naqis olduqdan sonra yenidən şərtləri ilə cüməni iqamə edə bilsələr, bunu etməlidirlər, əks halda zöhrü qılarlar.

[383] Şeyxul İslam demişdir: Onun qəlbləri hərəkətə gətirməsi və bununla xeyir işlərə təşviq etməsi gərəkdir.Əgər imam "Allaha itaət edin və günahlardan yan durun" sözləri ilə kifayətlənərsə, onun kifayət edəcəyi görünür.Bunu əl-Mubdi`də demişdir.(Neylul məarib:1/198).

[384] Peyğəmbərin (sallallahu aleyhi va səlləm) qılınca arxalanaraq xütbə verməsi sabit olmamışdır. Ondan sabit olan, yalnız onun yaya yaxud əsaya arxalanması olmuşdur. Bu, Hakəm ibn Hazənin hədisində varid olmuşdur. Əbu Davud bu hədis üçün "sunən" əsərində fəsil açıb onu belə adlandırmışdır: Fəsil: Kişinin yaya arxalanaraq xütbə verməsi. Orada qılınca dair heç bir qeyd yoxdur.
İbnul Qayyim "zədul məad:1/190" əsərində demişdir: Onun qılınca söykənməsi hifz edilməmişdir. Bir çox cahillər düşünürlər ki, o, dinin yalnız qılınc ilə yüksəlməsinə işarə olaraq minbərin üzərində qılınc tutardı. Bu, iki səbəbdən ötrü çirkin bir cahillikdir.
Birinci: Peyğəmbərdən (sallallahu aleyhi va səlləm) sabit olan onun yalnız əsaya və yaya arxalanması olmuşdur.
İkinci: Din yalnız vəhy ilə yüksəlmişdir. Qılınc isə zəlalət və şirk əhlini məhv etmək üçündür. Peyğəmbərin xütbə verdiyi Mədinə şəhəri qılıncla deyil yalnız Quranla fəth olunmuşdur.

oturmaqdan imtina edərsə yaxud xütbənin tamamını oturaraq verərsə ikisi arasında susmaq ilə fasilə verər.

Hər ikisinin də qısa olması, ikincinin isə (birincisindən) daha qısa olması sünnətdir.

Vərəqdən oxuyaraq xütbə verməkdə bir problem yoxdur.

## Fəsil

İmam xütbə verərkən onu eşidəcək qədər yaxın olanlara danışmaq haramdır[385]. (İmam) iki xütbə arasında susduqda və yaxud dua etməyə başladıqda isə danışmaq mübahdır.

Cümənin və bayram namazlarının bir yaşayış məntəqəsinin birdən çox yerində keçirilməsi haramdır, lakin yerin darlığı, uzaq məsafə və fitnə qorxusu kimi (hallarda yaranan) ehtiyaca görə (birdən çox yerdə keçirilməsi) istisnadır. Bundan başqa hallarda isə (keçirilən cümə və bayram namazı yerlərinin) sayı çox olarsa ilk başlayan yer səhih sayılır.

Kim cümə namazına vaxtında daxil olarsa və imamla (namazın) bir rükətinə yetişərsə (namazını) cümə olaraq tamamlayar[386]. Əgər (bir rükətdən) az hissəsinə çatarsa zöhr niyyəti edər[387].

Ondan sonra sünnət namazı ən az iki rükət, ən çox isə altı rükətdir[388].

---

385 Burada bəzi istisnalar vardır. İmama ehtiyac üçün müraciyət etmək, və ya imamın kiməsə ehtiyac üçün müraciyət etməsi caizdir. Həmçinin məsum birini təhlükədən qorumaq üçün danışmaq vacibdir. Peyğəmbərin adını eşidəndə astaca salavat gətirmək, asqıranda astaca həmd etmək sünnət, salamı qaytarmaq və asqırdığı üçün həmd edənə "yarhamukallah" demək mübahdır. İmamdan onu eşitməyəcək qədər uzaqda olana isə danışmaq haram deyil, lakin susması və zikr, qirayət və ya namaz ilə məşğul olması müstəhəbdir.

386 Yəni, birinci və ya ikinci rükətin rukusuna imamla çatarsa.

387 Zöhrün vaxtı daxil olmaq şərtiylə. Əgər vaxtı daxil olmazsa və ya başdan onu niyyət etməzsə, namazını nafilə olaraq bitirər.

Həmin günün gündüz vaxtı “əl-Kəhf” surəsini oxumaq,[389] həmçinin həmin gün sübh namazının birinci rükətində “əs-Səcdə” surəsini, ikinci rükətində isə “əl-İnsən”[390] surəsini oxumaq sünnətdir, davamlı belə etmək isə məkruhdur[391].

## Bayram namazları bölümü

Bayram namazları **fərzu-kifayə**dir.

**Şərtləri** isə iki xütbə istisna olmaqla cümənin şərtləri kimidir. Səhrada keçirilməsi sünnətdir.

Namaz qılınan yerdən ayrılmadan öncə bayram namazından əvvəl və sonra nafilə namazı qılmaq məkruhdur.

Vaxtı isə duha namazının vaxtıdır.

Əgər bayram olduğunu yalnız günəş zeniti keçdikdən sonra bilsələr, onu gələn gün qəza olaraq qılarlar.

Məmumun erkən gəlməsi və imamın isə namazın vaxtına qədər gecikməsi müstəhəbdir.

Əgər (bayram namazına) bir yol ilə gəlibsə digər biri ilə qayıdar. Cümə də həmçinin belədir.

Bayram namazı iki rükətdir; birinci rükətdə ihram təkbirindən sonra və təavvuzdan öncə altı dəfə təkbir gətirir, ikincidə isə qiraətdən öncə beş dəfə təkbir gətirir və hər təkbir ilə bərabər əlləri qaldırır. Onların arasında “Allahu əkbəru kəbiran val həmdu lilləhi kəsiran va

---

[388] Cümədən qabaq ratibə sünnət yoxdur, lakin dörd rükət qılması müstəhəbdir.
[389] Hakim:2/368. Hədisi Əbu Səid əl-Xudri (r.a) rəvayət etmişdir. Hakim dedi: Bu, səhih isnadlı hədisdir. Buxari və Muslim isə bu hədisi nəql etməyiblər.
[390] Buxari: 891. Muslim: 66,880. Hədisi Əbu Hureyra (r.a) rəvayət etmişdir.
[391] Yəni, bu iki surəni davamlı oxumaq məkruhdur, Kəhf surəsini davamlı oxumaq məkruh deyil.

subhanəllahi bukratən və əsılə va sallallahu alə muhammədin ən-nəbiyyi va əlihi va sələmə təslimə” sözlərini deyir. Sonra istiazə edir və səslə fatihə surəsini oxuyur, sonra birinci rükətdə “əl-A`lə” surəsini, ikinci rükətdə isə “əl-Ğaşıyə” surəsini oxuyur.

Salam verdikdən sonra (imam) iki xütbə verir və bu iki xütbənin əhkamı cümə xütbələri kimidir, lakin (bayram xütbələrindən) birincisini doqquz, ikincini isə yeddi təkbir ilə açmaq müstəhəbdir.

Əgər bayram namazını nafilə namazı şəklində qılsa səhih olar, çünki əlavə təkbirlər, onların arasında deyilən zikr və iki xütbə sünnətdir.

Bayram namazına yetişməyənin günəş zeniti keçdikdən sonra olsa belə onun qəzasını qılması müstəhəbdir.

## Fəsil

Hər iki bayram gününün gecəsindən xütbə qurtarana qədər və hər zül-hiccə ayının (ilk) on günündə səslə mütləq şəkildə təkbir gətirmək və Ərəfə günü sübh namazından başlayaraq təşriq günlərinin ən sonuncu gününün əsr namazına qədər camaatla qıldığı fərz [392] namazlarından sonra muqayyəd təkbirləri gətirmək sünnətdir; yalnız ihramda olan istisnadır və o, qurban bayramı günü zöhr namazından başlayaraq təkbir gətirir[393]. İmam təkbir edərkən üzünü insanlara tərəf tutar[394].

---

[392] Beş vaxt fərz namazlarından başqa namazlar sonrasında muqayyəd təkbir gətirmək sünnət olmaz.

[393] Muqayyəd təkbiri unudarsa və ya qəsdən tərk edərsə, uzun zaman keçmədən və ya dəstəmazı pozulmadan və ya məsciddən çıxmadığı təqdirdə geri qayıdar və təkbir gətirər. İstəsə gedə-gedə təkbir gətirər. Aradan uzun fasilə olarsa, və ya dəstəmazı pozularsa və ya məsciddən çıxarsa, muqayyəd təkbir müstəhəblik hökmündən düşər. İmamı təkbiri unudarsa, onun yadına salar.

[394] Bu təkbirlər həmçinin qadınlara da sünnətdir, lakin kişilərdən fərqli olraq onlar səslərini qaldırmazlar.

Onun cüt şəklində deyilişi belədir: “Allahu əkbər, Allahu əkbər, lə iləhə illəllah, vallahu əkbər, Allahu əkbər va lilləhil həmd”[395].

Başqasına “təqabbələllahu minnə va minkə”[396] sözlərini deməsində heç bir problem yoxdur.

## Kusuf namazı bölümü

Bu namaz[397], xütbəsi olmayan bir sünnətdir və vaxtı, kusufun başlamasından yox olmasına qədərdir və ötürüldükdə qəzası qılınmır.

Kusuf namazı iki rükətdir; birinci rükətdə səslə fatihə və uzun bir surə oxuyur, sonra uzun bir rüku edir, sonra (rükudan) qalxır təsmi’ edir, təhmid edir və səcdə etmir, əvəzində fatihəni və uzun bir surə oxuyur. Sonra rüku edir, sonra (rükudan) qalxır, sonra iki uzun səcdə edir. Sonra birinci kimi ikinci rükəti də qılır, sonra təşəhhüd edir və salam verir.

Hər rükətdə üç və ya dörd və yaxud beş rüku edərsə, bunda heç bir qəbahət olmaz.[398]

Birinci rükudan sonraki rükular sünnətdir və onlara yetişən rükətə catmış sayılmır. Onu nafilə namazı kimi qılmaq da səhihdir.[399]

---

[395] Əgər namaz qılanın boynunda səhv səcdəsi olarsa və onu salamdan sonra saxlayıbsa, namazdan sonra ilk olaraq səhv səcdəsini edər. Bundan sonra təkbir gətirər və ardınca namazın zikrlərini edər.

[396] Mənası: Allah bizdən və səndən qəbul etsin!

[397] Kusuf, günəş və ya ayın tutulmasına deyilir. Bu baxımdan “kusuf” ilə “xusuf” sözləri sinonimdir, lakin bəzi alimlər “kusuf” sözünü günəş tutulması üçün, “xusuf” sözünü isə ay tutulması üçün istifadə ediblər.

[398] Hər rükətdə beşə qədər rüku edə bilər, lakin bundan artıq etmək olmaz və həmçinin iki səcdədən artıq etmək olmaz.

## İstisqa namazı bölümü

Bu namaz sünnətdir və onun vaxtı, qılınma tərzi və əhkamı bayram namazında olduğu kimidir.

Əgər imam onu qılmaq üçün çıxmaq istəyərsə insanlara moizə etməli, onları tövbə etməyə və haqsızlıqlardan əl çəkməyə çağırmalıdır. Həmçinin onun üçün təmizlənməlidir[400], ətirlənməməlidir. (İmam) təvazökar, müti, zəlil və yalvarış halında,[401] ətrafında din, təqva əhli və şeyxlər ilə birlikdə çıxmalıdır. Habelə uşaqların, qocaların və heyvanların[402] çıxması və salehlər ilə təvəssül etmək[403] mübahdır.

(İmam) namazı qılır, sonra bir xütbə verir və onu bayram xütbəsində olduğu kimi təkbirlə açır, orada çoxlu bağışlanma diləyir, bunu əmr edən ayələri oxuyur və əllərinin üst hissəsini səmaya tərəf tutaraq onları qaldırır və bunun üzərinə peyğəmbərin – salləllahu aleyhi va səlləm – duası ilə dua edir[404] və məmumlar "əmin" deyirlər.

---

[399] Kusufdan başqa təbii hadisələr üçün namaz qılınmaz, yəni şimşək çaxarkən və buna bənzər hallarda kusuf namazı kimi namaz qılınmaz, yalnız davamlı zəlzələ istisna edilmişdir.

[400] Yəni pis qoxulardan təmizlənər, dırnaqlarını tutar ki, insanlara əziyyət etməsin.

[401] əl-Ləbədi haşiyəsində (səh: 100) deyir: "Təvazökar, yəni bədəni ilə, müti, yəni qəlbi ilə, zəlil, yəni paltarı ilə, yalvararaq, yəni dili ilə və bunu İbn Nəsrilləh demişdir."

[402] İbn Qudəmə "əl-Muğni" kitabında (3/335) deyir: "Heyvanları çıxarmaq müstəhəb deyildir, çünki peyğəmbər - sallallahu aleyhi va səlləm - bunu etməmişdir."

[403] Onları önə çəkməklə, onlar dua edər insanlar isə onların dualarına "əmin" deyərlər, beləki, Ömər Abbas ilə, Muaviyə isə Yəzid ibn əl-Əsvəd əl-Curaşı ilə məhz bu cür etmişdilər. Həmçinin başqa bir yerdə Dahhak ibn Qeys yağış istəməkdə onunla bu cür təvəssül etmişdir. ("Mənərus-Səbil", səh: 159)

[404] ət-Təğləbi o duanın belə olduğunu deyir: "Allahummə, əsqinə ğeysən muğisən həniən məriən ğadəqan mucəllilən səhhan aamən tabəqan dəimən. Allahummə-sqinəl-ğaysə va lə təc'alnə minəl-qanitin. Allahummə suqyə rahmətin va lə suqyə azəbin va lə bələin va lə hədmin va lə ğaraqin. Allahummə, innə bil-ibədi val-

Sonra xütbə əsnasında qibləyə üz tutaraq səssiz şəkildə deyir: “Allahummə innəkə əmərtənə biduaikə va va’adtənə icəbətəkə va qad də’avnəkə kəmə əmərtənə fəstəcib lənə kəmə va’adtənə”. Bunun ardınca əbasının üz tərəfini iç tərəfinə çevirir və sağı sola, solu isə sağa geyinir. Habelə insanlar da belə edirlər və əbanı öz paltarları ilə birlikdə soyunana qədər o şəkildə tərk edirlər.

Əgər yağış yağarsa (Allahın lütfü və nemətindəndir), əks tədirdə bunu ikinci və üçüncü dəfə təkrarlayarlar.

İlk yağışın altında durmaq, onunla dəstəmaz və qüsul almaq və yağışın dəyməsi üçün ev əşyalarını və paltarlarını çıxarmaq müstəhəbdir.

Əgər yağış qorxulacaq şəkildə çoxalarsa bu sözləri demək müstəhəb olar: “Allahummə həvaleynə va lə aleynə, Allahummə aləl-əkəmi vaz-zırabi va butunil-əudiyəti va mənəbitiş şəcər. “Rabbənə va lə tuhammilnə mə lə taqatə lənə bih”[405].

(Yağış göndərildikdə) bu sözləri demək sünnətdir: “Mutırnə bifədlilləhi və rahmətih.”[406] Lakin “mutırnə bi nəui kəzə”[407] demək haramdır, amma “..fi nəui kəzə” demək mübahdır.

---

bilədi minəl-əvai val-cəhdi vad-danki mə lə nəşkuhu illə iyyəkə. Allahummə, ənbit lənəz-zər’a va ədirra lənəd-dar’a va əsqinə min bərakətis-səməi va ənzil aleynə min bərakətik. Allahummə-rfə’ annəl-cəhdə val-cu’a val-uryə vakşif annə minəl-bələ’i mə lə yəkşifuhu əhədun ğayrukə. Allahummə, innə nəstəğfirukə innəkə kuntə ğaffəra, fə ərsilis-səməə aleynə midrara.”

405 əl-Bəqara, 286

406 əl-Buxari (846) və Muslim (71, 135) bunu Zeyd ibn Xalid əl-Cuhani (r.a) vasitəsi ilə rəvayət ediblər.

407 “əl-Furu`” kitabında (2/163) İbn Muflih deyir: “Yağışı Allahdan savayı ulduza bağlamaq icma ilə küfrdür.”

Ölümə hazırlaşmaq[408] və onu çoxlu xatırlamaq müstəhəbdir.

Ölüm ayağında zarımaq və (dinində) fitnəyə düşmək qorxusu olmadığı təqdirdə ölüm arzulamaq məkruhdur.[409]

Xəstə müsəlmanı ziyarət etmək[410], ölüm ayağında ona "lə iləhə illəllah" kəlməsini bir dəfə təlqin etmək, (ölüm ayağında olanın) danışması halı istisna olmaqla birdən artıq təlqin etməmək[411], "Fatihə" və "Yəsin" surələrini oxumaq, yer geniş olduqda onu sağ böyrü üstündə[412] qibləyə tərəf çevirmək, əks halda beli üstündə uzatmaq sünnətdir.[413]

Öldüyü zaman onun gözlərini qapamaq və "bismilləh va alə vafəti rasulilləh"[414] sölərini demək sünnətdir.

---

[408] Ölümə hazırlaşmaq tövbə etmək, insanlarla halallaşmaq və bunlara bənzər işlər ilə hasil olur.

[409] Ölümü arzulamaq, təmənni etmək məkruhdur, lakin iki hal bundan istisna edilmişdir. Dinində fitnəyə düşmək qorxusu olduqda ölümü arzulaya bilər. Həmçinin şəhid olmağı arzulamaq müstəhəbdir.

[410] Bu, rafizilər kimi bidət əhlinə aid deyildir və əl-Ləbədi bu yerdə deyir: "(Bidətçini) ziyarət etmək haramdır." Həmçinin zimmi olan kafiri də ziyarət etmək olmaz.

[411] Bir dəfədən artıq təlqin etməməkdəki hikmət ölüm ayağında olanı yormamaq üçündür. Bunu Muhənnə İmam Əhməddən nəql edib. Lakin hənbəli alimlərinin əksəriyyətinə görə üç dəfə təlqin etmək sünnətdir. Lakin əgər ölüm ayağında olan kəs danışarsa o zaman bir daha təlqin etmək yaxşıdır ki, axırıncı sözü "lə iləhə illəllah" olsun. "əl-Furu" kitabında İbn Muflih "lə iləhə illəllah va Muhammədun rasulullah" sözlərinin təlqin olunmasının da əsaslı olduğunu deyib.

[412] əl-Ləbədi haşiyədə (səh: 103) deyir: "(İmam Əhməddən) həmçinin qeydsiz-şərtsiz beli üstə uzadılması görüşü də gəlib, yəni məkanın geniş və ya dar olması arasında fərq yoxdur. Əksər alimlər buna üstünlük veriblər və əməl bunun üzərindədir."

[413] Bu zaman ayaqları qibləyə tərəf uzadılır və bir qrup alimə görə başı azca qaldırılır ki, üzü qibləyə tərəf baxsın.

[414] Bunu Abdur-Razzəq "əl-Musannəf"də (3/389; rəq: 6051) Bəkr bin Abdilləh əl-Muzəni'dən məvquf olaraq səhih bir isnad ilə rəvayət edib. Ölünün gözlərini yumarkən bu duanın deyilməsi Bəkr bin Abdilləh əl-Muzəni'dən, ölü qəbirə

Kəfənləndikdən sonra olsa belə onu öpməkdə və ona baxmaqda heç bir qəbahət yoxdur[415].

## Fəsil

Ölünü yumaq fərzu-kifayədir.

(Ölünü yumaq üçün istifadə olunacaq) suda tahur və mübah olması, (ölünü) yuyan kəsdə isə müsəlman, ağıl sahibi və mumeyyiz olması şərt görülüb.

Qüsul əhkamlarını bilən etibarlı birinin (bunu etməsi) daha əfzəldir. (Öləni yumaqda) öncəlik (onu yumasını) vəsiyyət etdiyi adil kəsə verilməlidir.[416]

Ölünü yumağa başladığı zaman vacib olaraq övrətini örtməlidir, sonra əlinə əski parçası sarıyır və onunla onu(n nəcasət çıxan yerlərini) təmizləyir. Nəcasətə bulaşmış yerləri yumaq vacibdir. Yeddi yaşına çatmış birinin övrət yerinə[417] toxunmaq haramdır və

---

yerləşdirilərkən isə bu duanın deyilməsi mərfu olaraq Abdullah bin Ömər'dən sabitdir. Bəkr əl-Muzəni isə məşhur tabii alimdir.

[415] Qəsd olunan ona baxması və toxunması mübah olan adamlardır.

[416] Burada vəsiyyət edilənin kişi və ya qadın olması arasında fərq yoxdur; əgər öz həyat yoldaşının onu yumasını vəsiyyət edərsə öncəlik ona verilməlidir. Daha sonra isə öncəlik atanındır və bu şəkildə yuxarıya doğru babaya keçir. Ondan sonra isə aşağıya doğru oğula və oğul nəvələrinə keçir. Qadınlarda isə əgər qadın ərinin onu yumasını vəsiyyət edərsə öncəlik ərinindir, ondan sonra isə öncəlik ana və yuxarıya doğru nənəyə keçir, daha sonra isə aşağıya doğru qızlarına və qız nəvələrinə keçir. Bunların hamısından sonra isə mirasdakı öncəliyə riayət olunur.

[417] On yaşına çatmış oğlanlarda və yeddi yaşına çatmış qızlarda övrət yeri göbək ilə dizlər arasıdır. On yaşından kiçik olan oğlanların övrəti isə qabaq cinsiyyət orqanı ilə anus dəliyidir.

bədənin digər yerlərinə yalnız əski parçası ilə toxunmaq müstəhəbdir.[418]

Kişi öz zövcəsini, kənizini[419] və yeddi yaşından kiçik qızı yuya bilər. Həmçinin qadın ərini, ağasını və yeddi yaşından kiçik oğlanı yuya bilər[420].

Nəyin vacib, nəyin sünnət olması baxımından ölünü yumağın hökmü cənabət qüslu kimidir, lakin yuyan kəs onun burnuna və ağzına su daxil etmir; sadəcə olaraq nəm bir əski parçası alıb dişlərini və burunun deşiklərini silir[421].

Ölüdən bir şey çıxmadıqda onu bir dəfə yumaq ilə kifayətlənmək məkruhdur və əgər çıxarsa qüslu yeddi dəfəyə qədər təkrar etmək vacibdir.  Əgər bundan sonra da çıxarsa (həmin yer) pambıqla tutulmalıdır. Əgər (çıxan şey) kəsilməzsə saf palçıq ilə (həmin yer) tutulmalı, daha sonra həmin yer yuyulmalı və vacib olaraq onu qüsul deyil, sadəcə dəstəmaz aldırmaq lazımdır. Əgər kəfənləndikdən sonra yenə çıxarsa nə dəstəmaz, nə də qüsul yenidən edilməz.

Döyüşdə şəhid düşmüş və haqsızcasına öldürülmüş kimsə yuyulmur[422], kəfənlənmir və onun üçün namaz qılınmır; qanının üzərində qalması və o paltarda dəfn edilməsi vacibdir.[423]

Əgər (yaralandıqdan sonra) daşınılarsa, bunun üzərinə (bir şey) yeyərsə və ya içərsə və ya yatarsa və ya sidiyə çıxarsa və ya danışarsa

---

[418] ət-Təğləbi deyir: "O zaman (ölünü) yuyan kəs iki əski parçası hazırlamalıdır; biri arxa və qabaq övrət yerləri üçün, digəri isə bədənin qalan hissəsi üçündür."

[419] Lakin övrətlərinə baxmaz. Həmçinin qadın da ərini və ya ağasını yusa, övrətinə baxmaz.

[420] Kişi yeddi yaşa dolmuş qızı, qadında yeddi yaşa dolmuş oğlanı yuya bilməz. Əgər kişi qadınlar arasında ölərsə, və qadınlar arasında zövcəsi və ya qul qadını olmazsa, qadınlar onu yumaz, sadəcə təyəmmüm etdirərlər. Kişilər arasında ölən qadının hökmü də belədir. Lakin məhrəm olmayana əks cinsin üzünə və əllərinə bir başa toxunmaq haramdır, ona görə əllərinə əski keçirtmələri lazımdır.

[421] Sonra ölünün sağ tərəfini, sonra isə sol tərəfini yuyur və sonra bütün bədəninin üstünə su tökür və hər tərəfinə yayır.

[422] Əgər nəcasətə bulaşıbsa yuyulur.

[423] əl-Ləbədi haşiyədə (səh: 105) deyir: "Bu ikisinin yuyulmasının haram olmasına işarə edir  və "əl-İqna" kitabında bu görüş üzərində durmuşdur. "əl-Muntəhə" kitabında isə bunun məkruh olduğu deyilib. Müəllif (yəni əl-Kərmi) "əl-Ğayə" kitabında bu görüşə tabe olub, lakin bu sözləri əlavə edib: "Üzərilərində qan olduqda qan təmizlənəcəyi üçün (yumaq) haram olur."

və ya asqırarsa və ya örfdə uzun sayılacaq bir müddət qalarsa və yaxud da cənabət kimi boynunda qüsul vacib olduğu halda öldürülərsə digər adamlar kimidir.[424]

Dörd ayında (ana bətnindən) düşmüş uşaq diri doğulmuş ilə eynidir.

Müsəlman kafiri - zimmi olsa belə - yumur, kəfənləmir, onun üçün namaz qılmır və cənazəsinin arxasınca yürümür və ancaq onu torpağa göməcək kimsə olmadığı halda onu torpağa gömür.

## Fəsil

Ölünü kəfənləmək fərzu-kifayədir.

Vacib olan, ihramda olan kişinin başı və ihramda olan qadının üzü istisna olmaqla dərini vəsf etməyən parça ilə ölünün bütün bədənini örtməkdir və ondan daha ucuzunu vəsiyyət etmədiyi təqdirdə kəfənin onun kimilərin (cəmiyyət içində və bayramlarda) geydiklərindən olması vacibdir.

Sünnət, kişinin pambıqdan olan üç uzun ağ parçada kəfənlənməsidir; parçalar bir birinin üzərinə qoyulur və meyit onun üzərinə beli üstündə uzadılır[425], sonra üstdəki parça sol tərəfdən (bədənin) sağ yarısı üstünə, sonra sağ tərəfi sol yarısının üstünə qatlanır. İkinci və üçüncü parçalar da bu şəkildə edilir. (Sünnət,) qadının pambıqdan olan beş ağ paltarda: izarda, ximarda, qamisdə və iki uzun parçada kəfənlənməsidir. Oğlan uşağı isə bir parçada kəfənlənir, üç parçada kəfənləmək də mübahdır. Balaca qız uşağı isə bir qamis və iki uzun parçada kəfənlənir.

---

[424] Yəni digərləri kimi yuyulur və namazı qılınır. Ona ad vermək müstəhəbdir. Əgər cinsini müəyyən etmək mümkün deyilsə, həm qadında həmdə kişiyə uyğun olan ad seçməlidir.

[425] Bu zaman və ümumiyyətlə hər bir vaxt ölünün övrətini örtmək vacibdir.

Tükdən və yundan hazıranmış, zəfəranla və usfur bitkisi ilə boyanmış parça və naxışlı parça ilə kəfənləmək məkruhdur. Dəri, ipək[426] və qızılı parçada kəfənləmək isə haramdır.

## Fəsil

Ona namaz qılmaq fərzu-kifayədir.

Bu namaz, qadın olsa belə bir mükəlləf(in qılması) ilə digərlərinin üzərindən düşür.

**Onun şərtləri səkkizdir**: niyyət, mükəlləflik, qibləyə yönəlmə, övrət yerinin örtülməsi, nəcasətdən təmiz olmaq, şəhər daxilində olarsa meyitin (cənazə yerində namaz qılanların qarşısında) olması[427], namaz qılanın və ölənin müsəlman olması və hər ikisinin - üzürlü səbəbə görə torpaqla olsa belə - təharətli olması.

**Rükunları yeddidir**: fərz olanında[428] ayaq üstə durmaq, dörd təkbir gətirmək, "Fatihə" surəsini oxumaq, Muhammədə salavat demək, ölü üçün dua etmək, salam vermək və tərtib; lakin duanın üçüncü təkbirdən sonra olması vacib deyildir, onu dördüncüdən sonra da etmək olar.

**(Cənazə namazının qılınma) tərzi**: (ölü kişi olduqda imam onun sinəsi tərəfdə, qadın olduqda isə ortasında durur və) niyyət edir,

---

[426] Başqa bir parça olmadıqda zərurətə görə ipək və qızıl parça ilə kəfənləmək olar.

[427] ət-Təğləbi deyir: "Əgər ölü divarın arxasında olduğu bir halda cənazəsi qılınsa səhih deyildir." əl-Ləbədi haşiyəsində (səh: 107-108) deyir: "(İbn Hamdən) "ər-Riayə" kitabında deyir: "Taxta ilə örtülmüş bir tabutda olana (cənazə qılmaq) səhih deyildir." Mənsur əl-Buhuti isə dedi: "Deyirəm: əksinə səhihdir, üzü üstə çevrilmiş cənazə kimi."

[428] "Fərz olanında ayaq üstə durmaq" ilə qəsd olunan budur ki, eyni cənazə namazı təkrarlanarsa o zaman fərz olan birinci qılınan cənazə namazı olur, digərləri isə fərz olmur və beləliklə də digərlərində ayaq üstə durmaq vacib olmur.

sonra təkbir gətirir və “Fatihə” surəsini oxuyur[429]. Sonra təkbir gətirir və təşəhhüddə olduğu kimi Muhammədə salavat gətirir, sonra təkbir gətirir və ölü üçün, misal olaraq “Allahummə-rhamhu!” (Allahım, ona rəhm et!) kimi dua edir[430]. Sonra təkbir gətirir və bundan sonra qısa müddət durur və salam verir. Onun - “...va rahmətullahi” deməsə belə - bir salam verməsi yetərlidir.[431]

---

[429] Səssiz oxuması müstəhəbdir.

[430] Belə dua etməsi sünnətdir: “Allahummə-ğfir li həyyinə va meyyitinə va şəhidinə va ğaibinə va sağirinə va kəbirinə va zəkərinə va unsənə, innəkə təaləmu mutəqalləbənə va məsvanə va əntə alə kulli şey’in qadir. Allahummə mən əhyəytəhu minnə fəəhyihi aləl-isləmi vas-sunnəti va mən təvaffeytəhu minnə fətəvaffəhu aləl-imən. Allahummə-ğfir ləhu va-rhəmhu va afihi va’fu anhu va əkrim nuzuləhu va vassi’ mudxaləhu bil-mə’i vas-səlci val-bəradi va nəqqih minəz-zunubi val-xatayə kəmə yunəqqas-səubul-əbyadu minəd-dənəsi va əbdilhu dəran xayran min dərihi va zəucən xayran min zəucihi va ədxilhu əl-cənnətə va ə’izhu min azəbil-qabri va azəbin-nəri va-fsəh ləhu fi qabrihi va nəvvir ləhu fihi. Allahummə innəhu ’abdukə va ibnu ’abdikə va ibnu əmətikə, nəzələ bikə va əntə xayru mənzulin bihi va lə nəaləmu illə xayran.”

[431] Burada Şeyx əl-Ləbədi’nin zikr etdiyi bəzi faydaları zikr edək. Cənazə namazında imam dörd təkbirdən əlavə təkbirlər də edə bilər və hamısı birlikdə yeddi təkbir edə bilər, lakin yeddidən artıq etmək olmaz. Əgər imam dörddən artıq təkbir edərsə arxadakılar da imama tabe olmalıdırlar, lakin əgər imamın bidətçi və ya rafizi olduğu güman edilərsə tabe olmaq lazım deyildir. Yeddinci təkbirdən sonra daha bir təkbir edərsə “subhənəllah” deyərək xəta etdiyini xatırlatmaq lazımdır. İmamdan əvvəl salam vermək haramdır, lakin salam verərsə batil olmaz. Dörd təkbirdən sonra arxada namaz qılan namazdan ayrılmağı niyyət edib salam verə bilər. Əgər ölünün bir hissəsi tapılarsa və cənazəsinin qılınmadığı bilinərsə o zaman onu bütöv bir ölü ilə edildiyi kimi yumaq və kəfənləmək lazımdır, cənazəsi qılınar və dəfn olunar, lakin namazı qılınarkən yalnız ölünün həmin hissəsi üçün niyyət edilər. Əgər qalan hissəsi də tapılarsa eyni şey o hissəyə də edilər və yanında basdırılar. Əgər daha əvvəl cənazəsi qılınmış idisə, o zaman tapıldıqdan sonra da cənazəsinin qılınması vacib deyil, lakin sünnətdir. Hamilə qadın qarnındakı uşaq hələ formalaşmadan öncə ölərsə o zaman yalnız hamilə qadına namaz qılınar, əgər formalaşdıqdan sonra ölübsə hər ikisinə də namaz qılınar. Əgər müsəlman kişidən hamilə olan kafir qadın vəfat edərsə, qarnındakı uşaq formalaşıbsa uşağa cənazə qılınar, əks təqdirdə qılınmaz. Əgər üzərinə cənazə qılınması vacib olanlar ilə başqa ölülər qarışarsa, onları ayırmaq mümkün olmazsa hamısı yuyular və kəfənlənər, sonra yalnız cənazəyə haqqı olanlar üçün niyyət edilərək namazları qılınar. Onları əgər ayrı bir yerdə ayrı-ayrı qəbirlərdə basdırmaq mümkündürsə elə etmək münasibdir, əgər mümkün deyilsə o zaman hamısı müsəlman məqbərəsində dəfn olunar. Əgər bir zimmi ölərsə və adil bir müsəlman onun müsəlman kimi öldüyünə şahidlik edərsə onun üçün cənazə qılmaqda bununla hökm olunar, lakin buna əsaslanıb müsəlman qohumuna miras verilməz.

Ölənin dəfn edilməsindən bir aydan bir az çox[432] bir müddət sonra namaz qılmaq icazəlidir, bundan sonra qılmaq isə haram olur.

## Fəsil

Onu daşımaq və dəfn etmək fərzu-kifayədir. Lakin daşıma, dəfn etmə və kəfənləmə kafir tərəfindən edilsə (fərzlik hökmü) düşür.[433]

Bunlara görə və meyiti yumağa görə ücrət almaq məkruhdur.

Ayaqla yürüyənin cənazənin önündə, miniklə gedənin isə[434] onun arxasında olması sünnətdir. Ona yaxın olmaq daha fəzilətlidir. Onun üçün ayağa qalxmaq və zikr və Quran ilə olsa belə onunla birlikdə səsi yüksəltmək məkruhdur.[435]

Qəbrin heç bir hədd olmdan dərin qazılması və genişləndirilməsi müstəhəbdir. Vəhşi heyvanların və qoxunun çıxmasının qarşısını alacaq qədər (dərin və geniş) olarsa kifayət edər.

Qəbirə taxta və atəşdə bişmiş bir şeyi daxil etmək və ölünün altına döşək qoymaq və başının altına yastıq yerləşdirmək məkruhdur.

---

[432] Bir ay və bir-iki gün.

[433] əl-Ləbədi deyir: "Əgər imkan olduğu halda ölü yuyulmadan dəfn edilibsə, (çıxarıldıqda cəsədin) korlanması və ya dəyişməsi qorxusu yoxdursa çıxarılıb yuyulması lazımdır. Qiblədən başqa istiqamətə dəfn edilmiş və ya cənazəsi qılınmadan öncə və ya kəfənlənmədən öncə dəfn edilmiş ölü də bunun kimidir. Amma əgər ipək parça ilə kəfənlənmiş birinin çıxarılmaması daha yaxşıdır. Lakin əgər su olmadığı üçün yuyulmadan basdırılmış birini sonra yumaq mümkün olarsa (çıxarıldıqda cəsədinin) korlanması və ya dəyişməsi riski olmadıqda çıxarılmalıdırmı? Cavab budur ki, bəli, buna görə çıxarılması caizdir. Lakin çıxarılması yoxsa çıxarılmaması yaxşıdır? Alimlərdən kiminsə bunu açıq şəkildə dediyini və ya buna işarə etdiyini görmədim, ola bilsin ki, çıxarılmaması daha yaxşıdır, çünki çıxarmaqda zərurət olmadan ölünün hörməti pozulmuş olur."

[434] Cənazəni apararkən ehtiyac olmadan minikdə getmək məkruhdur, lakin geri qayıdarkən ehtiyac olmasa da minik ilə qayıtmaqda bir qəbahət yoxdur.

[435] İmam Əhmədə görə cənazə ilə yürüdükdə "ona bağışlanma diləyin!" və buna bənzər sözlər demək bidətdir.

Meyiti qəbirə qoyanın "bismilləh alə milləti rasulilləh"[436] sözlərini deməsi sünnətdir. Onu qibləyə tərəf çevirmək vacibdir və sağ böyrü üstündə qoyulması sünnətdir.[437]

Zərurət halı istisna olmaqla başqa birini onun üzərində və yaxud onunla birlikdə dəfn etmək haramdır.[438]

Meyitin üzərinə üç dəfə torpaq səpmək sünnətdir, sonra bütövlüklə torpaqla örtülür.

Əksər alimlər dəfn edildikdən sonra ona təlqin etməyi[439] müstəhəb görüblər.

Qəbirə su çiləmək və onu bir şibr[440] miqdarında qaldırmaq müstəhəbdir.[441]

Qəbri bəzəmək, əhəngləmək, (ətirli) tüstüyə vermək, öpmək, ətrafında təvaf etmək[442], ona söykənmək, yanında gecələmək və gülmək, (yanında) dünyəvi söhbətlər etmək, üzərinə yazı yazmaq,

---

436 ət-Tirmizi (1046) rəvayət etdi və dedi: "Bu yöndən həsən, qərib bir hədisdir." Həmçinin əl-Hakim (1/366) rəvayət etdi və dedi: "əl-Buxari və Muslimin şərtlərinə əsasən səhih hədisdir."

437 ət-Təğləbi deyir: "Çünki yatan birinə bənzəyir və yatan kəsə sünnət olan sağ böyrü üstündə yatmaqdır."

438 ət-Təğləbi deyir: "(Ölünün) çürüdüyü və torpağa qarışdığı zənn edilərsə həmin yerin qazılması və başqasının orada basdırılması caiz olar. Əgər bunda şəkk edilərsə bu barədə mütəxəssislərə/ekspertlərə müraciət edilər. Əgər qazıldıqda orda sümüklər tapılarsa öz yerində basdırılmalı və torpağı əvvəlki vəziyyətinə qaytarılmalıdır və (İmam Əhmədin) bir mənalı sözünə əsasən onun üzərində başqasını basdırmaq olmaz."

439 Şeyxul-İslam deyir: "Olünün təlqin edilməsi məsələsində ən üstün görüş budur ki, o, məkruhdur, çünki peyğəmbər - sallallahu aleyhi va səlləm - bunu etməmişdir. Müstəhəb olan isə onun üçün dua etməkdir." Həmçinin İbnul-Qayyim deyir: "Peyğəmbər - sallallahu aleyhi va səlləm - ölənin qəbrinin yanında Quran oxumaz və ölənə təlqin etməzdi. Təlqin barədəki hədis isə səhih deyildir." ("Haşiyətur-Raud", 3/123-124) Lakin İbnul-Qayyim bunun caiz olmasını söyləmiş və bunun sələfin məzhəbi olduğunu demişdir, sələfdən bizim zamanımıza qədər bunun üzərində əməl edilməsini dəlil kimi göstərmişdir. İbnul-Qayyim "ər-Ruh" kitabında deyir: "Bu hədis sabit olmasa belə bütün ölkələrdə və əsrlərdə heç kəs bunu inkar etmədən əməlin onunla bağlı olması bu hədislə əməl etmək üçün kifayət edir."

440 Təxminən 22 sm

441 Burada hikmət, onun qəbir olduğunun bilinməsi üçündür. Bir şibrdən artıq qaldırmaq isə məkruhdur.

442 Lakin müəllif "əl-Ğayə" kitabında bunun haram olduğunu deyir.

(üzərində) oturmaq və (bir şey) tikmək[443], tikan və bənzər şeylərdən qorxmaq halı istisna olmaqla onun üzərində ayaqqabı ilə gəzmək məkruhdur.

Qəbirlərdə çıraq yandırmaq, məscidlərdə və başqasının mülkündə dəfn etmək haramdır və qazılıb çıxarılmalıdır. Çöllükdə dəfn etmək daha əfzəldir.

Əgər hamilə qadın ölərsə onun qarnını yarmaq haram olacaq.[444] Qadınlar yaşam ümidi olan uşağı çıxardarlar. Əgər bunu etmək mümkün olmasa (uşaq) ölənə qədər basdırılmaz.[445] Əgər onun bir hissəsi sağ olaraq çıxarsa qalan hissəsini çıxarmaq üçün (qadının qarnı) yarılar.

---

[443] ət-Təğləbi deyir: "(İnsanın) öz mülkündə olsa belə." Yəni öz mülkündəki qəbrin üzərinə də bir şey tikmək məkruhdur. əl-Ləbədi deyir: "(əl-Haccəvi) "əl-İqna" kitabında deyir: "Bu, ictimai qəbiristanlıqda daha da şiddətlə məkruhdur. (Əhməddən gələn) digər rəvayətə görə tikilinin qadağan olması ümumi vəqfə aiddir. əş-Şeyx (İbn Teymiyyə) dedi: "Bunu edən qəsb edicidir." Əbu Hafs dedi: "Hücrə tikmək haramdır, əksinə dağıdılmalıdır və doğru olan budur." əl-Haccəvi'nin sözü burada bitir. İbnul-Qayyim "əl-İğasə" kitabında deyir: "Qəbirlərin üzərindəki qübbələri dağıtmaq vacibdir, çünki onlar Allah elçisinə asilik üzərində əsaslanıb." (əl-Haccəvi) "əl-İqna" kitabında deyir: "Peyğəmbərlərin və salehlərin qəbirlərini örtmək, yəni bir pərdə ilə örtmək dində məşru olan bir şey deyildir, bunu Şeyx (İbn Teymiyyə) deyib və o, başqa bir yerdə qəbirə paltar geyindirmək haqqında deyib: "Bu, peyğəmbərlərin və salehlərin qəbirlərinə edildikdə bunun münkər olması haqqında imamlar ittifaq ediblər, o zaman gör başqaları necə olacaq?!"

[444] ət-Təğləbi bunun səbəbini belə izah edir: "Hamilə qadın qarnında yaşaması ümid edilən uşaq ilə ölərsə uşağa görə qarnının yarılması haram olar, ən səhih görüşə görə qadının bu zaman müsəlman və ya zimmi olması arasında fərq yoxdur, çünki burada möhtəməl olan, güman edilən bir həyatı saxlamaq üçün yəqin olan hörməti pozmaq vardır, üstəlik çox zaman görünən budur ki, uşaq sağ qalmır."

[445] Əgər qadınlar bunu edə bilməzsə o zaman uşaq ölənə qədər qadın dəfn olunmaz. ət-Təğləbi həmçinin qeyd edir ki, hətta kişilər çıxarda bilsə belə çıxarmaq olmaz, çünki ölünün hörməti pozulmuş olar. Lakin "Neylul-Məərib" kitabını təhqiq etmiş Şeyx Muhamməd Süleyman bin Abdilləh əl-Əşqar bu görüşə etiraz edərək deyir: "Bu ictihad mübahisəlidir. Əbu Bəkr – radiyallahu anhu – (ölünü) yeni paltar ilə kəfənləməyi tərk etmək haqqında demişdir: "Sağ insan ölüdən daha çox ona layiqdir." O zaman sağ birinin həyatda qalması necə ölünün hörmətinin qorunulmasından daha layiqli olmur?! Buna görə də zərurət olduqda qarnın yarılması və kişilərin onu çıxarması inşallah caizdir, hətta vacibdir. Belə bir halda uşağı çıxarmaq şafi'ilərin məzhəbidir. Bunu "əl-Muğni" kitabının sahibi (2/551) bir ehtimal kimi zikr etmişdir."

## Fəsil

Müsəlmana üç günə qədər təziyə[446] vermək sünnətdir, beləliklə ona deyilir: "Ə`azaməllahu əcrakə va əhsənə 'azəəkə va ğafəra limeyyitik". O isə (cavabında) deyir: "İstəcəbəllahu duaəkə va rahimənə va iyyək"[447]

Ölü üçün ağlamaqda heç bir qəbahət yoxdur. Ölənin gözəl xüsusiyyətlərini sayaraq ağlayıb oxşamaq, səsi yüksəldərək ağı çəkmək isə haramdır. Həmçinin paltarı yırtmaq, yanaqlara vurmaq, bağırmaq, saç yolmaq, saçı dağıtmaq və qırxmaq haramdır.

Kişilər üçün qəbirləri ziyarət etmək[448] sünnətdir, qadınlar üçün isə məkruhdur;[449] lakin əgər qadın yolda qəbrin yanından keçərkən ona salam verib onun üçün dua edərsə gözəl etmiş olar.

Qəbirləri ziyarət edən və ya onların yanından keçən üçün bu sözləri demək müstəhəbdir: "əs-sələmu aleykum dəra qaumin muminin va innə inşəallahu bikum lələhiqun va yərhamullahu-l-mustəqdiminə minkum val-mustə'xirin, nəs'əlullahə lənə va ləkumul-afiyə. Allahummə lə təhrimnə əcrahum va lə təftinnə bə`adəhum va-ğfir lənə va ləhum."

Diri kəsə birinci salam vermək sünnətdir[450] və onu qaytarmaq isə fərzu-kifayədir[451].[452]

---

[446] əl-Ləbədi təziyənin nə anlama gəldiyini izah edərək deyir: "Ona təsəlli vermək, səbr edəcəyinə görə əcrin olduğunu vəd edərək səbrə təşviq etmək, ölüyə və müsibət sahibinə dua etməkdir."

[447] İmam Əhməd duaya bu cür cavab vermişdir. ("Mənərus-Səbil", 1/249)

[448] ət-Təğləbi deyir: "Müsəlmanın bir kafirin qəbrini ziyarət etməsi mübahdır." əl-Ləbədi əlavə edir: "Onun üçün dua etmək məqsədi ilə yox, lakin (ölümü) yada salmaq üçün."

[449] Əgər qadınlar özlərini saxlaya bilməyəcəklərini, onlardan haram olan əməllərin sadir olacağını bilirlərsə onlara qəbirləri ziyarət etmək yekdil rəyə əsasən haram olur. Bunu ət-Təğləbi şərhində (1/243) deyir.

Asqıran Allaha həmd etdiyi zaman ona təşmit etmək[453] fərzu-kifayədir. Ona cavab vermək isə[454] fərzu-ayndır.[455]

---

[450] Salam verərkən baş əymək məkruhdur. İlk salam verənə salam verdiyi kəsin dəqiq şəkildə eşitməsi üçün səsi yüksəltmək sünnətdir. Əgər bir nəfərə salam verərsə, sonra ondan uzaqlaşmadan öncə bir də onu görərsə ikinci və ya üçüncü dəfə və ya daha çox salam verməsi sünnətdir. Söhbətə başlamadan öncə salamı vermək sünnətdir. Salam verəcəyi kəsin onun salamını qaytarmayacağını güman etsə belə salam verməyi tərk etməməlidir. Aralarında alimlərin də olduğu bir qrupun yanına gələrsə hamıya salam verər və sonra alimlərə ikinci dəfə salam verər.

[451] ət-Təğləbi "Neylul-Məərib"də (1/236) deyir: "Salam verilmiş tək bir kəsə [onu qaytarmaq] fərdi şəkildə fərzdir, salam verilmiş qrup halında olanlara isə [fərzu-kifayədir], onlardan birinin salamı qaytarması ilə digərlərinin üzərindən düşür. Salama cavab sayılacaq şəkildə dərhal cavab vermək vacibdir, yoxsa cavab sayılmaz. Salama cavab verdiyini eşitdirəcək qədər səsi yüksəltmək vacibdir. Salama cavab verərkən "va" hərfini artırmaq vacibdir. Diri kəsə salam verərkən "əlif-ləm"li demək ilə (yəni "əssələmu aleykum" demək ilə) "əlif-ləm"siz demək (yəni sadəcə "sələmun aleykum" demək) arasında seçim etməkdə sərbəstlik vardır."

[452] ət-Təğləbi deyir: "Yad qadına salam vermək məkruhdur, lakin qadının qoca və ya bərzə olması istisnadır." Bərzə isə cavanlar kimi hicab taxmayan, bir qədər yaşa dolmuş, ehtiyacları üçün özünün çölə çıxdığı qadınlara deyilir. ət-Təğləbi həmçinin deyir: "Hamamda (salam vermək), yemək yeyənə, (Quran) oxuyana, vuruşana, zikr edənə, (həcdə) təlbiyə edənə, hədis rəvayət edənə, xütbə verənə, moizə verənə, onları dinləyənə, bir şeyin fiqhini təkrar edənə, dərs verənə, elmi araşdırma edənə, azan və ya iqamə verənə, ehtiyacını ödəyənə, öz ailəsi ilə əylənənə, qəza ilə məşğul olana və bənzəri kəslərə (salam vermək) məkruhdur. Salam verilməsi müstəhəb olmayan bir halda salam verən kəs salamının alınmasına layiq deyildir." əl-Ləbədi deyir: "Əgər qadına salam verərsə qadın cavab verməməlidir, lakin qadın kişiyə salam verərsə kişi cavab verər." "əl-İqna" kitabındakı sözlər burada bitir. Şərhində (əl-Buhuti) deyir: "Eynilə bu şəkildə "ər-Riayə" kitabında da deyilir, ola bilsin ki, əlyazmada xəta vardır. Kişinin də cavab verməməsi əsaslıdır. Bunu "əl-Ədəb"də (İbn Muflih) deyir." əl-Ləbədi davam edərək deyir: "Bir məsləhət üçün və hər hansı bir haram şey olmadıqda, yad qadına salam göndərməkdə və yad qadının da ona salam göndərməsində bir qəbahət yoxdur

[453] Təşmit etmək asqıran "əlhəmdulilləh" dedikdə ona "yarhəmukallah" deməkdir.

[454] Cavab verərkən "yəhdikumullahu va yuslihu bələkum" sözlərini deyir.

[455] Asqırdıqdan sonra "əlhəmdulilləh" deməyən kəsə təşmit etmək məkruhdur, əgər deməyi unudarsa xatırlatmaq lazım deyildir. Kiçik yaşlı uşaqlara isə öyrətmək lazımdır. Bir dəfə asqırıb həmd gətirdikdən sonra təşmit edərsə, sonra ikinci dəfə asqırıb həmd gətirdikdən sonra ikinci dəfə təşmit edərsə, üçüncü dəfə də asqırıb həmd gətirərsə yenə təşmit edər, lakin dördüncü dəfə artıq onun sağlam olması üçün dua edər, təşmit etməz.

Ölü (xüsusilə) cümə günü günəş çıxmadan öncə önu ziyarət edəni tanıyır.[456] Onun yanında edilən pislikdən əziyyət çəkir, xeyirdən isə faydalanır.

---

[456] İbnul-Qayyim "Zədul-Məad" kitabında (1/415) deyir: "Hədislər və əsərlər ona dəlalət edir ki, ziyarət edən nə zaman ziyarət etməsindən asılı olmayaraq qəbirdəki onun gəlişini bilir, onun sözlərini eşidir və buna şad olur və bu, istər şəhidlər, istərsə də qeyriləri haqqında ümumidir və müəyyən bir vaxta xas deyildir."

Onun vacibliyinin şərti beş şeydir:

**Birinci**: müsəlman olmaq; kafirə - mürtəd olsa belə - vacib deyildir.

**İkinci**: azad olmaq; köləyə isə - mukətəb olsa belə - vacib deyildir, lakin mubə’ad köləyə sahib olduğu mülk miqdarında vacibdir.[457]

**Üçüncü**: qiymətlərdə təqribi olaraq, digərlərində isə dəqiq olaraq nisaba malik olmaq[458].

**Dördüncü**: tam sahiblik; mukətəb kölənin (ağasına verəcəyi) borcunda ağasının üzərinə və bölgüdən öncə mudaribin[459] hissəsinə zəkat düşmür.

**Beşinci**: həul’un[460] tamamlanması; yarım gün naqis olması zərər verməz.

Uşağın[461] və dəlinin malında zəkat vacibdir.

---

[457] Mukətəb qul, ağası ilə müəyyən məbləği ödəmək qarşılığında azad edilmək üzərində müqavilə bağlamış quldur. Mubə’ad qul isə iki və daha çox ağası olan və bəzisi tərəfindən azad edilmiş quldur.

[458] Misal üçün qızılın nisabı 85 qramdır, insanın malik olduğu qızıl bu nisaba çatmadıqca, zəkat ona vacib olmaz. Lakin mətndən zahir olduğu kimi, bunun təqribən olması kifayətdir, azacıq əksik olması zərər verməz. Qoyunun nisabı isə qırx dənə olmasıdır. Bir dənə qoyun əksik olarsa, artıq zəkatın vacibliyi düşər.

[459] Mudarib bir kimsədən sərmaye alaraq o sərmayəni/investisiyanı çalışdıran və ondan qazanc əldə edəndir. Əgər bir kimsənin pulu varsa, digər birinin isə bacarığı varsa, pul sahibi bacarıqlı şəxslə müqavilə bağlaya bilər və belə bir müqavilədə pulu alıb işlədən mudarib sayılır, beləliklə bölgüdən qabaq mudaribin payına zəkat düşmür, çünki onun payı əlindən çıxa bilər, belə ki, mudaribin payı sərmayənin zəmanətidir. Əgər mal xəsarətə uğruyarsa mudaribin payı sərmayədən xəsarətə uğrayan hissə əvəzində təzminat olacaq. Sərmayə sahibi isə həm sərmayənin həmdə qazancdan öz hissəsinin zəkatənı verməlidir.

[460] Həul bir il deməkdir. Diqqət etmək lazımdır ki, il ilə qəsd olunan bir şəmsi il yox, bir qəməri ildir. Bu, heyvanlarda, qızıl, gümüş və ticarət mallarına xas şərtdir.

Zəkat beş şeydə olur: otlayan davar heyvanlarda, yerdən çıxanda, balda, qiymətlərdə və ticarət mallarında.

Nisabı azaldan borc onun vacibliyinə mane olur[462].

Əgər biri üzərində zəkat borcu olduğu halda ölərsə tərk etdiyi maldan çıxarılar.[463]

## Otlayan heyvanların zəkatı bölümü

**Üç şərtlə onlarda zəkat vacib olur**:

**Birinci:** iş üçün deyil, sadəcə sağma, çoxaltma və kökəltmə üçün istifadə edilməsi.

**İkinci**: bir ilin yarısından çoxunda mübah olan yerdə[464] otlaması.[465]

---

[461] Ana bətnində olub diri doğulan uşağ üçün miras yaxud vəsiyyət olaraq ayrılan malda zəkat vacib deyil. Çünki o, ana bətnində olduğu sürəcə mala sahib deyildir. İbn Hamdən isə vaciblil görüşünü seçmişdir. ("Neylul-Məərib", 1/239)

[462] 85 qram qızıla sahib olanın 20 qram qızıl borcu olarsa, üzərində zəkat olmaz. Lakin əgər nisabı azalmazsa, misal üçün 100 qramı olanın 10 qram borcu olarsa, zəkat ona vacib olar, lakin borcun müqabilində olana zəkat düşməz, yəni 100 deyil, 90 qramın zəkatın verər.

[463] Bil ki, ölənin buraxdığı maldan ilk olaraq cənazəsinin hazırlanması ilə başlanır, daha sonra müəyyən əhd, sonra müəyyən qurbanlar, sonra girov ilə borc, sonra zəkat, həcc, kəffarələr, mütləq əhd, aralarında bölüşdürülsün deyə göndərilən borclar, sonra vəsiyyətlərin icrası, sonra isə yerdə qalan mal varislər arasında bölüşdürülür.(Haşiyətul Ləbədi: 117 səh)

[464] Burada mübah olan yer deyildikdə yalnız haram olmayan qəsd olunmur, lakin həm də öz-özünə bitmiş yerlər qəsd olunur, çünki insanın özünün əkdiyindən yedizdirdiyi heyvanlara aid deyildir. İnsan otu öz heyvanı üçün əksə, və ya alsa, və ya yığsa, o zaman bu otlamaq hesab olunmayacaq.

[465] Mətnə görə davar heyvanlarında çöldə azad şəkildə otlamanın zəkatın vacibliyi üçün şərt olması açıq-aydındır. əl-İqna kitabının sahibi bunu əminliklə vurğulamışdır. Buna görə də, heyvanın çöldə otlaması hasil olmamışdan öncə zəkatı tezləşdirmək səhih deyil. Müəllif əl-Ğayədə isə çöldə otlamanın baş verməməsini zəkatın vacibliyinə əngəl olduğunu əminliklə ifadə etmişdir. əl-

**Üçüncü:** nisab həddinə çatması.

Dəvədə ən aşağı nisab həddi beşdir və onlara bir qoyun düşür, sonra (sayları) iyirmi beşə (çatana) qədər hər beş dəvəyə bir qoyun düşür, beləliklə (iyirmi beşə çatdıqda) bir "bintu-məxaz"[466] düşür və o, bir yaşı tamamlanmış dişi dəvədir. Otuz altı dəvəyə bir "bintu-ləbun"[467] düşür; bu dişi dəvənin iki yaşı olur. Qırx altı dəvəyə bir "hiqqa" düşür; bu dişi dəvənin üç yaşı olur. Altmış bir dəvəyə bir "cəzəa"[468] düşür; bu dişi dəvənin dörd yaşı olur. Yetmiş altı dəvəyə iki baş "bintu-ləbun" düşür. Doxsan bir dəvədə iki baş "hiqqa" düşür. Yüz iyirmi bir dəvədə üç baş "bintu-ləbun" düşür və yüz otuz dəvəyə qədər belə davam edir, bundan sonra hər qırx dəvə üçün bir "bintu-ləbun" və hər əlli dəvə üçün isə bir "hiqqa" sabit olaraq qalır.

## Fəsil

İri buynuzlu mal-qarada - istər əhilləşmiş olsun, istərsə də vəhşi - ən aşağı nisab həddi otuzdur, otuz mal-qara üçün bir "təbi'" düşür və o, bir yaşlı danadır[469]. Qırx mal-qara üçün iki yaşı olan "musinnə"[470]

---

Muntəhə kitabında bu, həmçinin qəti şəkildə bildirilir.Bu görüşə görə isə, çöldə otlama hasil olmamışdan öncə zəkatı tezləşdirmək səhihdir. (Haşiyətul Ləbədi:117-ci səh).

466 "Bintu-Məxaz" bir yaşını tamamlamış, ikinci yaşına keçmiş dişi dəvəyə verilmiş addır. "Məxaz", "məxazə" felindən əmələ gəlir ki, hamilə qalmaq deməkdir. "Bintu-Məxaz" dişi dəvəsi bir ili tamamladıqdan sonra, anası çox zaman hamilə qaldığı üçün ona bu ad verilmişdir.

467 "Bintu-Ləbun" isə iki yaşını tamamlamış və üç yaşına girmiş dişi dəvədir. "Bintu-Ləbun" deyilməsinin səbəbi isə budur ki, çox zaman bu yaşda olan dəvənin anası artıq qarnındakı dəvə balasını doğmuş və döşləri südlə dolmuş bir dəvədir. "Bintu-Ləbun" hərfi mənada süd verən dəvənin dişi balası deməkdir.

468 Dörd yaşı tamam olmuş və beş yaşın içində olan dişi dəvəyə verilmiş addır. Artıq bu yaşda olan dəvənin dişləri tam çıxmış və bəziləri düşmüş olur.

469 Qəsd etdiyi ərkək danadır. Dişi dana da keçərlidir.

470 İki yaşı tamam olmuş dişi dana.

düşür. Altmış mal-qara üçün iki baş təbi’ düşür. Daha sonra hər otuz mal-qara üçün bir təbi’ və hər qırx inək üçün isə bir musinnə düşür.

Xırda buynuzlu davarın ən kiçik nisabı – istər əhilləşmiş olsun, istərsə də vəhşi - qırxdır. Qırx davara bir yaş olan keçi və ya altı aylıq quzu düşür. Yüz iyirmi bir davara iki qoyun, iki yüz bir davara üç qoyun, dörd yüz davara isə dörd qoyun düşür. Daha sonra hər yüzə bir qoyun düşür[471].

## Fəsil

Əgər zəkat əhlindən iki və daha çox kəs onlara aid olan heyvanların nisabında bütün il boyunca qarışarlarsa, gecələmə yerində, otlaqa getmək üçün toplaşılan yerdə, süd sağma yerində, həmçinin erkək heyvanda və otlaqda[472] müştərək olarlarsa bir nəfər kimi zəkat çıxarılmalıdır.

---

[471] Bil ki, üç hal istisna heyvanların zəkatında ərkək cinsli heyvan vermək səhih deyil. Birinci hal, əgər bütün nisab ərkəklər olarsa. İkinci hal otuz dana üçün çıxarılan bir yaşlı tabidir. Üçüncü hal isə, bint məxaz olmadığı təqdirdə onun yerinə ibn ləbun çıxarmaqdır, yəni iki yaşa dolmuş erkək dəvə çıxarmaqdır. Burada istəsə ondan daha böyük yaşı olan erkək də çıxarda bilər. Həmçinin, bütün nisab eybli olması halı istisna, eybi olan heyvan çıxarmaq da caiz deyil. Əgər nisabın bir hissəsi sağlam, digər hissəsi isə eybli olarsa, o zaman nisabın orta qiymətinə uyğun olan sağlam heyvan çıxardar.

[472] Heyvanları qarışdırmaq iki cür ola bilər. Birincinə “xiltatul-ə’ayən”, ikincinə isə “xiltatul-əusaf” deyilir. Birinci başların qarışığı, ikincisi isə vəsflərin qarışığıdır. Aradakı fərq budur ki, başların qarışığında heyvanlardan hansının kimə aid olduğunu ayırmaq mümkün deyildir. Vəsflərin qarışığında isə sahiblər onlara aid olan heyvanları müəyyən vəsflərə görə ayırd edə bilir. “Bu şərtlər xüsusi olaraq vəsflərin qarışığında mötəbər sayılır. Bu, “əl-İqna” və “əl-Furu`” kitablarında açıq bəyan edilib. Həmçinin “əl-Muntəhə” kitabının müəllifi (əl-Fətuhi)nin və bu kitabı şərh edən (əl-Buhuti)nin üstün saydıqları görüş budur. Heç şübhəsiz ki, üstün görüş məhz budur.” (“Haşiyətul-Ləbədi”, səh: 118)

Qarışdırma niyyəti[473], suvatın və çobanın bir olması və əgər inək, camış, qoyun və keçi kimi (heyvan) növləri fərqlənirsə (qarışımın səhihliyi üçün) erkəyin bir olması şərt deyildir.

Hər birinin iyirmi qoyunu olmaqla iki nəfərin qırx qoyunda qarışmaqları halında olduğu kimi bəzən (heyvanları) qarışdırma hökmü ağırlaşdırır, beləliklə iki nəfərə birlikdə bir qoyun düşür. Bəzən də hər birinin qırx qoyunu olmaqla üç nəfərin yüz iyirmi qoyunda qarışması halında olduğu kimi hökm xəfifləşir, beləki üç nəfərə birlikdə bir qoyun düşür.[474]

(Zəkata tabe olan mal) otlayan heyvanlar olmadığı təqdirdə malı (hissələrə) ayırmağın (hökmə) heç bir təsiri yoxdur.

Əgər (zəkat əhlinə aid heyvanlar) iki ayrı yerdə otlayan heyvanlar olarsa və arada (namazı) qısaltma məsafəsi qədər bir məsafə varsa, hər yerin öz hökmü vardır. Əgər onun bir-birindən uzaq yerlərdə qoyunları varsa və bunların hər birində (qoyunların sayı) qırxdırsa, yerlərin sayına uyğun qədər qoyun çıxarması ona vacibdir. Heyvanlar qarışdırılmış olmadığı təqdirdə hər bir yerdə qırx qoyun toplanmazsa onun üzərinə zəkat düşməz.

## Yerdən çıxanın zəkatı bölümü

---

[473] Misal üçün çoban malların sahiblərinin xəbəri olmadan heyvanları qarışdırarsa hökm bu cür olar.

[474] Yəni ki, heyvanları qarışdırmaq bəzən zəkatın hökmünü ağırlaşdırır, bəzən də yüngülləşdirir. Misal üçün əgər iki nəfərdən hər birində iyirmi qoyun varsa, heyvanları qarışdırmadıqları müddətdə heç birinə zəkat vacib olmur, çünki qoyunda nisab həddi qırxdır. Lakin əgər qarışdırsalar qoyunların sayı qırxa çatdığı üçün ikisinin qarışığından bir qoyun zəkat çıxarmaq vacib olur, halbuki ayrı-ayrılıqda heç bir şey vacib deyildir. Beləliklə bu halda hökm ağırlaşır. Digər bir halda isə hər birinin qırx qoyuna sahib olduğu üç nəfəri təsəvvür edək. Bu zaman hər birinə bir qoyun zəkat çıxarmaq vacibdir, lakin əgər bu qoyunları qarışdırsalar hamısına birlikdə yalnız bir qoyun zəkat çıxarmaq vacib olur və bu halda hökm yüngülləşmiş olur.

Buğda, arpa, qarğıdalı, düyü, noxud, mərci, lobya, lərgə, küncüt, darı, zirə, keşniş toxumu, pambığın, kətanın, qarpızın və bunun bənzərlərinin toxumu kimi həcm ilə ölçülən və tədarük edilə bilən hər növ dəndə, həmçinin xurma, kişmiş, badam, püstə, fındıq, sumaq kimi həcm ilə ölçülən və tədarük edilə bilən hər növ meyvədə zəkat vacibdir.[475]

İnnab,[476] zeytun, qoz, əncir,[477] ərik, murdarça meyvəsi, (tut), yemişan və narda zəkat yoxdur.

**Vacib olan şeylərdə isə yalnız iki şərtlə vacibdir**:

**Birinci**: nisaba çatması; onun – dənlər təmizləndikdən və meyvələr qurudulduqdan sonra - miqdarı beş vasqdır[478] və o, üç yüz saa edir, yaxud irdəbb[479] ilə altı və dörddə bir irdəbdir, yaxud da İraq ratlı ilə min altı yüz ratl, Qüds ratlı ilə iki yüz əlli yeddi və yeddidə bir ratl edir.

---

475 "Tədarük edilə bilən hər növ dən" və ya "hər növ meyvə" sözündən anlaşılır ki, onların qida üçün yararlı olması şərt deyildir.

476 Alləmə əl-Mərdəvi "əl-İnsaf" kitabında (3/90) deyir: "Səhih görüşə görə innabda zəkat vacibdir. "əl-Furu`"da demişdir: Üstün görüş budur. Həmçinin əl-Qadı "əl-Əhkəm əl-Sultaniyyə"də, (əs-Səmuri) "əl-Mustəv'ib"də və (İbn Qudəmə) "əl-Kəfi"də bunu əminliklə qeyd ediblər. Həmçinin ibn Aqil "əl-Fusul" və "ət-Təzkira"da bunu qeyd etmişdir, çünki o, həcm ilə ölçülür və tədarük olunur." ("Haşiyətul-Ləbədi", səh: 119) Lakin məzhəbin görüşünə görə innabda zəkat yoxdur. əl-Həccəvi "əl-İqna" kitabında və əl-Fətuhi "əl-Muntəhə" kitabında bu cür qeyd ediblər.

477 əl-Ləbədi haşiyədə (səh: 120) deyir: "Bu, məzhəbin görüşüdür. Lakin "əl-İqna" kitabında deyilir: "İnnəb, əncir, ərik və tutda (zəkatın) vacib olması daha üstün görüşdür."

478 Kitabı təhqiq etmiş Əbu Quteybə əl-Fəryəbi deyir: "Vasq ölçü vahididir. Onun miqdarı 122 kiloqram, 61 qramma bərabərdir. Belə ki, əkin və meyvələrin zəkatı (122, 61 × 5 = ) 610 kiloqram olur". Lakin onu qeyd edək ki, müasir ölçülər ilə bunu təhdid etməkdə görüşlər bir-birindən ayrılır. Doktor Vahbə əz-Zuheyli isə beş vasqı 653 kq olaraq müəyyən edib. Həmçinin Muhamməd Subhi Hələq də təxminən 653 kq olduğunu deyib.

479 İrdəbb Misirdə məşhur olan ölçü vahididir. O, qırx səkkiz saadır, çünki o, iyirmi dörd rüb'dür və bir rüb` isə dörd qədəhdir. Qədəhlərdən hər ikisi isə bir saadır. ("Haşiyətul-Ləbədi", səh: 120)

**İkinci**: Vacib olduğu vaxt nisaba malik olmasıdır[480]. Dənlərdə vaciblik vaxtı onların bərkləşdiyi vaxtdır. Meyvələrdə isə onların yararlı göründükləri vaxtdır.

## Fəsil

Zəhmətsiz suvarılanlarda onda bir hissə, zəhmət ilə suvarılanlarda isə onda birin yarısı vacibdir.

Dənlərin zəkatını təmizlənmiş, meyvələrin isə quru halda çıxarmaq vacibdir. Əgər əksinə edərək onu tər çıxararsa yetərli sayılmaz və nafilə (sədəqə) olaraq yazılar.

İmamın xurma ağacları və üzüm bağlarındakı meyvələr üçün, yetişdikləri göründüyü zaman onların miqdarını təxmin edəcək birini göndərməsi sünnətdir.[481] Bunun bir nəfər olması kifayət edir. Onun müsəlman, etibarlı və işini bilən olması şərtdir. Ona veriləcək ücrət bar sahibinin üzərinə düşür.

Zəkatın vaciblik vaxtına az qalmış aşkar[482] malın zəkatını almaq üçün zəkat toplayanları göndərmək imama vacibdir.

Xərac torpağında onda bir hissə ilə xərac bir arada cəm edilir.[483] Xərac torpağı isə, Misir, Şam və İraq kimi güc ilə fəth edilmiş və qənimət sahibləri arasında bölüşdürülməmiş torpaqdır.

---

[480] Yəni, əgər bunların zəkatın vacib olduğundan sonra almaqla və ya başqa yolla əlinə keçərə, zəkat vacib olmaz.

[481] əl-Ləbədi haşiyəsində (səh: 121) deyir: “Malikə və əş-Şafi’yə müvafiq olaraq; çünki bu barədə məşhur xəbərlər vardır. Hənəfilər bunu inkar ediblər, çünki bu, aldatma və təxmindir.”

[482] Yəni aşkarda görünən və bilinən mal. Kitabı şərh etmiş ət-Təğləbi buna misal olaraq zikr edir: “otlayan heyvanlar, əkin sahəsi və meyvələr kimi.”

[483] Xərac torpaqdan istifadə etmək haqqıdır, onda bir hissə isə torpaqdan əldə olunan məhsulun zəkatıdır. Bu, bir dükanı icarəyə götürməyə bənzəyir, belə ki, icarəyə götürən icarə haqqından əlavə ticarət mallarından da zəkat ödəməlidir.

Onda bir hissədən olan mallara və xəraca zəmanət qoymaq batildir.[484]

Balda da onda bir hissə zəkat vardır və onun nisabı: İraq ölçüsü ilə yüz altmış ratl təşkil edir.

Tapılan xəzinədə – az olsa belə - onun beşdə biri qədər zəkat vardır. Borc onun vacibliyinə mane olmur.

## Qiymətlərin zəkatı bölümü

Bunlar qızıl və gümüşdür.

Nisaba çatdığı zaman onlarda onda birin dörddə bir hissəsi[485] qədər zəkat vardır. Qızılın misqal ölçüsü ilə nisabı iyirmi misqaldır[486] və dinar ilə iyirmi beş dinar və dinarın yeddidə ikisi və doqquzda biridir. Gümüşün nisabı iki yüz dirhəmdir. Bir dirhəm on iki keçibuynuzu bitkisinin dənəsi çəkisindədir.[487] Misqal bir dirhəm və dirhəmin yeddidə üç hissəsidir. Nisabı tamamlamaq üçün qızıl gümüşə qatılar[488] və bu ikisindən istədiyindən (zəkat) çıxarar.

---

484 Yəni öncədən veriləcək zəkat və ya xərac üzərində razılaşmaq və buna zəmanət vermək olmaz. Misal üçün torpaq sahibindən bu il müəyyən miqdarda bar götürüb onun zəkatını ödəyəcəyinə və ya müəyyən miqdar xərac ödəyəcəyinə dair zəmanət əldə edilərək razılaşma hasil olur, beləliklə əgər həmin miqdarda çox bar əldə edərsə artıq qalan hissəsi torpaq sahibinə qalır və ondan zəkat ödəmir, az olarsa qalan hissəsi onun boynunda borc olaraq qalır. Bu, batildir, keçərli deyildir.

485 Yəni 2.5 faiz

486 Bir misqal dörd tam dörddə bir qramdır. Bir dirhəm isə 2.975 qramdır.

487 Şeyx İbn Useymin "əş-Şərh əl-Mumti" kitabında (6/97-98) qram ilə miqdarının 85 qram təmiz qızıl olduğunu deyir. Gümüşün nisab həddi qram ilə 595 qramdır.

488 Yəni ola bilər ki, ayrı-ayrılıqda nə qızıl, nə də gümüş nisaba çatmır, lakin ikisini birləşdirdikdə çatır, o zaman məzhəbin görüşünə görə ikisini bir araya qatmaq lazımdır. Birini digərinə qatdıqda qiymətə görə yox, cüzlərə əsasən qatmaq tələb olunur. Misal üçün əgər nisabın üçdə biri qədər qızıl, nisabın yarısı qədər gümüş vardır və qızılın üçdə biri qiymət baxımından gümüşün yarısına bərabərdir, o zaman qiymət baxımından qızılı gümüşə qatdıqda nisab tamamlanmış olur, lakin məzhəbin görüşünə görə belə halda bir-birinə qatmaq vacib deyildir, çünki qiymətə əsasən yox, cüzlərə əsasən qatmaq tələb olunur və cüzlərə əsasən qatsaq nisabın tamamlanması üçün altıda bir hissə çatmır, beləliklə zəkat çıxarmaq vacib olmur.

İstifadə etmək üçün və ya borca vermək üçün saxlanılan (qızıl və ya gümüşdən olan) mübah bəzək əşyalarda zəkat yoxdur.

Çəkidə nisab ağırlığına çatdığı zaman (qızıl və ya gümüşdən olan) haram bəzək əşyalarında, həmçinin icarə üçün və ya xərclik üçün saxlanılan mübah bəzək əşyalarında (zəkat) vacib olur. Əgər (qiyməti) çəkisindən çox gələrsə (bunların zəkatını) qiymətdən çıxarar.[489]

## Fəsil

Məscidi qızıl və ya gümüşlə bəzəmək haramdır.

Kişiyə, bir misqaldan çox olsa belə gümüşdən üzük taxmaq mübahdır. Onu sol əlin çeçələ barmağına taxmaq daha əfzəldir.

Qızıldan olsa belə yalnız qılıncın dəstəyinin baş hissəsini (bəzəmək), həmçinin kəməri, zirehi və dəbilqəni (bəzəmək) mübahdır[490], üzəngi, yüyən və mürəkkəbqabını isə olmaz.

Qadınlara – (qızılın ağırlığı) min misqaldan çox olsa belə - adətən geyindikləri (qızıldan olan) şeylər mübahdır.

Kişi və qadına bahalı daşlarla, yaqut və zəbərcəd ilə bəzənmək mübahdır.

---

[489] Daha əvvəl də qeyd olundu ki, qızıl və gümüşdə nisab çəkiyə görə sayılır, qiymətə görə sayılmaz, yəni çəkidə nisaba çatmadığı müddətdə qiymətdə nisaba çatsa belə zəkat vacib olmaz. Lakin əgər çəkidə nisaba çatarsa, zəkatın qiymətdə yoxsa çəkidə daha çox olduğuna baxmaq lazımdır; əgər qiymətdə zəkat çəkidəkindən daha çox gələrsə o zaman qiymətdən çıxarmaq lazımdır. Bu, mübah əşyalara aiddir. Haram olan zinət əşyalarında isə zəkat qiymətə görə deyil, çəkiə görə hesablanır.

[490] Beləliklə, kişiyə yalnız qılıncın dəstəyinin başını qızıldan etmək caizdir. Kəməri, zirehi və dəbilqəni isə gümüşlə bəzəmək mübahdır.

Dəmir, qurğuşun və misdən olan üzük taxmaq onlara məkruhdur. Əqiq daşlı üzük taxmaq isə müstəhəbdir. [491]

## Ticari malların zəkatı bölümü

Bunlar qazanc məqsədi ilə alış-veriş üçün hazırlanmış mallardır, beləliklə üzərindən bir həul keçdikdə qiymətləri təsbit edilir. (Həulun) əvvəli isə, qızıl və ya gümüşdən miskinlərə[492] ən faydalı olana uyğun olaraq qiymət nisaba çatdığı vaxtdan başlayır.[493] Əgər qiymət nisaba çatarsa[494] malın onda birinin dörddə bir hissəsi (zəkat üçün) vacib olur, əks halda (vacib) olmaz. Həmçinin pul dəllalının malları da bunun kimidir.[495]

İbrət qızıl və gümüş qabların qiymətində yox, onların çəkisindədir. Həmçinin özündə haram sənətkarlıq məmulu olan şeydə də (ibrət onun qiymətində deyildir), beləliklə ondan azad olmuş halında

---

[491] Bunu "ət-Təlxis"da qeyd etmiş və "əl-Muntəhə"də,"əl-Mustəv`ib"də, həmçinin İbn Təmim bu görüşü izləyiblər ."əl-İqna"da demişdir: "Əqiq daşlı üzük taxmaq mübahdır." ("Neylul-Məərib", 1/252)

[492] əl-Həccəvi "ət-Tənqih" kitabının haşiyəsində (səh: 133) deyir: "Onun "miskinlərə ən faydalı" sözünün heç bir anlamı yoxdur. Bəzləri isə "fəqirlərə" sözünü işlədiblər, necə ki, "əl-Furu" kitabında belədir. İbn Nasrilləh "əl-Furu`" kitabına haşiyəsində deyir: "Burada "fəqirləri" xüsusiləşdirməyin heç bir anlamı yoxdur, zəkat əhli olan bütün siniflər üçün ən faydalı olanı etibara al! Yalnız kasıbları zikr etməklə ona görə kifayətlənmişdir ki, çünki onlar da digər siniflər kimidir. Onların qəsdinin bu olduğu aşkardır. Əgər o, "zəkat əhlinə ən faydalı olan" sözünü işlətsəydi daha gözəl olardı".

[493] ət-Təğləbi şərhində qeyd edir ki, əgər bu ikisindən, yəni qızıl və gümüşdən birinin qiyməti ilə malların dəyəri nisaba çatırsa onunla çıxarmaq lazımdır.

[494] Əgər malların dəyəri nisab həddinə çatarsa, lakin üzərindən bir həul keçmədən öncə nisab dəyərindən aşağı düşərsə, o zaman bir daha nisab həddinə çatdığı zamandan həul yenidən başlayır.

[495] əl-Ləbədi haşiyəsində (səh: 125) deyir: "Yəni ticarət malları kimi onların da üzərindən bir həul keçdikdə qiymətləri təsbit edilir, çünki o da qalıcı deyildir, alış və satış üçündür. Mənsur əl-Buhuti bunu "əl-Muntəhə" kitabının şərhində açıq şəkildə söyləyib, lakin "əl-İqna"dakı sözlərin zahiri bunun əksini deyir."

qiyməti təsbit edilməlidir.[496] Ticarət üçün nəzərdə tutulmuş bir mala sahib olan bir kimsə və ya onu miras kimi əldə etmiş bir, sonra onu şəxsi malı kimi saxlamağı niyyət edərsə, sonra onu satmağı niyyət edərsə, taxılan bər-bəzəklərdən başqa heç bir şey mücərrəd niyyət ilə (ticari) mala çevrilmir.[497]

Mədənlərdən çıxarılana gəldikdə isə, ona sadəcə sahib olmaqla - əridildikdən və təmizləndikdən sonra qiymət nisaba çatırsa – onda birinin dörddə bir hissəsi qədər[498] onda (zəkat) vardır.[499]

## Fitrə zəkatı bölümü

Fitrə zəkatı bayramın ilk gecəsi girməklə vacib olur. Əgər kimsə günəşin batmadan öncə ölərsə və ya müflis olarsa fitrə zəkatı ona vacib olmaz, günəş batdıqdan sonra isə öhdəliyində (vacib olaraq) qalacaq.

---

[496] Yəni qızıl və gümüş qablar xüsusi sənətkarlıq əsəri olduğu üçün çox baha qiymətə sahib ola bilər, lakin ibrət qiymətdə deyil, onların çəkisindədir. Həmçinin zəkata tabe olan digər mallarda da haram olan sənətkarlıq əsərləri ola bilər, o zaman həmin haram olan sənətkarlıq əsəri nəzərə alınmır, ondan azad edilmiş halda qiyməti təsbit edilməlidir.

[497] ət-Təğləbi şərhində (1/253-254) bunu izah edərək qeyd edir ki, “mallarda əsl olan onların saxlanılan şəxsi mülk olmasıdır və bir şeyin əsli hökmünə qayıtması üçün mücərrəd niyyət kifayət edir, necə ki, səfərdə olan iqamə etməyi niyyət etdiyi halda belədir.” Lakin sadə bir niyyət ilə malı öz əslindən çıxarıb başqa hala salmaq olmaz, yəni şəxsi mülkdən ticarət malı hökmünə keçirmək üçün sadə niyyət kifayət etmir. Qızıl və gümüş bəzəklər isə fərqlidir, çünki onlarda zəkat əslən vacibdir.

[498] əl-Ləbədi haşiyəsində (səh: 125) deyir: “Yəni, əgər qızıl və gümüş olarsa özünün onda birinin dörddə birindən, bundan başqası olarsa qiymətinin onda birinin dörddə bir hissəndən çıxarılar”. Çünki mədəndən yalnız qızıl və gümüş yox, digər dəyərli mallar da çıxarılır. Mis, dəmir, qurğuşun, əqiq, yaqut, zümrüd, neft kimi malların qiymətinin 2.5 faizindən zəkat çıxarılmalıdır.

[499] Beləliklə mədəndən çıxarılanlarda zəkatın vacib olması üçün iki şey şərtdir: birinci: əridildikdən və təmizləndikdən sonra qiymət nisaba çatmalıdır, ikinci: çıxaranın zəkatın üzərilərinə vacib olduğu kəslərdən olması.

O, bayram günü və gecəsi öz qidası və ailəsinin qidasından əlavə qida tapa biləcək hər bir müsəlmanın üzərinə ehtiyac duyduğu evə, xidmətçiyə, heyvanına, libasa və elm kitablarına yiyələndikdən sonra vacib olur.

Həm öz əvəzinə, həm də saxladığı müsəlmanların[500] əvəzinə çıxarması lazımdır.

Əgər hamısı üçün fitrə zəkatı tapa bilməsə özündən başlayar, sonra zövcəsi, sonra köləsi, sonra anası, sonra atası, sonra balası və sonra mirasda ən yaxın olanın əvəzinə çıxarar.

Ramazan ayında bir şəxsin sədəqə olaraq xərclərini qarşılayana da vacib olur, lakin yemək qarşılığında bir şəxsi muzdla işlədən şəxsə vacib deyildir. Ana bətnində olan uşağın əvəzinə fitrə zəkatı çıxarmaq sünnətdir.

## Fəsil

Onu bayram günündə bayram namazından öncə çıxarmaq daha əfzəldir. Ondan sonra isə məkruhdur. Qadir olduğu halda onu bayram günündən sonraya təxirə salmaq haramdır. Onu qəza etməlidir. Bayram günündən iki gün öncə çıxarmaq keçərli sayılır[501].

Hər bir şəxsin adından bir sa’ xurma və ya kişmiş və ya buğda və ya arpa və ya quru süd çıxarmaq vacibdir[502].

---

[500] Yəni xərclərini ödədiyi kəslərin əvəzinə, zövcəsinin, anasının, atasının, oğlunun, qızının və bunlar kimi xərclərini ödədiyi kəslərin əvəzinə fitrə zəkatını çıxarmalıdır.

[501] Bundan əvvəl çıxartmaq isə keçərli deyil.

[502] Həmçinin bunların qarışığından bir sa` çıxartmaq kifayətdir. Bir sa` isə təxminən 2040 qramdır. Ehtiyat edib biraz çox çıxartmaq isə daha yaxşıdır, çünki muasir alimlər sa`nın təqdirində müxtəlif görüşlərdə olublar.

Buğda və arpanın unu(nu çıxarmaq) - əgər (çəkisi) dənələrinin çəkisi qədər gələrsə - yetərlidir.

Bunlar olmayacağı[503] təqdirdə onları əvəz edəcək qarğıdalı, darı və lobya kimi qidada istifadə olunan dənlərdən çıxarmalıdır.

Bir toplum insanın fitrə zəkatlarını bir nəfərə verməlǝri və bir nəfərin isə fitrə zəkatını bir toplum insana verməsi icazəlidir.

Zəkatda qiymətlə çıxarmaq mütləq olaraq[504] keçərli deyildir.

İnsanın öz zəkatını və sədəqəsini (verdiyi kəsdən) satın alması haramdır, onu ondan götürən kəsdən başqasından satın alsa belə (haramdır)[505].

## Zəkatın çıxarılması bölümü

Onun nəzir və kəffarədə olduğu kimi dərhal çıxarılması vacibdir. Onu ehtiyac duyulan vaxt üçün və yaxud bir qohum və bir qonşu üçün və ya nisabdan çıxarmağın imkansız olması – başqa maldan çıxarmaq imkanı olsa belə - səbəbilə gecikdirmək icazəlidir.

Onun (vacib olduğunu) bildiyi halda vacibliyini rədd edən kimsə onu cıxarmış olsa belə kafir olar.

Xəsislik və ya etinasızlıq üzündən zəkatı ödəməkdən imtina edən kimsədən (zəkat zorla) götürülər və həmin şəxs buna görə cəzalandırılar.

Hər kimsə zəkatı çıxardığını və ya vaxtın gəlib çatmadığını və ya nisabın naqis olduğunu və yaxud da mülkünün batdığını iddia edərsə and içmədən sözü qəbul olunar.

---

[503] Burdan anlayırıq ki, məzhəbin səhih görüşünə görə, zikr olunan beş sinif tapıldığı təqdirdə digərlərindən zəkat çıxartmaq səhih deyil.

[504] "Qiymətlə çıxarmaq" dedikdə malın qiymətini hesablayıb onu pul ilə çıxarmaq qəsd olunur. "Mütləq olaraq" deyildikdə isə bunun istisnasız bütün zəkat növlərinə aid olduğu qəsd olunur, həmçinin kəffarə və buna bənzər hallar da eyni hökmdədir.

[505] Lakin zəkatı və sədəqəsi başqa yolla özünə qayıdarsa, haram olmaz. Misal üçün zəkat verdiyi şəxs ona zəkatını hədiyyə edə bilər, bu zaman onu qəbul etmək haram olmaz.

Uşağın və dəlinin adından zəkatı onların vəlilərinin çıxarması vacibdir.

Zəkatı aşkarda çıxarmaq, zəkat sahibinin onu şəxsən ayırması və çıxarılan zaman bu sözləri deməsi müstəhəbdir: "**Allahummə-c'alhə məğnəmən va lə təc`alhə məğramən**."[506] Zəkatı alan şəxs isə bu sözləri deyir: "**Əcərakəllahu fimə ə`ataytə va bərakə ləkə fimə əbqaytə va cəaləhu ləkə tahura**."[507]

## Fəsil

Zəkatın çıxarılması üçün mükəlləf tərəfdən niyyətin olması şərtdir. Niyyəti (zəkatı çıxarmadan) azca öncə etməsi də icazəlidir, lakin onu (zəkatı) ödəməklə eyni zamanda etməsi daha əfzəldir. Beləliklə zəkat və ya vacib sədəqə (çıxardığını) niyyət etməlidir. Mütləq olaraq sədəqə (çıxardığını) niyyət edərsə[508], bütün malını sədəqə vermiş olsa belə keçərli sayılmaz. Niyyətində (zəkatın) fərzliyini və zəkat üçün çıxarılan malı müəyyənləşdirmək vacib deyildir.

Zəkatın çıxarılmasında bir müsəlmanı (öz adından) vəkil təyin edərsə, vəkil kimi təyin edən tərəfin (bunu) zəkatı çıxarmaq vaxtına

---

[506] Bunu İbn Macə (1797) Əbu Hureyradan rəvayət edir. əl-Heysəmi "əz-Zəvaid" kitabında (səh: 259) deyir: "Sənədində əl-Valid bin Muslim əd-Diməşqi vardır; o, tədlis edərdi və (sənədindəki) əl-Bəxtəri'nin isə zəif olmasında ittifaq ediblər."

[507] əl-Beyhəqi "Mərifətus-Sunəni val-Əsəri" kitabında (6/176) İmam əş-Şafi'nin bu duanın edilməsini müstəhəb saydığını zikr edir.

[508] İstənilən ibadəti mütləq şəkildə niyyət etməklə qəsd olunan ibadəti niyyətində hər hansı bir qeyd ilə müəyyən etməməkdir. Mütləq sözü qeydsiz-şərtsiz deməkdir. Misal üçün zöhr namazını qılmalı olduğu halda mütləq şəkildə namaz qılmağı niyyət edərsə, yəni hansı namazı qıldığını, vacib yoxsa nafilə namazını qıldığını niyyətində təyin etməzsə qıldığı namaz sadəcə nafilə namazı olacaqdır, zöhr kimi keçərli ola bilməz. Eynilə zəkatı ödərkən niyyətində zəkatı və ya vacib olan sədəqəni niyyət etməsi lazımdır, çünki vacib sədəqə deyildikdə elə zəkatın özü qəsd olunur. Amma sadəcə sədəqə verdiyini niyyət edərsə, yəni sədəqə sözünü vacib və ya müstəhəb kimi xüsusiyyətlərlə qeydə almadan niyyət edərsə həmin sədəqə zəkat kimi keçərli sayılmaz.

yaxın bir vaxtda niyyət etməsi yetərlidir, əks təqdirdə vəkil də (zəkatı çıxaran vaxt) niyyət etməlidir.

Zəkat malının hamısını öz ölkəsinin kasıblarına çatdırması daha əfzəldir. Namazı qısaltmağa imkan verən məsafəyə qədər onu daşımaq isə haramdır, lakin keçərlidir.[509]

Əgər nisab tamamlanarsa yalnız iki il üçün (zəkatı) tezləşdirmək səhihdir, iki il üçün (nisabın) özündən (çıxarmaq) olmaz.[510] Əgər nisab tələf olarsa yaxud azalarsa nafiləyə çevrilər.[511]

## Zəkat əhlinə dair bölüm

**Onlar səkkiz qisimdir**:

**Birinci**: fəqir; və o, özünə yetəcək miqdarın yarısını belə tapa bilməyəndir.

**İkinci**: miskin; və o, özünə bu miqdarın yarısını və ya o miqdarın çoxunu tapa bilən kəsdir.

**Üçüncü**: zəkatı toplayan, qoruyan, onu qeydə alan və paylayanlar kimi zəkatla əlaqədar işləyənlər.[512]

**Dördüncü**: qəlbi (İslama) isidilən şəxs; bu, sözü keçən əşirət ağasıdır ki, onun İslama gəlməsi ümid olunur və ya şərrindən qorxulur və ya zəkatın ona verilməsi ilə imanının güclənməsi ümid edilir və ya zəkatı verməyənlərdən onu toplayır.

---

[509] Namazı qısaltmağa imkan verən məsafə təxminən 83 kilometrdir. Buna əsasən Bakıda yaşayan birinin zəkatını Gəncəyə göndərməsi haramdır, lakin əgər edərsə zəkatı səhihdir, keçərlidir.

[510] Yəni nisabın özündən çıxarmamalıdır. Misal üçün əgər qırx qoyunu varsa, yəni nisab tamamlanıbsa, mal sahibi iki il üçün zəkatı çıxarmaq istəsə ikinci il üçün nisabın özündən çıxarmalı olacaq, bu isə caiz deyildir, çünki birinci il üçün zəkat olaraq qırxdan bir qoyun çıxardıqda yerdə 39 qoyun qalır və ikinci il üçün zəkat çıxarması mümkün olmur.

[511] Əgər vaxtından tez zəkat çıxararsa və bundan sonra bir il keçmədən öncə nisab tələf olarsa və ya naqis olarsa vaxtından tez çıxardığı zəkat nafilə sədəqəyə çevrilmiş olur, çünki kamil olmayan nisabdan çıxarmış olur.

[512] "Zəkat işçisinin mükəlləf, müsəlman, etibarlı və səriştəli olması və qohum olmaması şərt qoşulmuşdur." ("Neylul-Məərib", 1/263)

**Beşinci**: mukətəb kölə.

**Altıncı**: ziyana düşmüş borclu; və o, insanlara kömək etmək üçün borca girmiş və ya özü üçün borca girmiş və çətinliyə düşmüş kimsədir.[513]

**Yeddinci**: Allah yolunda vuruşan.

**Səkkizinci**: yolçu; və o, öz olkəsindən ayrı düşmüş bir qəribdir.

Onların hamısına ehtiyac duyduqları miqdarda zəkat verilir, yalnız zəkat işçisi istisnadır, belə ki, zəngin yaxud kölə olsa belə ona ücrət miqdarı verilir.[514]

Onu xəvaric və bağilərə vermək keçərli olur. Hökmdarlardan hər kim onu zorla və yaxud xoşluqla alarsa, istər haqlı olsun, istərsə də haqsız, hökm eynidir.[515]

---

[513] Haram bir iş üçün borca girmiş, lakin sonra tövbə etmiş kəsə də aiddirmi? Bu barədə əl-Təğləbi şərhində (1/264) deyir: "(İbn Muflih) "əl-Furu" kitabında dedi: "Kim günah işdə borca girərək çətinliyə düşərsə, ona heç bir şey verilməz, əgər tövbə edərsə ən səhih görüşə əsasən verilər."

[514] ət-Təğləbi qeyd edir ki, fəqir və miskinlərə bir il özləri və ailələri üçün kifayət edəcək miqdarı verilir. Qəlbləri İslama isindirilən kəslərə isə bunun həyata keçməsi üçün ehtiyac duyulacaq qədər, mukətəb olan qullara qalmış borclarını ödəyə biləcəkləri qədər verilir. Allah uğrunda döyüşənlərə isə cihad etməsi üçün tələb olunan miqdarı verilir. Qərib yolçulara isə onları ölkələrinə çatdıracaq qədəri verilir. Zəkatın hamısını bir sinif insanlara vermək olar, lakin hamısına vermək daha yaxşıdır. Alləmə əl-Ləbədi haşiyəsində (səh: 131) deyir: "Yəni əgər fəqirə və ya miskinə və ya zəkat işçisinə və yaxud da qəlbi (İslama) isidilən şəxsə zəkatdan bir şey verilərsə ondan dilədiyi qədər xərcləyər və artıq ehtiyacından artıq olanı geri qaytarmalı deyildir. Lakin borclu, mukətəb, qazi və yolçuya gəldikdə isə, əgər zəkatdan bir şey götürüblərsə onu götürdükləri məqsəddən başqası üçün sərf etmələri caiz deyildir. Əgər ehtiyaclarından artıq bir şey qalarsa onu geri qaytarmaq vacibdir. Beləliklə əgər bir borclu borcdan qurtularsa və ya bir mukətəb köləlikdən azad olarsa və əgər zəkatdan götürmüşdülərsə (istifadə etmədiklərini) geri qaytarmaqları vacibdir."

[515] Bağilər haqsız yerə müsəlmanların əmirinə qarşı üsyan etmiş kəslərdir. Əgər xavariclər və ya bağilər bir şəhərdə və ya bir ölkədə idarəni ələ keçirərlərsə zəkatı onlara ödəmək olar. Həmçinin zalım sultana da zəkat ödəmək olar, keçərlidir.

## Fəsil

Kafirə, köləyə, malında yaxud qazancında zəngin olana, dolanışıq xərclərini qarşılaması vacib olan kəslərə[516], öz ərinə və Haşim övladlarına zəkatın verilməsi keçərli deyildir.

Əgər (hökmünü) bilmədən zəkata haqqı olmayan kəsə verərsə, sonra bunu bilərsə keçərli sayılmaz və həmin malı artımı ilə birlikdə ondan geri qaytarar.

Əgər kasıb olduğunu güman etdiyi bir kəsə verərsə, sonra zəngin olduğu üzə çıxarsa (zəkatı) keçərli olar.

Dolanışıq xərclərini qarşılamaq öhdəliyi olmayan yaxınlarına və bibisi, qardaşı qızı kimi qohumlarına ehtiyacları miqdarında zəkat ayırmaq sünnətdir.

Öz ailəsinə qəbul edərək sədəqə olaraq nəfəqəsini verdiyi kəsə (zəkatını) verərsə keçərli olar.[517]

## Fəsil

Bütün vaxtlarda könüllü sədəqə vermək, xüsusilə də gizli şəkildə, fəzilətli bir zaman və məkanda, qonşuya və qohumlara vermək

---

[516] Öz zövcəsi, övladları, valideynləri kimi; çünki onların xərclərini qarşılamaq, onları ehiyac olduqda saxlamaq vacibdir, beləliklə onlara nəfəqa ödəmək vacib olduğu üçün zəkat vermək olmaz.

[517] Misal üçün yetim birini və ya kasıb birini öz ailəsinə qataraq könüllü şəkildə onun keçimini sağlayarsa, belə birinə zəkat verməsi caizdir, çünki həmin şəxsin xərclərini qarşılaması ona vacib deyildir, əksinə bunu sədəqə olaraq etmişdir. Əgər həmin şəxs xərclərinin ödənilməsi vacib olan qohumlardan olsaydı zəkatın ona verilməsi caiz olmazdı. İbn Muflih “əl-Furu” kitabında deyir ki, bu görüş əksəriyyətin görüşüdür. əl-Mərdəvi bu görüşdə olanlar arasında İbn Qudəmə’ni, və Şeyxul-İslam ibn Teymiyyə’ni zikr edir.

sünnətdir;[518] (qohumlara vermək) həm sədəqə, həm də qohumlara yaxşılıq sayılır.

Hər kim (ailəsinin ehtiyaclarını qarşılamaq üçün) vacib olan ruzini azaldacaq və ya özünə yaxud borclu olduğu şəxsə zərər verəcək şəkildə sədəqə verərsə bununla günaha girmiş olur.

Səbirsiz bir kəsin və ya mal sıxıntısına dözümü olmayan bir kəsin (sədəqə verməklə) ehtiyacını tam qarşılayacaq miqdarı azaltması məkruhdur.[519]

Sədəqə verdiyinə görə minnət qoymaq böyük günahdır[520] və bunu etməklə savabı puç olur.

---

[518] əl-Ləbədi deyir: "Könüllü (nafilə) həcc sədəqədən əfzəldirmi? Bu barədə (İmam Əhməddən) dörd rəvayət gəlib. Şeyx isə həccin bütün hallarda daha əfzəl olması görüşünü seçib. (əl-Mərdəvi) "əl-İnsaf" kitabında deyir: "Deyirəm: Aclıq zamanında verilən sədəqəyə heç bir şey bərabər olmaz."

[519] əl-Ləbədi deyir: "Səbirsiz bir kəsin ... məkruhdur" sözünə gəldikdə bu, bununla zərərin hasil olmadığı hala aiddir, əks təqdirdə isə - daha əvvəl qeyd olunduğu kimi – haramdır." Daha sonra deyir: "Mal qazanıb onu haqqı olan kəslərə xərcləmək əfzəldir yoxsa ibadətə çəkilərək insanlara qarışmamaq? Bu barədə ixtilaf vardır. Səhih olan budur ki, birinci daha əfzəldir, çünki faydası özündən başqalarına da çatır."

[520] əl-Ləbədi deyir: "Bəzi alimlər deyiblər: "Tərbiyə və ədəbləndirmək məqsədi ilə edilməsi istisnadır."

Ramazan orucu (ramazan ayının) hilalının görünməsi ilə bütün insanlara vacib olur və həmçinin araya bulud və ya tozun daxil olması ilə hilalın çıxışını görə bilməyən kəslərə şaban ayının otuzu ramazan niyyəti ilə ehtiyat üçün (oruc tutmaq) vacib olur. Əgər (həmin günün) Ramazan ayından olduğu (sonra) üzə çıxarsa[521] (həmin gün tutduqları oruc Ramazan orucu kimi) keçərli olar. Həmin gün təravih namazı qılınır. Lakin boşama, qulun azad edilməsi və (borc) müddətinin bitməsi kimi digər əhkamlar sabit olmur.[522]

Hilalın görünməsi mükəlləf və adil bir müsəlmanın – kölə və ya qadın olsa belə - xəbəri ilə sabit olur.[523] Digər əhkamlar isə ona uyğun olaraq sabit olur. Başqa aylarda isə yalnız iki adil kişinin şahidliyi qəbul olunur.

## Fəsil

---

521 "Yəni onun görülməsinin başqa bir yerdə sabit olması ilə ramazandan olduğu (aydınlaşarsa)" (ət-Təğləbi)

522 ət-Təğləbi bunların arasında iddət müddətinin və ilə müddətinin bitməsini də zikr etmişdir, yəni bu hökmlər də sabit olmur. Sabit olanlar yalnız orucla bağlı olan hökmlərdir.

523 İbn Əbi Təğləb şərhində (1/270) deyir: "Bu, bir hakimə xas deyildir, beləliklə də əgər hakim rədd etmiş olsa belə kim adil birinin hilalın görünməsi barədə verdiyi xəbəri eşidərsə ona oruc tutmaq vacib olur." əl-Ləbədi haşiyəsində (səh: 134) deyir: "Yalnız o halda ki, onun adil olmasını bilir. Lakin kim hilalı görərsə onun özünə (oruc) qeydsiz-şərtsiz vacib olur. Lakin əgər şəvval ayının hilalını təklikdə görərsə orucunu pozmaması vacibdir. İbn Aqil dedi: "Gizlində oruc tutması vacibdir." (əl-Mərdəvi) "əl-İnsaf" kitabında bu görüşü gözəl saymışdır. əl-İqna'da da (əl-Həccəvi) bu görüşə tabe olmuşdur. "əl-Ğayə" kitabında (əl-Kərmi) bu görüşü (hilalı görməsindən) tam şəkildə əmin olanlar üçün doğru bir görüş saymışdır."

**Orucun vacib olmasının şərtləri dörddür**: İslam[524], həddi-buluğ, ağıl və onu tutmağa qüdrətin olması.

Kim yaşlılıq və ya sağalma ümidi olmayan xəstəlik üzündən oruc tutmağa acizdirsə oruc tutmaz və hər günün əvəzində bir mudd çəkisində buğda və ya yarım sa' çəkisində digər məhsul ilə bir miskini yedirməlidir.[525]

**Orucun səhih olmasının şərtləri altıdır**: İslam, heyz və nifas qanının kəsilməsi.

**Dördüncü**: təmyiz; oruc tutmağa gücü çatan mumeyyiz uşağın vəlisinin uşağı oruca alışdırmaq üçün ona oruc tutmağı əmr etməsi və (etmədikdə) onu vurması vacibdir.

**Beşinci**: ağıl; lakin əgər (kimsə) gecə (oruc tutmağı) niyyət edərsə, sonra gün boyu dəli olarsa və ya huşsuz qalarsa, (gün ərzində) yalnız az bir zaman ayıq olarsa (orucu) səhih olar.[526]

**Altıncı**: hər vacib gün üçün gecədən niyyət tutmaq.

(Sübh girdikdə) oruclu olacağını gecə vaxtı ağlından keçirən kəs artıq niyyət etmiş sayılır. Oruc tutmaq niyyəti ilə (sübh girmədən öncə) yemək və içmək də belədir.

Niyyətdən sonra orucu ləğv edəcək bir iş görməsi və yaxud da (niyyətində) tərəddüd etmədən "inşallah" deməsi, həmçinin Ramazanın otuzuncu gecəsi - "əgər sabah Ramazan ayındandırsa fərz

---

[524] "Kafirə heç bir halda vacib deyildir, əgər ramazan ayı əsnasında müsəlman olarsa müsəlman olmadan öncəki günlərin orucunu tutması vacib deyildir." (ət-Təğləbi)

[525] ət-Təğləbi şərhində (1/272) deyir: "Kim sağalma ümidini itirərsə, lakin sonra orucun qəzasını tutmağa qadir olarsa, belə birinin halı həcc etməyə qadir olmayan çox xəstə birinin əvəzinə bir başqasının həcc etməsindən sonra sağalması halı kimidir." Yəni ki, ağır xəstəlikdən çox zəifləmiş biri həcc etmədiyi üçün başqa birisi onun adından həcc edərsə, sonra həmin xəstə sağalarsa ona həcc etmək vacib olmaz, çünki onun əvəzinə edilmiş həcc onun üçün keçərli sayılırdır. Oruc da bunun kimidir.

[526] əl-Ləbədi haşiyəsində bu cümlə quruluşuna etiraz edir və cümlənin belə qurulmasını daha uyğun görür: "Əgər gecə oruc tutmağı niyyə edərsə, sonra bütün günü (yəni sübhdən günəş batana qədər) ağlını və ya huşunu itirərsə orucu səhih olmaz, lakin günün az bir hissəsi ayıq olarsa səhih olar."

orucum olsun, əks halda oruc tutmuram” - deməsi zərər verməz. Lakin bunu əvvəlində[527] deyərsə zərər verər.

**Orucun fərzi** ikinci sübh açılandan günəşin batmasına qədər[528] orucu pozan amillərdən uzaq durmaqdır.

**Sünnətləri isə altıdır**: iftarı tezləşdirmək, suhuru gecikdirmək, xeyir əməlləri artırmaq, təhqir edildikdə uca səslə - “mən orucluyam”[529] - demək, iftar etdikdə[530] - “Allahummə ləkə sumtu va alə rizqıkə əftartu subhanəkə va bihamdikə, Allahummə təqabbəl minni innəkə əntə-s-səmiul alim”[531] - demək, iftarı yetişmiş xurma ilə, olmasa quru xurma ilə, olmasa su ilə açmaq.

---

527 Yəni şaban ayının otuzuncu gecəsi.

528 əl-Ləbədi deyir: “Gecənin cüzi bir hissəsində (yəni fəcrin girməsinə az qalmış) yeməyi durdurmaq vacibdir ya yox? Bu barədə ixtilaf vardır. Səhih olan budur ki, vacib deyildir. Hətta bəziləri deyib: “Bilən iki nəfərə - “mənim üçün fəcrin girməsinə nəzarət edin!” – deyərsə və onlardan biri “fəcr girdi”, digəri isə “girmədi” deyərsə, onların ikisi də (fəcrin girməsində) razılaşmayana qədər yeməyi tərk etmə(k vacib olma)z.” əl-Ləbədi deyir: “Quranın zahiri budur, bu görüşü götürmək vacibdir. Birinci görüşün dəlili isə budur ki, “vacibin yalnız onunla tamamlandığı bir şey də vacibdir”.” əl-Ləbədi daha sonra deyir: “Deyirəm: Bu eynisi budur; fəcr çıxan tərəfdə heç bir maneə olmadığı halda yanında saatı olan birinin ona fəcrin girməsini xəbər verərsə və (fəcrin girdiyi səmada) görülməzsə yeməyi durdurmaq vacib olmaz, çünki müşahidə daha güclüdür, saat isə bəzən xəta edir. Mənə aydın olan budur, doğrusunu Allah bilir.”

529 Buxari (1904); Muslim (160/1151); Hədisi Əbu Hureyra rəvayət edib. Məcdud-Din İbn Teymiyyə deyir: “Əgər Ramazandan savayı vaxt olarsa riya qorxusu səbəbilə bunu gizli edər.” Şeyx Təqiyuddin İbn Teymiyyə isə mütləq şəkildə onun aşkar edilməsi görüşünü seçmişdir, çünki mütləq söz dil ilədir. Bax: “əl-İnsaf”, 3/329; “əl-Furu`”, 3/66.

530 Bu duanın iftar etmədən öncə yoxsa iftar etdikdən sonra deyilməsi haqqında fərqli görüşlər vardır. əl-Ləbədi qeyd edir ki, insanlar bunu iftardan öncə deyirlər, lakin ona görə duadan sonra deyilməsi daha doğrudur. O, həmçinin qeyd edir ki, hənbəli alimlərindən kiminsə bu barədə hər hansı bir sözü ilə rastlaşmayıb. Lakin daha sonra Alləmə İbn Avd’ın sözlərini nəql edir; İbn Avd deyir: “Bu duanın iftardan əvvəl olması möhtəməldir, həmçinin iftardan sonra da olması möhtəməldir. İbn Abbas’ın hədisindəki məna bunun sonra olmasını tələb edir, belə ki, (İbn Abbas) deyib: “Əgər iftar edərsə.” Peyğəmbərin – aleyhissələm – “oruclunun iftar zamanı bir duası vardır ki, geri çevrilməz” sözləri də belədir. Bu faydanı İbn Nəsrilləh zikr edib.” Lakin əl-Ləbədi bu sözləri nəql etdikdən sonra deyir: “Lakin onun dəlil gətirdiyi aşkar deyildir.”

531 Bunu əd-Dəraqutni (2/185, 26 nömrəli hədis) İbn Abbas’ın hədisindən rəvayət edib. Hədisin isnadında Abdul-Malik bin Harun vardır. əd-Dəraqutni dedi: “O və onun atası zəif ravilərdir.” Aydın olduğu kimi hədis zəifdir. Alləmə Siracud-Din İbnul-Muləqqin əş-Şafi’i “əl-Bədr əl-Munir” kitabında (5/711) bu

## Fəsil

Heç bir üzrü olmayana Ramazanda oruc tutmamaq haramdır. Heyzli və nifaslı qadına oruc tutmamaq, həmçinin bir məsumu həlak olmaqdan qurtarmaq üçün orucu pozmağa möhtac olan kəsə orucu açmaq vacibdir.

Namazını qısaltması mübah olan müsafirə və zərərin toxunmasından qorxan xəstəyə[532] oruc tutmamaq sünnətdir.

Gündüz çağı səfərə çıxanın, öz canı üçün və ya uşağı üçün qorxan hamilə qadının və süd verən qadının orucu pozması mübahdır. Lakin əgər hamilə qadın və süd verən qadın ancaq uşağından ötrü qorxaraq orucu pozarsa uşağın vəlisinə hər günün əvəzində bir miskin yedirməsi lazımdır.

Gündüz çağı bir kafir müsəlman olarsa, heyzli qadın təmizlənərsə, xəstə sağalarsa, müsafir yurduna qayıdarsa, uşaq həddi-buluğa çatarsa və dəli sağalarsa – və onlar oruc tutmurlarsa - onlara orucu pozan amillərdən yan durub orucun qəzasını tutmaq gərəkli olacaq.

---

hədisin zəifliyini izah etdikdən sonra fayda üçün İbn Ömər'dən gələn bir başqa hədisi zikr edir. İbn Ömərin hədisində orucu açarkən belə dua edilməsi gəlmişdir: "zəhəbə-z-zaməu va-btəlləti-l-uruq va səbətə-l-əcru inşəallah" Bu hədis həsəndir. Ona görə də bu duanı söyləmək sünnətdir.

[532] Əgər oruc tutduqda xəstəliyi şiddətlənərsə və ya xəstəliyi uzanarsa, bu halda oruc tutması məzhəbin görüşünə görə məkruhdur. Lakin oruc tutduqda zərər görməyəcək bir xəstəyə oruc tutmamaq olmaz. əl-Ləbədi deyir: "Yəni yalnız orucu pozmaqla mümkün olan tədavini tərk etdikdə zərər görməyəcəyi müddətdə (bu hökm keçərlidir). Necə ki, göz xəstəliyi olan biri sürmə çəkməyi tərk etsə zərər gələcəyindən qorxarsa və həmçinin tədavi imalə, mədəyə və ya beyinə gedib çıxan tədavilər olarsa, bu halda hətta oruc tutmağa qadir olsa belə, orucu pozması caizdir. Bu faydanı əs-Savalihi zikr edib." Buradan anlayırıq ki, oruc tutmağa gücü çatan bir xəstə tədavi görürsə və oruc tutmaq tədavini tərk etmək anlamına gəlirsə, misal üçün xəstəlikdən müalicə alarkən iynə vurdurmaq ehtiyacı varsa, bu zaman oruc tutmaması caizdir.

Ramazan ayında oruc tutmamaq icazəsi olan kəsə həmin ayda (nəzir orucu, qəza orucu və ya nafilə orucu kimi) başqa bir oruc tutmaq olmaz.

## Orucu pozan səbəblər haqqında fəsil

**Bunların sayı on ikidir**: Heyz qanının və nifas qanının çıxması, ölüm,[533] mürtəd olmaq, orucu pozmaq əzmində olmaq, onda tərəddüd etmək, qəsdən qusmaq, arxa dəlikdən imalə etmək, bəlğəm ağıza gələrsə onu udmaq.

**Doqquzuncu**: xüsusi olaraq hicəmə[534]; burada hicəmə edən ilə etdirən eynidir.

**Onuncu**: təkrar baxmaqla məninin çıxması; (lakin) bir dəfə baxmaqla, fikirləşməklə, ihtilam ilə (məninin çıxması), həmçinin (bütün bunlarda, hətta təkrar baxmaqla belə) məzinin çıxması (orucu) pozmaz.

**On birinci**: öpüş və ya toxunma və ya istimna və ya cinsi əlaqədən başqa sevişmə əməlləri səbəbi ilə məni və ya məzinin çıxması[535].

---

[533] Əgər nəzir orucu və ya kəffarə orucu tutduğu halda gündüz çağı ölərsə orucu pozulmuş olur. Tərk etdiyi maldan kəffarədə kifayət edəcək qədər götürüb həmin günün əvəzində miskinə yedirmək lazımdır. Həmçinin əgər boynunda nəzir orucları varsa və bu orucları tutmaq imkanı olduğu halda öləndə qədər tutmayıbsa, o zaman özündən sonra tərk etdiyi maldan hər günün əvəzinə bir miskini yedirmək lazımdır. Miskini yedirmək əvəzinə vəlisinin və ya bir başqasının onun adından oruc tutması da keçərlidir. Lakin kəffarə orucu fərqlidir, bu halda yalnız miskini yedirmək keçərlidir. Fərz orucu da fərqlidir, onun əvəzinə oruc tutulmaz.

[534] Yəni bu, hicəməyə xas olan bir hökmdür, beləliklə analiz üçün və ya başqa məqsədlər üçün qan vermək buna qiyas edilməz. Hənbəli alimləri xüsusilə qeyd edirlər ki, damarı yarıb qan axıtmaq və ya burundan vurub qan axıtmaq orucu pozmaz. Bunun səbəbi isə budur ki, hicəmənin orucu pozması təəbbudi bir hökmdür, yəni hikməti, illəti bilinmir, ona görə də bənzər hallar ona qiyas edilməz.

**On ikinci**: insanın mədəsinə və ya boğazına və ya beyninə çatan hər bir maye və digər şeylər.

Beyinə çatan bir şeyi qulağına damcıladarsa və ya dərin yaranı tədavi edərsə, beləliklə də (dərman) onun qarnına çatarsa və ya boğazına çatdığını bildiyi bir şeyi gözlərinə sürmə kimi çəkərsə və ya saqqız çeynəyərsə və ya yeməyin dadına baxarsa və dadı boğazında hiss edərsə və yaxud da dodaqlarının arasına çatdıqdan sonra tüpürcəyini udarsa orucunu pozmuş olur.

Orucu pozan bütün bu səbəblərdən hər hansı birini unudaraq və ya məcbur edilərək[536] edərsə orucu pozulmaz, boğazına heç bir qəsd olmadan toz və ya milçək daxil olarsa orucu pozulmaz və həmçinin tüpürcəyi ağzında yığdıqdan sonra onu udarsa orucu pozulmaz.

## Fəsil

Kim Ramazanda gündüz çağı (orucu pozan səbəblərdən) uzaq durmalı olduğu halda – istər məcbur edilmiş olsun, istərsə də unutmuş olsun – hətta ölünün və ya heyvanın olsa belə, qabağından

---

[535] əl-Ləbədi haşiyəsində (səh: 139) deyir: "Bu, məzhəbin görüşüdür. (İbn Muflih) "əl-Furu" kitabında öpüş və ya toxunma səbəbilə məninin gələrsə orucun pozulmaması ehtimalını əsaslı saymış, o görüşə meyl etmiş və əl-Muvaffəq (İbn Qudəmə) ilə əl-Məcd (İbn Teymiyyə)nin dəlillərini rədd etmişdir. əl-Əcurri, Əbu Muhəmməd əl-Cəvzi və Şeyx Təqiyyud-Din (İbn Teymiyyə)yə görə bu səbəbdən məzi axarsa oruc pozulmaz. (İbn Muflih) "əl-Furu"da dedi: "Bu, daha üstündür." (əl-Mərdəvi) "əl-İnsaf"da dedi: "Doğru olan budur."

[536] ət-Təğləbi şərhində (1/278) deyir: "Əgər bu, ürəkdən getmiş birinin ağzına bir içkini müalicə məqsədi ilə içizdirmək yolu ilə edilirsə (orucu pozmaz)." Əlavə olaraq onu da qeyd edək ki, hökmündən cahil olaraq bunu edən unudanla eyni deyildir. Misal üçün oruclu ikən özünü qusdurmağın haramlığından cahil olan biri bunu edərsə orucu pozulmuş olur, həmin günün qəzasını tutması lazımdır. əl-Ləbədi deyir: "Bu cümlədən anlaşılır ki, haramlığından cahil olan orucu pozan səbəbləri etməklə orucu pozmuş olur və doğru olan da bu görüşdür."

və ya arxasından cinsi əlaqədə[537] olarsa, həmin şəxs orucun qəzasını tutmalı və kəffarə ödəməlidir.

Onunla cima edilən kəs də bunun kimidir, əgər könül xoşluğu ilə cimaya razı olarsa, cahil və ya unutmuş (olarsa isə hökm belə) deyil.

Kəffarəsi isə mömin kənizin azad edilməsidir. Əgər tapa bilməzsə ardıcıl şəkildə iki ay oruc tutmaqdır. Əgər bunu bacarmazsa altmış miskini yedirməkdir. Əgər bunu da edə bilməzsə digər kəffarələrdən fərqli olaraq[538] bu kəffarə onun boynundan düşəcək.

Ramazanda gündüz çağı cinsi əlaqə və lezbiyanlıq[539] nəticəsində məni axıtmaqdan savayı (hal üçün) kəffarə yoxdur.

## Fəsil

Kim Ramazan ayını ötürərsə günlərinin sayı qədər qəza tutar.

Qəzanı dərhal tutmaq (və ardıcıl tutmaq) sünnədir, yalnız şaban ayından onun tutmalı olduğu günlər qədər müddətin qalması istisnadır, o zaman (dərhal qəza etmək və ardıcıl tutmaq) vacib olur.

Boynunda Ramazan qəzaları olan şəxsin könüllü oruclara başlaması səhih deyildir. Əgər vacib bir orucu və ya qəza orucunu niyyət edərsə və sonra onu nafilə orucuna çevirərsə (orucu) səhihdir.

---

[537] Qüslu vacib edəcək bir əlaqə olması şərtdir, çünki əgər bir başa dəri ilə əlaqə olmadan, yəni erkəyin cinsiyyəti orqanı kondom və ya buna bənzər bir şeylə örtülü olduğu halda edilərsə və məni və ya məzi gəlməzsə oruc pozulmaz.
[538] Yəni aciz olduqda bu kəffarə müsəlmanın boynundan düşür, digər kəffarələr isə acizlik səbəbi ilə hökmdən düşmür. Lakin həmçinin heyzli qadınla əlaqədə olmağın kəffarəsini də bununla yanaşı zikr edir və deyir: “Heyzli ilə cinsi əlaqədəki kəffarədən başqa; çünki o da acizlik üzündən hökmdən düşür, necə ki, (müəllif özü) bunu öz bölməsində açıq şəkildə zikr edib.”
[539] əl-Ləbədi haşiyədə deyir: “ “əl-Muntəhə” kitabına uyğun olaraq. “əl-Ğayə” kitabında isə deyir: “Buna (yəni lezbiyanlıqla məninin axmasına) görə kəffarə yoxdur”. “əl-İqna” kitabında da belədir.”

Könüllü otuc tutmaq sünnətdir və bunun ən əfzəli bir gündən bir tutmaqdır.

Ağ gecəli günlər – və bu, (hər ayın) on üçü, on dördü və on beşidir – və həftənin dördüncü və birinci günləri və Şəvval ayının altı günü oruc tutmaq sünnətdir.

Məhərrəm ayının orucu da sünnətdir. Onun ən təkid edilmiş orucu isə aşurə gününün orucudur və bu oruc bir ilin kəffarəsidir. Həmçinin zül-hiccə ayının on günü oruc tutmaq (da sünnətdir). (Bu günlər arasında orucu üzərində) ən çox təkid edilmişi Ərəfə gününün orucudur və bu oruc iki ilin kəffarəsidir.[540]

Rəcəb ayını, cümə gününü və şənbə gününü oruc üçün xüsusiləşdirmək məkruhdur.[541]

Şəkk günü oruc tutmaq məkruhdur və bu, şaban ayının otuzu bulud və ya tozun olmadığı gündür. Bayram və təşriq günlərində isə oruc tutmaq haramdır[542].

Kim könüllü oruca başlayarsa onu tamamlamaq vacib deyildir. Fərz orucunda isə onu nafiləyə çevirmədiyi müddətcə tamamlamaq vacibdir.

---

[540] Aşurə orucunun bir ilin, ərəfə orucunun isə iki ilin kəffarəsi olması ilə qəsd olunan bu müddətdə edilmiş günahların kəffarəsidir, yəni onların təmizlənməsidir. İbn Muflih “əl-Furu” kitabında qəsd olunanın kiçik günahlar olduğunu deyir.

[541] Şeyxul-İslam ibn Teymiyyənin seçdiyi görüşə görə tək şənbə günü oruc tutmaq məkruh deyildir və onun barəsində gələn hədis şazdır və ya nəsx edilmişdir. “əl-Furu”, (3/123)

Qeyd edək ki, bu günlərdə orucun məkruh olması qəza oruclarına aid deyil.

[542] Qəza orucu olsa belə.

Etikaf[543] sünnətdir[544] və nəzir olaraq öhdəliyə götürdükdə isə vacib olur.

**Onun səhihliyinin şərtləri altı şeydir**: niyyət, müsəlman olmaq, ağıl, təmyiz, qüslu vacib edəcək səbəbin yoxluğu və məsciddə olması. Camaat namazlarında iştirak etməsi vacib olan kəslər barəsində həm də məscidin camaat namazı qılınan məscid olması şərti əlavə edilir[545].[546]

Məscidə əlavə edilən də məsciddən sayılır. Həmçinin məscidin səthi, onu əhatə edən həyəti, özü və ya qapısı məsciddə olan minarəsi(də məsciddəndir).[547] Kim üç məsciddən başqa hər hansı bir məsciddə etikaf etməyi (və ya namaz qılmağı) nəzir edərsə (həmin məsciddə bunları etmək) vacib olmaz.[548]

---

543 Etikaf: ərəb dilində "əkəfə" felindəndir və "əkəfə" bir şeydən ayrılmamaq, davamlı onunla birlikdə olmaq anlamını verir.

544 Etikaf hər bir zamanda sünnətdir, ramazan ayına xas deyildir. Lakin ramazan ayında daha təkidli sünnət olur.

545 Beləliklə də qadınlara, camaat namazında iştirak etməməyə üzrü olanlara hər bir məsciddə etikaf etmək caizdir.

546 Buradan anlayırıq ki, oruclu olmaq etikaf üçün şərt deyildir, çünki oruc tutmamağa üzrü olan bir kəs etikaf etmək istəyərsə bunu etməsi caiz və səhih olur.

547 Beləliklə də "əgər insan məscidin həyətində olarkən azan verilərsə ona çıxıb getmək caiz deyildir. (ət-Təğləbi)

548 Lakin üç məsciddə, yəni Haram məscidi, peyğəmbərin məscidi və əl-Əqsa məscidində etikaf etməyi və ya namaz qılmağı nəzir edərsə bunu o məsciddə etməsi vacib olar. Digər məscidlərə gəldikdə isə əgər nəzir alarkən hər hansı bir məscidi müəyyənləşdirərsə məhz həmin məsciddə etikaf etməsi vacib olmaz, başqa məsciddə də etikaf etməklə vacib olanı yerinə yetirmiş olur. Lakin əgər əl-Əqsa məscidində nəzir etməyi boynuna alarsa peyğəmbərin məscidində və ya Haram məscidində etikaf etməsi yetərli olur, yəni bu üç məsciddən birində etikaf etməyi nəzir edərsə ondan daha əfzəl məsciddə etikaf etməsi yetərli olur. Bəzi hənbəli alimləri həm də Quba məscidini də üç məscidin hökmünə daxil ediblər. Buradan həmçinin anlayırıq ki, hənbəli məzhəbinin görüşünə görə etikaf yalnız üç məscidə xas deyildir.

Heç bir üzr olmadan məsciddən çıxmaqla, məsciddən çıxmasa belə ondan çıxmağı niyyət etməklə[549], qadının cinsiyyət orqanı ilə cinsi əlaqədə olmaqla, cinsiyyət orqanından savayı yollarla yaxınlıq edərək məni axıtmaqla, İslamdan çıxmaqla və sərxoş olmaqla[550] etikaf batil olur.

Etikaf batil olduğu təqdirdə, (müəyyən bir) zamanla bağlı olmayan ardıcıl nəzri, kəffarə ödəmədən yenidən yerinə yetirmək vacib olur. Əgər (nəzir) müəyyən bir zamanla bağlı olarsa onu yenidən etməlidir və öz vaxtında onu etməyi əldən qaçırdığı üçün and kəffarəsi ödəməlidir.

Sidiyə və ya çölə çıxmaq üçün və ya vacib təharət almaq üçün və ya nəcasəti kənarlaşdırmaq üçün və ya ona vacib olan cümədən ötrü məsciddən çıxarsa, həmçinin əgər ona xidmət göstərən birinin

---

[549] Kitabın müəllifi Şeyx Mər'i əl-Kərmi'nin sözündən iki məna anlaşılır. "Ondan" dedikdə burada "etikafdan" çıxmaq qəsd olunur yoxsa "məsciddən" çıxmaq? Əgər məsciddən çıxmaq qəsd olunursa bu, xətadır, çünki heç bir alim belə bir şey söyləməyib. Şeyx əl-Ləbədi haşiyəsində (səh: 142) deyir: "Muhəmməd (bin Əhməd) əs-Səffərini bu kitaba (yəni ət-Təğləbi'nin "Dəlil ət-Talib" kitabına yazdığı şərhinə) yazdığı yazıda deyir: "Bu, məzhəbə müxalifdir və bildiyim qədər ilə alimlərimizdən heç kim belə bir görüş bildirməyib. Bizim şeyximizin - yəni kitabı şərh edən (Şeyx ət-Təğləbi'nin) – buna diqqət çəkməsi lazım idi, lakin diqqətindən yayınmışdır, çünki bizə bu cür oxutdurub. Heç bir şəkk yoxdur ki, bu, müəllifin səhvidir." Beləliklə buradan anlayırıq ki, əs-Səffərini sözün zahirini götürərək müəllifi tənqid edib və öz şeyxi ət-Təğləbi'nin bu xətaya diqqət çəkməməsinə də etiraz edib. Lakin ət-Təğləbi'nin etiraz etməməsini müəllifin sözlərindən ikinci mənanı anlaması ilə izah etmək olar, çünki etikafı pozmağı, yəni dayandırmağı niyyət etmək etikafı batil edir. Buna görə də Şeyx əl-Ləbədi özü əs-Səffərini'yə etiraz edərək deyir: "Müəllifin sözünün mənası budur ki, məsciddən yox, lakin etikafın özündən çıxmağı niyyət etməklə və ya etikafdan çıxmağı qəsd etmək məqsədilə məsciddən çıxmağı niyyət etməklə etikaf batil olur. Bu isə heç bir şəkk ola bilməz ki, etikafı batil edir, necə ki, orucdan və ya namazdan və ya bənzəri ibadətlərdən çıxmağı niyyət etməsi halı bunun kimidir və bu, məzhəbin qaydalarına uyğundur. əs-Səffərini'nin "məzhəbə müxalifdir" sözü aşkar göründüyü kimi doğru deyildir. Üstəlik sonra "əl-İqna" kitabında bu cür yazıldığını gördüm: "Əgər ondan çıxmağı, yəni onu batil etməyi niyyət edərsə batil olar; bunu(n hökmünü) namaza və oruca birləşdirmək yolu ilə ." Bu isə bizim dediklərimizi dəstəkləyən açıq-aşkar sözlərdir və müəllifin sözü də bu mənada anlaşılmalıdır və bu cür anlayış qaçınılmazdır. Tövfiq Allahdandır."

[550] ət-Təğləbi şərhində (1/284) deyir: "(əl-Həccəvi) "əl-İqna`" kitabında (1/322) deyir:" Əgər içərsə və sərxoş olmazsa yaxud böyük günah işləyərsə (etikafı) pozulmaz."

olmaması səbəbilə yemək və içmək üçün çıxarsa etikafı batıl olmaz. O, (çıxdıqdan sonra) normal şəkildə yeriyə bilər[551].

Məscidə doğru gedənə, xüsusilə də əgər orucludursa, orada qalacağı müddətdə etikaf etməyi niyyət etməsi məqsədə uyğundur.[552]

---

[551] Tələsmək tələb olunmur. (ət-Təğləbi)

[552] Çünki əgər məsciddə üç saat belə qalarsa etikafın savabını qazanmaq üçün etikaf etməsi lazımdır. Etikafın isə dediyimiz kimi ramazan ayının son on gününə xas deyildir, digər vaxtlarda daha az müddətə belə edilə bilər. Lakin Şeyx Mənsur əl-Buhuti qeyd edir ki, məscidə Quran öyrətmək və ya elm öyrətmək niyyəti ilə getməsi istisnadır, çünki bir görüşə görə etikaflı üçün bunları etmək məkruhdur. Şeyx əl-Ləbədi haşiyəsində (səh: 143) deyir: "Məzhəbin görüşü budur ki, bunları etmək müstəhəb deyildir. Bunlar Allaha itaət niyyəti ilə edildikdə müstəhəb olması da deyilmişdir. Bunu (əl-Mərdəvi) "əl-İnsaf" kitabında zikr edib."

Həcc, ümrə ilə birlikdə ömürdə bir dəfə vacibdir.

**Vacib olmasının şərti beş şeydir**: müsəlman olmaq, ağıl, həddi-büluğa çatmaq, tam şəkildə azad olmaq. Lakin uşaq və qulun həcci və ümrəsi səhih sayılır, lakin İslamın (fərz olan) həccinin və ümrəsinin yerini vermiş sayılmaz. (Ərəfədə) duruşdan öncə və ya (Ərəfə duruşundan) sonra geri dönüb vaxtında (Ərəfədə) durarsa, mufrad və ya qiran həccini niyyət edib qudum tavafından[553] sonra səy etmiş olmadığı təqdirdə az yaşlı uşaq həddi-büluğa çatarsa və ya qul azad olarsa İslamın (fərz olan) həcci olaraq keçərli sayılır. Həmçinin tavafından öncə həddi-büluğa çatarsa və ya azad olarsa ümrə olaraq keçərli sayılır.

Beşinci: bacarıq; və bu, azuqə və özü kimi birinə münasib olan miniyə[554] sahib olmaqdır və ya bunları əldə etməyə imkan verəcək bir şeyə sahib olmaqdır[555], lakin (bunların) kitablar, yaşayış yeri, xidmətçi kimi ehtiyacı olan şeylərdən artıq olması və özünü və ailəsini davamlı saxlamaq üçün lazım olan qazancından artıq olması şərtdir.[556]

---

[553] Bu, Məkkəyə girərkən ilk edilən tavafdır, ona görə də "qudum tavafı" adlanıb, qudum gəlmə deməkdir.

[554] Minik yalnız Məkkədən namazı qısaltmağa imkan verəcək bir məsafə uzaqlığında olanlar üçün şərtdir, Məkkəyə bu məsafədən daha yaxın bir yerdə olanlara isə şərt deyildir. (ət-Təğləbi)

[555] Yaxın və ya uzaq qohumun və ya bir tanışın həcc etmək üçün ona lazım olan azuqə və minik verməsi ilə bacariq şərti yerinə yetirilmiş sayılmaz, yəni bununla həcc ona vacib olmuş sayılmaz.

[556] ət-Təğləbi deyir ki, "vaxt genişliyi də bura aiddir." Yəni vaxtın əl verməsi də bacarıq şərtinə daxildir. əl-Ləbədi izah edərək deyir: "Əgər zul-hiccə ayının əvvəlində həcc etməyə qadir olarsa və onunla Məkkə arasındakı məsafə misal üçün on gündən çoxdursa, o zaman o, həccə muxatab deyildir. Əgər həmin il ölərsə tərk etdiyi mülkdən çıxarıb onun əvəzinə həcc və ümrə etmək üçün vermək lazım deyildir, çünki həcc ona vacib olmamışdır."

Kimdə bu şərtlər kamil olarsa, (gedəcəyi) yolda əmin-amanlıq olarsa[557] (həcc və ümrə) etməyə dərhal çalışması vacibdir. Yaşlılıq, sağalması ümid olmayan xəstəlik kimi bir üzr səbəbi ilə buna aciz olarsa (dərhal) öz əvəzinə ölkəsindən çıxaraq həcc və ümrə etməsi üçün – qadın olsa belə - hürr olan bir naib təyin etməsi lazımdır. Naib ihrama girmədən öncə (onu naib kimi seçənin) üzrü aradan qalxmadığı təqdirdə bu, onun üçün (həcc olaraq) keçərlidir. Əgər insan özünü əvəz edəcək şəxsi təyin etmədən öncə ölərsə onun buraxdığı mülkdən götürüb onun əvəzinə həcc və ümrə edəcək şəxsin xərclərini ödəmək vacib olacaq.

Öz yerinə həcc etməyənin digərinin yerinə etdiyi həcc səhih deyildir.

Qadın üçün **altıncı şərt** əlavə olunur və bu, qadının (ona yol yoldaşı olacaq) bir ərinin və ya mükəlləf məhrəminin olması və onun ücrətinə və özü və onun üçün azuqə və minik təmin etməyə qadır olmasıdır.[558]

Əgər (qadın) məhrəmsiz həcc edərsə haram etmiş olar, lakin həcci keçərli sayılar.

## İhram bölümü

[557] əl-Ləbədi haşiyəsində (səh: 145) deyir: "yolda əmin-amanlıq olarsa" sözünün zahiri budur ki, yolun əmin-aman olması həccin və umrənin vacibliyinin yox, onları etməyə səy göstərməyin vacibliyinin şərtidir. Buna əsasən əgər həcc etmədən öncə ölərsə onun əvəzinə həccə və ümrə edəcək birinə tərk etdiyi mülkdən götürüb vermək vacibdir. Müəllifin (yəni əl-Kərmi'nin) "əl-Ğayə" kitabında zikr etdiyinə görə isə yolun əmin-amanlığı bacariq şərtinə daxildir, beləliklə də vaxt genişliyi ilə eyni olur. Vaxt genişliyinin isə hökmü bundan öncə zikr olundu. Bu barədə düşün və bunu yaxşı anla!"

[558] Buradan anlayırıq ki, mükəlləf və müsəlman bir məhrəmi olmayan müsəlman qadına həcc vacib deyildir.

O, miqatdan[559] başlayaraq vacibdir. Əgər birinin mənzili (Məkkəyə) miqatdan yaxın (bir məsafədə) olarsa onun miqatı mənzili sayılır.

Dəlilik və ya huşsuzluq və ya sərxoşluğun olması ilə birlikdə ihram münəqid olmaz.

Münəqid olduqdan sonra isə mürtəd olmaqdan başqa bir şey onu batil etməz. Lakin insanın birinci təhallüldən öncə cinsi əlaqəyə girməsi ihramı fasid edir, onu batil etmir və həmin şəxsə onu tamamlamaq və qəzasını (dərhal) yerinə yetirmək vacib olur.

İhrama girmək istəyən təməttu` həccini - və bu, (üç növ həccin arasında) ən əfzəlidir[560] - və ya ifrad həccini və ya qiran həccini niyyət etmək arasında seçim edə bilər.

**Təməttu`**: həcc aylarında[561] ümrə niyyəti ilə ihrama girmək və ümrəni bitirdikdən sonra həcc niyyəti ilə ihrama girməkdir.

---

[559] Miqat həccə gedənlər üçün təyin edilmiş müəyyən bir yerdir ki, orada zəvvarlardan həcc geyimlərini geyinmələri, yəni ihrama girmələri tələb olunur. Birdən çox miqat mövcuddur. Mədinədən həccə gedənlər üçün miqat Zul-Huleyfə'dir. Şam, Misir və Şimali Afrikanın digər ölkələrindən gələnlər üçün isə miqat əl-Cuhfə məntəqəsidir. Yəmən əhlinin miqatı Yələmləm adlı yerdir. Nəcd əhli və Taif əhli üçün Qarnul-Mənəzil, İraq və Xorasan əhli üçün isə Zatu İrq adlı yer miqat sayılır. Bu adlar indi mövcud deyildir. Zul-Huleyfə indi Əbyər Ali adlanır. əl-Cuhfə təbii fəlakət və vəbaya düçar olduğu üçün tərk olunmuş və ondan bir qədər aralıda yerləşən Rabiğ adlı yer miqat olaraq götürülmüşdür. Yələmləm isə əs-Sa'diyyə adlanır. Qarnul-Mənəzil bu gün əs-Seyl əl-Kəbir adı ilə tanınır. Zatu İrq isə əd-Daribə adı ilə tanınır. Bu miqatların hamısı Məkkədən eyni uzaqlıqda deyildir, ən uzaq miqat Zul-Huleyfə'dir, Mədinə'nin yaxınlığındadır. əl-Cuhfə isə Mədinə ilə Məkkənin arasındadır. əl-Ləbədi haşiyəsində (səh: 147) deyir: "Bu miqatlar onların əhli və oradan keçənlər üçündür. Əgər Şam əhli Zul-Huleyfə'dən keçərsə onlara oranı ihramlı olmadan keçmək olmaz. Şeyxul-İslam isə deyir ki, bu halda ihramı əl-Cuhfə'yə qədər gecikdirmək olar. (İbn Muflih) bunu "əl-Furu" kitabında güclü görüş saymışdır." İbn Teymiyyə bu görüşündə İmam Malik'in məzhəbi ilə razılaşmışdır. Lakin cumhura görə misal üçün Şam əhli əgər Mədinə əhlinin miqatından keçərsə elə həmin miqatda da ihrama girmələri vacibdir, baxmayaraq ki, Şam əhlinin miqatı Mədinə əhlinin miqatından da sonra gəlir, yəni Məkkə ilə Mədinə arasında yerləşir.

[560] Şeyxul-İslam ibn Teymiyyənin seçdiyi görüşə görə qurbanıq heyvan gətiriləcəyi zaman qiran həcci təməttu` həccindən daha fəzilətli olur. Heyvan gətirməyən şəxs üçün isə təməttu` daha fəzilətlidir. ("Məcmu` əl-Fətəva", 26/86)

[561] Həcc ayları şəvval, zul-qadə ayları və zul-hiccə ayının on günüdür.

**İfrad**: həcc niyyəti ilə ihrama girmək və həcci bitirdikdən sonra ümrə niyyəti ilə ihrama girməkdir.

**Qiran**: eyni zamanda həcc və ümrə niyyəti ilə ihrama girmək və yaxud ümrə niyyəti ilə ihrama girmək, daha sonra ümrənin təvafına başlamadan öncə həcci ona daxil etməkdir. Əgər həcc, daha sonra ümrə ihramına girərsə (ümrə ihramı) səhih olmaz.

Kim (ihrama girməyi niyyət edib niyyətində həcci və ya umrəni müəyyənləşdirmədən) mütləq olaraq ihrama girərsə (ihramı) səhih olar və (ihramını) istədiyinə (dili ilə yox, lakin niyyəti ilə) aid edər. (Təyin etmədən) öncə əməl etdikləri isə boş əməldir.

Lakin sünnət olan (həcc yoxsa ümrə yoxsa qiran) edəcəyini müəyyənləşdirməsi və şərt qoyub belə deməsidir: "Allahummə inni uridu-n-nusukəl fuləniyyə fəyəssirhu li va təqabbəlhu minni va in habəsəni habisun fəməhilli heysu habəstəni"[562].

## İhramın yasaqları bölümü

Bunlar yeddi[563] şeydir:

**Birinci:** xof belə olsa kişilərin qəsdən tikişli libaslar geyinmələri.

---

[562] Bu sözlərdən "fəməhilli heysu həbəstəni" sözlərini əl-Buxari (5089) və Muslim (1207) Aişə anamız vasitəsilə peyğəmbərdən – salləllahu aleyhi va səlləm – rəvayət edirlər. Aişə anamız deyir ki, "peyğəmbər – salləllahu aleyhi va səlləm – Dubəa bint əz-Zubeyr'in yanına daxil oldu və ona dedi: "Həcc etmək istəyirsən?" Dedi: "Özümdə ağrıdan başqa bir şey hiss etmirəm." Ona dedi: "Həcc et və şərt qoyaraq de: "Allahım, təhəllül etdiyim yer məni saxladığın yerdir." əl-Miqdad bin əl-Əsvad'da ərdə idi." Yəni ki, Dubəa xəstəlikdən şikayət edirdi və həcc etdiyi təqdirdə hara qədər tab gətirəcəyini bilmirdi. Ona görə də Allahın elçisi – salləllahu aleyhi va səlləm – ihramdan çıxacağı yeri xəstəliyin onu durdurduğu yer olmasını ihrama girərkən şərt kimi qoşmasını ona buyurur. Müəllifin deyilməsini müstəhəb gördüyü sözlərin tərcüməsi isə belədir: "Allahım, mən filan nusuku etmək istəyirəm (və burada həcc yoxsa ümrə etmək istədiyini zikr edirsən), onu mənim üçün asanlaşdır və məndən qəbul et! Əgər bir səbəb məni durdursa təhəllül etdiyim yer məni durdurduğun yer olacaq."

[563] "əl-İqna" (1/355), "əl-Muntəhə" (1/250) və "əl-Ğayə" (1/398) kitablarında bu yasaqların sayı "doqquz" olaraq qeyd olunur. Həqiqətdə müəllif doqquzu yeddi bənd içində qeyd etmişdir, çünki digərləri dırnaqları tutmağı və qadının fərcindən başqa bədəni ilə cinsəl münasibətdə olmağı ayrıca iki bənd olaraq qeyd ediblər.

**İkinci:** Palçıq ilə və ya daşıdığı bir əşya ilə kölgələnmə yoluyla olsa belə kişilərin qəsdən başlarını örtmələri və qadınların üzlərini örtmələri; lakin qadın ehtiyac duyduğu zaman (paltarını başının üzərindən) üzünün qabağına sallaya bilər.

**Üçüncü:** Ətir iyləmək[564], (ondan dəriyə) yapışana toxunmaq və tamı yaxud qoxusu kənardan hiss olunacaq şəkildə onu yeməkdə və içməkdə istifadə etmək qəsdində olmaq. Əgər biri unutqanlıqdan və ya bilməməzlikdən və ya məcburiyyətdən tikişli libas geyinərsə yaxud ətir vurarsa yaxud başını örtərsə ona günah olmaz. Onun üzrü yox olduqda dərhal (üzərindəki ətri) kənarlaşdırmalıdır, əks halda fidyə verməli olacaq.

**Dördüncü:** bədəndən – burun olsa belə - tükləri kənarlaşdırmaq və dırnaqları tutmaq.

**Beşinci:** quruda yaşayan, yeyilən vəhşi ov heyvanı öldürmək, bu işə yol göstərmək, onu öldürməyə yardım etmək, yumurtasını zay etmək, çəyirtkəni və biti öldürmək. Lakin birəni öldürmək haram deyildir. Əksinə zərər verən hər şeyi öldürmək mütləq olaraq sünnətdir.

**Altıncı:** nikah bağlamaq; (belə nikah) səhih deyildir.

**Yeddinci:** (qadının) fərci ilə cinsi əlaqədə olmaq[565] və buna çağıran fellər etmək[566], (bədənin) fərcdən başqa hissəsi ilə cinsi əlaqədə olmaq və istimna etmək[567].

Bit öldürmək və nikah bağlamaq[568] istisna olmaqla bütün yasaqlar üçün fidyə düşür.[569] Yumurta və çəyirtkədə isə əvəzinə qiyməti

---

[564] Meyvə, səhra bitkiləri və ətir kimi istifadə etmək məqsədi olmadan əkilmiş bitkiləri qoxulamaq haram deyildir.

[565] əl-Ləbədi deyir: "Bu (yəni fərc ilə cinsi əlaqədə olmaq) həcdə ilk təhəllüldən öncə, ümrədə isə səyi tamamlamadan öncə nusuk'u fasid edir." Nusuk həm həcc, həm də ümrə üçün istifadə olunan ümumi addır.

[566] əl-Ləbədi deyir: "Yəni öpmək, şəhvət ilə toxunmaq və təkrar-təkrar baxmaq kimi."

[567] əl-Ləbədi deyir: "Yəni öz əli ilə və ya zövcəsinin əli ilə. Sözlərin zahirindən anlaşılan budur ki, hətta məni axıtmasa belə bunların hamısı haramdır."

[568] Çünki bu nikah ihram səbəbilə keçərli olmur. Bu üzdən fidyə vacib olmur. ("Neylul-Məarib", 1/298)

[569] ət-Təğləbi şərhində (1/297) deyir: "Bunda səhih olan ihram ilə fasid olan arasında fərq yoxdur. Bunu "əş-Şərh"də demişdir."

ödənməlidir. Bir tük və bir dırnaq üçün bir miskini yedirməli, ikisi üçün isə ikisini yedirməlidir. Zərurət ihramda olan üçün yasaqları mübah edir və fidyə verməyi gərəkli edir.

## Fidyə bölümü

O, ihram və ya (Məkkənin) Haram (ərazisi) səbəbilə vacib olandır.[570]

Fidyə iki qismə bölünür: ixtiyar üzərində olan qisim və tərtib üzərində olan qisim.

**İxtiyari qisim:** (tikişli paltar) geyinmək, ətirlənmək, (kişi üçün) başı örtmək, (qadın üçün üzü örtmək) və ikidən çox tük və ya dırnaq almaq, baxış nəticəsində məni axıtmaq və məni axıtmadan (bədənin fərcdən başqa hissəsi ilə) cinsəl yaxınlıq etmək; (bunları edən şəxs) seçim qarşısında buraxılır: ya bir qoyun kəsməli, ya üç gün oruc tutmalı, ya da altı miskini yedirməlidir, hər bir miskinə bir mudd buğda, yaxud yarım sa’ çəkisində digər bir şey (yedirməlidir). İxtiyari qismə ov etməyin cəzası da aiddir; (öldürdüyünə) bənzər bir heyvan (kəsərək onları Haram’ın yoxsullarına vermək) ilə (heyvanı) tələf etdiyi yerdə (heyvanın) mislini (dirhəm ilə) qiymətləndirmək arasında seçim verilir; (onun mislinə uyğun) qiymətə, fitrə zəkatında (və ya kəffarədə) keçərli olacaq bir yemək alır, sonra hər miskinə bir mudd buğda və ya yarım sa’ başqasından yedirir, yaxud da hər miskini yedirməyin əvəzinə bir gün oruc tutar[571].

**Tərtibli qism:** təməttu` və qiran, (həcc və ya ümrədə) vacib (əməl)in tərk edilməsi, maneə ilə üzləşmə, cinsi əlaqə və bənzəri hallar üçün

---

[570] Fidyə əslən əsirlikdə olan və ya həlak olacaq birini qurtarmaq üçün verilən mala deyilir. İhramın yasaqlarında da fidyə sözünün işlənməsi bu yasaqları, qadağaları etməyin sanki həlak olmasına işarə edir, beləliklə də bu həlakda qurtulmaq üçün fidyənin verilməsinə ehtiyac vardır.

[571] Nə üç gün oruc tutarkən, nə də hər miskini yedirmək əvəzinə bir gün oruc tutarkən orucların bir-birinin ardınca olması şərt deyildir.

(axıdılan heyvan) qanı. Beləliklə təməttu` və qiran həcci edənə və vacibi tərk edənə (heyvan) qanı (axıtmaq) vacibdir. Əgər kəsiləcək heyvan və yaxud onun dəyərində mal tapmazsa həcdə üç gün oruc tutmalıdır; axırıncı orucun Ərəfə gününə təsadüf etməsi əfzəldir. Təşriq günləri tutmaq da səhihdir. Evinə döndükdən sonra isə yeddi gün oruc tutmalıdır.[572]

(Həcdə) maneə ilə üzləşənə də qan (axıtmaq) vacibdir[573]. Əgər (heyvan) tapmazsa on gün oruc tutub daha sonra ihramdan çıxmalıdır. İlk təhəllüldən öncə həcdə cinsi əlaqəyə girən və yaxud (bədənin fərcdən başqa hissəsi ilə) yaxınlıq etmək və ya istimna etmək və ya öpmək və ya şəhvətlə toxunmaq və ya təkrar baxmaq səbəbilə məni axıdana bir dəvə (kəsmək) vacibdir. Əgər (dəvə) tapmazsa on gün oruc tutar; üç gününü həcdə, yeddi gününü isə həcdən döndükdə (tutar).

Ümrədə isə sə`yi tamamlamadan öncə ümrəsini (cinsi əlaqəyə girməklə) fasid edərsə bir qoyun (kəsmək vacibdir).[574]

---

[572] Əgər həcdə üç gün oruc tutmazsa, o zaman evinə döndükdən sonra on gün tutmalı və vacib olan orucları vaxtından sonraya gecikdirdiyi üçün heyvan kəsməlidir. Əlavə etmək lazımdır ki, bu üç günün orucunu həccin ihramına girmədən öncə, lakin ümrə ihramına girdikdən sonra da tuta bilər, çünki bu üç günü tutmağı vacib edən səbəb mövcud olduqdan sonra vaciblik vaxtı girmədən öncə də tutmaq mümkündür. Bunu vacib edən səbəb isə umrə ihramına girməsidir. Əgər oruc tutmağın vacib olduğu vaxt gələrsə - və bu vaxt heyvanı kəsməyin vacib olduğu vaxtdır, yəni nəhr günüdür – və oruca başlayıb başlamamasından asılı olmayaraq heyvan kəsməyə qadir olarsa o zaman orucu tərk edib heyvan kəsməyə keçmək vacib deyildir, dilərsə heyvan kəsər, dilərsə orucunu tutar. Lakin əgər vaciblik vaxtı girmədən öncə üç gün oruc tutarsa və vaciblik vaxtı girdikdə, yəni nəhr günü daxil olduqda heyvan kəsməyə qadir olarsa o zaman heyvan kəsməsi vacibdirmi? Yoxsa tutduğu oruclar kifayət edir? Hənbəli üləmasından İbnuz-Zəğuni'ə görə oruc kifayət etmir. Lakin əksər alimlərin işlətdikləri söz onun görüşünə müxalifdir. Hətta İbn Rəcəb "əl-Qavaid" kitabında bunu aşkar şəkildə bildirmişdir. Həmçinin əl-Mərdəvi "əl-İnsaf"da yalnız bu görüşü qeyd edib.

[573] Heyvanı maneə ilə üzləşdiyi yerdə təhəllül etmək, yəni ihramdan çıxmaq niyyəti ilə kəsməlidir. Heyvanı kəsmədən və ya on gün oruc tutmadan öncə ihramdan çıxmaq olmaz.

[574] Cinsi əlaqədə qadın da kişi ilə eyni hökmdədir. Lakin əgər yatarkən onunla cinsi əlaqəyə girərsə və ya buna məcbur edilərsə həccini və ümrəsini fasid etməz. ət-Təğləbi şərhində (1/301) deyir: "Saçı qırxmadan əvvəl, sə'yi qurtardıqdan sonra cinsi əlaqədə olmaq ümrəni pozmur."

**Birinci təhəllül** (bu üç şeydən, yəni daş) atmaq, (saç) qırxmaq və tavafdan ikisi(ni etməklə) hasil olur və (bu təhəllüldən sonra) qadınlar(la yaxınlıq etmək, öpmək və bənzəri əməllər etmək)dən başqa hər şey ona halal olur. **İkinci (təhəllül)** isə - əgər daha öncə sə`y etməyibsə - sə'y ilə birlikdə (bu üçündən yerdə) qalan(ı yerinə yetirmək) ilə hasil olur.

## Fəsil

Kənd təsərrüfatı heyvanları arasından misli[575] olan ov heyvanları:[576] misal üçün dəvəquşu və onun üçün dəvə, vəhşi eşşək və (çöl) inəyi (və dağ keçisi) üçün inək, kaftar üçün qoç, ceyran üçün qoyun, daman və kərtənkələ üçün yarım illik erkək çəpiş, gerbil üçün dişi dörd aylıq çəpiş, dovşan üçün dörd aylıqdan kiçik dişi çəpiş, qarabağır, alabaxta və qumru kimi dimdiyini suya salıb içib quruldayan göyərçin quşları

---

[575] əl-Ləbədi haşiyəsində (səh: 151) deyir: "Yəni, qiymətdə deyil, yaradılış formasında."

[576] Diqqət etmək lazımdır ki, burada müəyyən heyvanlar zikr olunur və digər ov heyvanları zikr olunmayıb. Bunun səbəbi isə onunla bağlıdır ki, bu müəyyən heyvanlar haqqında səhabələr hökm ediblər və alimlər də bu məsələdə o səhabələrin hökmünə əsaslanırlar. Lakin haqlarında heç bir səhabə hökmü olmayan heyvanlara gəldikdə isə əl-Ləbədi haşiyəsində onlar barəsində deyir: "Səhabələrin verdikləri hökmlərdə onlara əsaslanmaq vacibdir. O heyvanlar ki, onların (kənd təsərrüfatı heyvanları arasından) misli vardır və səhabələr onlar haqqında bir hökm verməmişdir, bunlarda adil və təcrübəli iki şəxsin görüşünə müraciət etmək lazımdır. (Heyvanı) öldürənin bu iki nəfərdən biri və ya hər ikisi olması da icazəlidir. İbn Aqil deyir: "(Bu, yalnız) xəta edərək və ya yeməyə ehtiyac olduğu üçün və ya haramlığından cahil olduğu üçün (öldürənlərə aiddir)." əl-Munəqqih (yəni Aləud-Din əl-Mərdəvi) deyir: "(İbn Aqilin) bu (görüşü) güclü görüşdür, ola bilsin ki, onların qəsdləri budur ki, (haram zonasında) qəsdən öldürmək (müsəlmanın) adilliyini aradan qaldırır." (əl-Kərmi) "əl-Ğayə" kitabında (deyir) : "hətta qəsdən öldürmüş olsalar belə və tövbə ediblərsə..." Dəqiqləşdir və düşün!"

üçün qoyun kəsilir. Qaz, dovdaq, kəklik və durna kimi misli olmayan heyvanların əvəzinə onların qiyməti ödənilir.[577]

## Fəsil

Məkkənın haram ərazisi içində ov etmək haramdır və onun hökmü ihramda ov etməyin hökmündədir.

Məkkənin ağaclarını və otunu qoparmaq haramdır.[578] Ihramda olmayan ilə ihramda olan bunda eynidir. Örfdə kiçik sayılan ağac üçün bir qoyun, ondan daha böyük olan üçün isə bir inək təzminat olaraq ödənilir. Ot və yarpağın əvəzinə onun qiyməti ödənilir.[579]

Dəvənin əvəzinə inək keçərli sayılır, necə ki, əksi də keçərlidir. Həmçinin yeddi qoyunun əvəzinə bir dəvə və ya bir inək keçərlidir.

Vacib olan qan ilə qəsd olunan qurbanlıq üçün keçərli olan (heyvanlar)dır (və bu,) altı ayı tamam olmuş quzu və ya bir yaşı tamam olmuş çəpiş və ya dəvənin və yaxud da inəyin yeddidə biridir.

---

[577] əl-Ləbədi haşiyəsində deyir: "Bu sözlərin zahirindən onun qiymətini sədəqə vermək və məhz vacib olanın bu olması mənası anlaşılır, lakin belə deyildir. Vacib olan sadəcə olaraq o qiymətə yemək almaq və onlarla miskinləri yedirməkdir və ya hər miskin üçün bir gün oruc tutmaqdır. Bu, seçim ixtiyarı olan qisimdəndir."

[578] Burada qəsd olunan Haram zonasında təbii yolla bitən ağaclar və otlardır, yoxsa insanın özünün basdırdığı ağaclar, kollar, otlar bu haramlığa aid deyildir. Həmçinin bu hökm canlı bitkilərə aiddir, quru və ölü bitkilər bu hökmə daxil deyildir, yəni onlar qoparmaq, sındırmaq bu hökmə aid deyildir. Həmçinin Məkkədə yaşayanların izxir bitkisinə də çox ehtiyacları olduğu üçün bu hokmdən istisna olunub. Yerdombalan, göbələk kimi bitkilər də bura aid deyildir.

[579] Mədinə şəhərinin də haram zonası vardır və həmçinin oradakı heyvanları və ağacları, otları tələf etmək haramdır, lakin Məkkədən fərqli olaraq ehtiyac üçün bunlar mübah edilmişdir. Yəni heyvanı yemləmək üçün otdan istifadə etmək mübahdır. Həmçinin Məkkədən fərqli olaraq burada heyvan öldürüldükdə, ağac və ya ot qırıldıqda, tələf edildikdə cəzasını ödəmək vacib deyildir.

Əgər dəvə və inəkdən birini kəsərsə daha əfzəl olar və (heyvanın) bütöv hissəsi vacib olar.[580]

## Həccin rükunları və vacibləri bölümü

Həccin rükunları dörddür:

**Birinci:** ihram; o, sadəcə niyyətdir, beləliklə kim onu tərk edərsə həcci münəqid olmaz.

**İkinci:** Ərəfədə duruş; onun vaxtı Ərəfə günündə sübh girəndən qurban kəsilən günün sübhü girənə qədərdir.[581] Hər kim həcc etməyə əhl olduğu halda Ərəfə ərazisindən keçərək və ya yuxulu olarkən və ya heyzli olarkən və ya o yerin Ərəfə olmasından cahil olarkən həmin vaxt bir anlıq Ərəfədə olarsa həcci səhihdir. Sərxoş və ya dəli və ya huşsuz haldadırsa (səhih) olmaz. Əgər insanların hamısı və ya az qismi istisna olmaqla əksəriyyəti xəta olaraq səkkizinci yaxud onuncu gündə Ərəfədə durarlarsa keçərli sayılar.[582]

---

580 əl-Ləbədi haşiyəsində (səh: 152-153) deyir: "Müəllif (yəni əl-Kərmi) "əl-Ğayə" kitabında deyir: "Bu, əgər heyvanın tamamı onun mülkündə olduğu halda əsaslı olur." Yəni ki, boynunda qan axıtmaq vacibiyyəti olan kəs dəvənin yalnız yeddidə birinə sahibdirsə və şəriki heyvanı kəsməkdə və öz haqqını ordan götürməyə izn verərsə, o da bundan sonra (heyvanı) kəsərsə həmin yeddidə bir hissə onun üçün keçərli sayılır və heyvanın tamamı ona vacib olmur. Bu, isə aşkar məsələdir."

581 İkinci görüş budur ki, Ərəfədə duruş vaxtı günəş zeniti keçdikdən sonra başlayır. Bu, məzhəbdə gələn bir rəvayətdir və habelə Şeyxul-islam ibn Teymiyyənin seçdiyi görüşdür. Bax: "əl-İnsaf", 4/29; "Məcmu` əl-Fətəva", 26/161.

582 Burada insanların hamısı və ya az qismi istisna olmaqla əksəriyyəti deməklə qəsd olunan xətanın qaçınılmaz olmasına işarədir. Çünki əgər insanların yarısı doğru edərsə, digər yarısı isə xəta edərsə bu, xətanın qaçınılmaz olmadığını göstərər. Günümüzdə bunun misalı zül-hiccə ayının nə zaman başlanmasında xəta etmək ola bilər, belə ki, Səudiyyə Ərəbistanda səhvən ayı gördüyünü düşünən bir və ya bir neçə şahidin şahidliyi əsasında ay bir gün tez başlaya bilər. əl-Ləbədi haşiyəsində xəta haqqında deyir: "Onun "xəta olaraq" sözü xətanın

**Üçüncü:** İfada tavafı; onun ilk vaxtı: (Ərəfədə) duran üçün qurban kəsilən günün gecə yarısından başlayır, əks halda (Ərəfədə) durduqdan sonra olur və axırı üçün bir hədd yoxdur.

**Dördüncü:** Səfa və Mərva təpələri arasında sə`y etmək.

**Onun vacibləri yeddidir:** miqatdan ihrama girmək, günorta vaxtı Ərəfədə duran üçün günəş batana qədər orada durmaq, qurban kəsilən gecə həmin gecənin yarısından sonraya qədər Müzdəlifədə gecələmək, təşriq gecələri Minada gecələmək, tərtib ilə daşları atmaq[583], sacları qırxmaq yaxud qısaltmaq və vida tavafı etmək.

**Ümrənin rükunları üçdür:** ihram, tavaf və sə`y.

**Onun vacibləri:** haram zonasından kənarda ihrama girmək və saçı qırxmaq yaxud qısaltmaq.

Ərəfə gecəsi Minada gecələmək, qudum tavafı,[584] onun ilk üç dairəsində sürətli addımlar atmaq, (qudum tavafında) ridənın ortasını sağ çiyninin altından keçirərək uclarını sol çiyninin üzərinə atmaq, ihram(a girmək istədik)də tikişli paltarları çıxarmaq, iki ağ və təmiz izar və ridə geyinmək və ihramın ilk anından ilk daş atana qədər təlbiyə etmək kimi əməllər sünnədir.

Hər kim bir rüknu tərk edərsə yalnız onu əda etməklə həcci tamamlanmış olar. Bir vacibi tərk edənə isə (heyvan) qanı (axıtmaq) vacib olur və həcci səhih sayılır. Kim bir sünnət tərk edərsə üzərinə heç bir şey düşməz.

---

həm (günlərin) sayında, həm (ayı) görməkdə, həm də hava tutqun olduğu halda ictihad etməkdə baş verməsinin hamısını əhatə edir. (İbn Muflih) "əl-Furu" kitabında deyir: "Bu, İmamın və başqalarının sözlərinin zahiri mənasıdır." Deyirəm: "əl-İnsaf" kitabındakı sözlərdən anlaşılan isə budur ki, əgər onlar (günlərin) sayında və ya yolda və ya buna bənzər hallarda xəta ediblərsə və ayın onuncu gününə düşüblərsə icma ilə onlar üçün keçərli sayılmır." Beləliklə də əl-Ləbədi'nin nəql etdiyi sözlərdən anlayırıq ki, günlərin sayında edilən xəta və ya yolda edilən xəta üzrlü deyildir.

[583] Daş atma üçün üç cəmərat sütunları mövcuddur. İlk sütun əl-Xayf məscidinin yanındakı kiçik sütundur, ondan sonra 155 metr aralıda orta sütun, ondan sonra isə eyni məsafədə ən böyük sütun olan əl-Aqabə sütünü yerləşir. Tərtib də bu şəkildə olmalıdır.

[584] ət-Təğləbi deyir: "İfrad və qarin həcci edənlər üçün; və bu, (yəni qudum tavafı) Məkkəni salamlamaqdır."

## Fəsil

**Tavafın səhih olması üçün on bir şərt vardır:** niyyət, (tavaf edənin) müsəlman olması, ağıl, vaxtın girməsi, övrət yerlərinin örtülməsi, nəcasətdən azad olmaq, hadəsdən təmiz olmaq,[585] yeddi dövrəni tamamlamaq, Kəbəni sol tərəfdə tutmaq, imkan daxilində piyada getmək və aramsızlıq.

(Tavafda) hadəs(in baş verməsin)ə görə, həmçinin uzun fasiləyə görə (tavafı) yenidən başlamalıdır. Əgər (fasilə) qısa olarsa və ya namaz başlayarsa və ya cənazə gətirilərsə namazı qılar və tavafını qara daşdan bərpa edər.

**Onun sünnətləri:** sağ əl ilə Yəmən küncünə, həmçinin qara daşa toxunmaq və onu öpmək, dua və zikr etmək və Kəbəyə yaxın olmaq[586] və tavafdan sonra iki rükət qılmaq.

## Fəsil

**Sə`yin səhih olması üçün səkkiz şərt vardır:**

---

[585] əl-Ləbədi haşiyəsində (səh: 154) deyir: "Şeyxul-İslam üzr olduqda heyzlinin tavafının səhih olduğuna dair fətva verib və doğru olan da inşallah budur. Bunun eynisi nəcasətdən azad olmaq (şərti) haqqında da deyilə bilər. Əgər üzərində nəcasət olduğunu bilmədən və ya unudaraq tavaf edərsə namazda zikr olunmuş ixtilaf burada da keçərlidir..."

[586] ət-Təğləbi deyir: "Əgər məscidin içində, lakin Kəbədən uzaqda tavaf edərsə tavafı səhihdir, lakin məsciddən kənarda tavaf edərsə səhih sayılmaz."

Niyyət, (sə’y edənin) müsəlman olması, ağıl, arada fasilə verməmək, imkan daxilində piyada getmək[587], tavafdan sonra – hətta qudum tavafı kimi sünnət tavaf olsa belə - edilməsi, yeddi dəfəni tamamlamaq, Səfa və Mərva arasındakı məsafəni tam qət etmək[588].

Əgər insan Mərva ilə sə`y etməyə başlayarsa həmin dövr hesaba alınmaz.

**Onun sünnətləri:** təharət, övrət yerinin örtülməsi[589] və sə`y ilə təvaf arasında ara verməmək.

İnsanın sevdiyi bir şey üçün zəm-zəm suyunu içməsi və həmin sudan bədəninə və paltarına çiləməsi və “bismilləh, allahummə’c’alhu lənə ilmən nəfian va rizqan vasian və riyyən va şəbəan va şifəən min kulli dəin vağsil bihi qalbi vamlə`hu min xaşyətik” deməsi[590] sünnətdir.

Peyğəmbərin - sallallahu aleyhi va səlləm - qəbrini və iki səhabəsinin – ridvanullahi aleyhimə - qəbirlərini ziyarət etmək sünnətdir.[591]

Peyğəmbərin - sallallahu aleyhi va səlləm - məscidində namaz qılmaq müstəhəbdir. Orada qılınan namaz min namaza bərabərdir. Haramda məscidində qılınan namaz isə yüz min namaza bərabərdir. əl-Əqsa məscidində qılınan namaz beş yüz namaza bərabərdir.

---

[587] əl-Ləbədi deyir: “əl-Muvaffəq (İbn Qudəmə əl-Məqdisi) üzr olmadan belə minik üzərində sə’yin keçərli olacağını zikr edib.”

[588] Məsafəni tam qət etmək üçün dağların başına çıxması şərt deyildir, lakin dağın ən aşağı hissəsinə ayaq basmaqla məsafəni qət etmiş olur. Birinci olaraq Səfadan başlayır və yuxarısına çıxması şərt deyildir. Ən aşağı hissəsindən başlayır və Mərvaya tərəf yürüyür, bu ikisi arasında iki yaşıl dirək vardır və bu iki dirəyin arasında qaçır. Qadının qaçması lazım deyildir. Bu şəkildə yeddi dövr vurur.

[589] Ləbədi haşiyəsində (səh: 154) deyir: “Yəni, əgər təharətsiz və yaxud çılpaq sə`y edərsə keçərli sayılır, lakin övrət yerinin örtülməsi mütləq surətdə vacibdir və onu tərk edən günah qazanır.”

[590] İkrimə’nin rəvayət etdiyinə əsasən İbn Abbas zəmzəm suyu içdikdə deyərdi: “Allahummə inni əsəlukə ilmən nəfian va rizqan vasian va şifəən min kulli dəin”. Bunu əd-Dəraqutni (2/288) və əl-Həkim (1/473) rəvayət edir. əl-Həkim deyir: “Əgər (isnadındakı) əl-Cərudi salamatdırsa isnadı səhih bir hədisdir.” İbnul-Muləqqin’in dediyi kimi əl-Cərudi salamat ravidir.

[591] İbn Nəsrilləh deyir: “Peyğəmbərin – salləllahu aleyhi va səlləm – qəbrini ziyarət etməyin müstəhəbliyinin zahiri bunun üçün səfər etməyin də müstəhəb olmasını tələb edir, çünki hacının həccini əda etdikdən sonra onu ziyarət etməsi səfər etmədən mümkün deyildir.” Bunu ət-Təğləbi şərhində (1/309) deyir.

## Qaçırma və maneə ilə üzləşmə bölümü

Qurban kəsilən günün sübh çağına çıxmış və ilişib qalmaq üzrü və ya digər üzr səbəbi ilə Ərəfədə durmayıbsa həcci əldən qaçırmışdır. Onun ihramı ümrəyə çevrilmiş olur və İslamda (vacib olan) ümrənin əvəzini vermir, beləliklə də ihramdan çıxmalıdır, (heyvan) qanı (axıtmaq) və növbəti il qəza etmək vacib olur.[592] Lakin əgər Ərəfədə durmağına nəsə əngəl olarsa və onu qaçırmadan öncə ihramdan çıxarsa qəza etməsi vacib olmaz.

Kim Ərəfədə durduqdan sonra belə Kəbəyə gəlməkdə maneə ilə üzləşərsə ihramdan çıxma niyyəti ilə qurban kəsməlidir. Əgər (qurbanlıq heyvan) tapmazsa ihramdan çıxma niyyəti ilə on gün oruc tutar və ihramdan çıxar.

Daşları atıb saçını qırxdıqdan sonra yalnız ifada tavafını etməkdə maneə ilə üzləşərsə tavaf etməyənə qədər ihramdan çıxmaz.

İhramın başlanğıcında "ihramdan çıxma yerim məni durduracağın yerdir" şərtini qoyarsa və yaxud "əgər xəstələnsəm və ya aciz qalsam və ya azuqəm bitsə ihramdan çıxa bilərəm" deyərsə heç bir şey ödəmədən istədiyi vaxt ihramdan çıxa bilər və qəza etmək ona vacib olmaz.

## Qurbanlıq heyvan bölümü

---

[592] Hətta həcc nafilə həcc olsa belə hökm eynidir, çünki digər könüllü ibadətlərdən fərqli olaraq həccə başladınsa onu tamamlamaq vacib olur və nəzirə çevrilmiş olur. Heyvanı isə məhz qəza edərkən kəsməsi vacib olur.

O, müəkkəd sünnətdir.

O, nəzir əhd etməklə[593] və "bu, qurbanlıq heyvandır" və ya "Allah üçündür" deməklə vacib olur.

(Qurban üçün) ən əfzəl (heyvan) dəvədir, sonra inək, sonra qoyundur. Bu üçündən başqa heyvanlar keçərli sayılmır.

Bir qoyun bir şəxsin adından, onun ailəsi[594] və uşaqlarının adından yetərli sayılır. Bir dəvə və inək yeddi nəfər üçün yetərli sayılır.[595]

Qoyunda keçərli sayılan ən kiçiyi altı ayı olan, keçidə bir yaşı olan, inəkdə və camışda iki yaşı olan və dəvədə isə beş yaşı olan heyvandır.

Buynuzsuz, quyruqsuz, axta, hamilə, qulaqsız doğulan və yaxud quyruğunun və ya qulağının yarısı qopan heyvan keçərli sayılır.

Ancaq xəstəliyi bəlli olan, qözü tutulmaqla təkgözlüyü açıq bilinən, gözləri olması ilə bərabər kor olan, sümük iliyi olmayan arıq, sağlam heyvanlarla birgə hərəkət etməyə güc yetirməyən topal, ön dişləri kökündən qopmuş heyvan[596], buynuzunun qişası sınan heyvan,

---

[593] əl-Ləbədi haşiyəsində (səh: 155-156) deyir: "Amma əgər onu alarsa və (alarkən) qurban kəsməyi niyyət edərsə məzhəbin səhih görüşünə görə niyyət ilə vacib olmaz, əgər belə olmasaydı o zaman qurban kəsmək əslən könüllü ibadət olmazdı."

[594] əl-Ləbədi deyir: "Yəni həyat yoldaşı, övladları, kölələri kimi ev əhlini qəsd edir, qardaş kimi ailə üzvü yox. Bir ailədə yaşayan iki qardaşdan biri qurban alarsa və hər ikisi üçün niyyət edərək kəsərsə bu, qurban olaraq keçərli sayılmaz. Bu, sadəcə olaraq onların yeyəcəkləri bir ət olacaq və insanların çoxu bu xətanı edir." əl-Ləbədi haşiyəsinin bir az sonrasında (səh: 160) bir fayda zikr etmişdir ki, biz onu burada qeyd etməyi münasib gördük. O, deyir: "Qadına ərinin izni olmadan ərinin malından onun ev əhli adından qurban kəsməsi caizdir. Bunu Şeyx Təqiyyud-Din (İbn Teymiyyə) demişdir."

[595] əl-Ləbədi bu məqamda bir faydanı zikr edir: "Qurban kəsmək üçün müəyyən bir heyvan ayırarsa və heyvan kəsildikdən sonra oğurlanarsa ona (yenidən) bir şey (kəsmək) vacib deyildir. Eynilə nəzir yolu olsa belə boynunda olan vacibi yerinə yetirmək üçün bir heyvanı ayırarsa, hətta heyvan kəsilmədən öncə tələf edilərsə və ya bundan öncə oğurlanarsa və ya azarsa, əgər ehmalkarlıq etməyibsə əvəzində başqa heyvan kəsməsi vacib deyildir."

[596] əl-İnsaf (4/80) kitabında demişdir: "Əshabımızdan bir toplum insan ön dişləri kökündən qopmuş heyvanın keçərli olmadığını qeyd etmişlər. "ət-Təlxis" kitabında demişdir: "Əshabımızdan buna dair bir şeyə rast gəlmədim. Məzhəbin qiyasına əsasən o, keçərlidir. Ancaq iki "ər-Riayə" kitabında, iki "əl-Havi" kitabında, "əl-Fəiq", ən-Nazm, İbn Abdus'un "ət-Təzkira" kitabında, əz-Zərkəşi (öz kitabında) və digərləri bunun keçərli olmadığını vurğulamışlar. Şeyx

zəkəri kəsilmiş axta, habelə qulağının və ya buynuzunun çox hissəsi olmayan heyvan[597] keçərli sayılmır.

## Fəsil

Qibləyə yönəlik halda dəvəni ayaq üstə durarkən boğazlamaq, inəyi və qoyunu isə sol böyrü üstə uzadıb kəsmək sünnətdir.[598]

İşə başlayıb əlini hərəkətə gətirdiyi zaman Allahın adını çəkir, sonra təkbir gətirir və belə deyir: "Allahummə həzə minkə va ləkə".[599]

Qurban kəsmənin ilk vaxtı ölkədə qılınan ən erkən bayram namazından sonra və yaxud namazı qılmayan üçün (namazın) qədərindən sonradır. Bundan öncə olarsa keçərli olmaz. Qurban kəsmənin müddəti təşriq günlərindən ikinci günün axırına qədər gecə və gündüz davam edir.

---

Təqiyuddin (İbn Teymiyyə) demişdir: "İki görüşdən ən səhih olanına görə keçərlidir."

[597] Ləbədi haşiyəsində (səh: 158) demişdir: "Bu, məzhəbin səhih görüşüdür və (digər məzhəblərdən fərqli olaraq) yalnız məzhəbə xas olan görüşdür. (İbn Muflih) "əl-Furu" kitabında deyir: "Belə bir ehtimal da əsaslıdır ki, qulağının və ya buynuzunun çox hissəsi olmayan heyvan qeydsiz, şərtsiz icazəlidir, çünki (bu barədə) gəlmiş xəbərin səhihliyi mübahisəlidir. Məna da bunu tələb edir, çünki buynuz yeyilmir və qulağı da çox zaman yemək üçün istəmirlər. Üstəlik bu, quyruğun kəsilməsi kimidir və keçərli sayılması üçün ondan daha münasibdir." (əl-Mərdəvi) "əl-İnsaf" kitabında deyir: "Deyirəm: Doğru olan da elə bu ehtimaldır." (əl-Ləbədi deyir) Deyirəm: Bunun eynisi buynuzunun qişası sınmış heyvan haqqında da əsaslıdır, hətta daha münasibdir."

[598] Məzhəbin səhih görüşünə görə qurbanlığı və ya hədyi kəsənin müsəlman olması şərt deyildir, lakin müstəhəbdir. Bu o deməkdir ki, kitab əhlinin kəsməsi də səhih sayılır. əl-Həccəvi "Zədul-Mustəqni" kitabında fərqli görüş bildirmiş və kəsənin müsəlman olmasını şərt görmüşdür. Lakin əl-Ləbədi haşiyəsində deyir: "Səhih görüşə görə kitab əhlindən biri qurbanlığı ayaq üstə və ya uzadaraq kəsərsə caizdir, müsəlman olması isə sünnətdir."

[599] əd-Dərimi (1989) rəvayət edir. Bunun bənzərini Əhməd (3/375), Əbu Davud (2795) və İbn Məcə (3121) rəvayət edib. Hədisi Cabir (r.a) rəvayət etmişdir. İbn Xuzeymə, əl-Həkim və əz-Zəhəbi səhih sayıblar.

Əgər vaxt çıxarsa (boynunda vacib olan kəs) vacibin qəzasını yerinə yetirməlidir, könüllü ibadət isə (qüvvədən) düşər.[600]

İnsanın könüllü kəsdiyi hədydən və vacib olarsa belə qurban heyvanından yeməsi sünnətdir. Təməttu` və qiran həccində kəsilən əti yemək də caizdir.

İnsanın ət adını daşıyacaq ən az miqdarda olan bir şeyi sədəqə verməsi vacibdir. Həmçinin yoxsulu yedirmək kifayət etmir çünki etibara alınan onu malın sahibi etməkdir.[601]

Sünnət olan insanın qurbanlıq ətinin üçdə bir hissəsini özünün yeməsi, üçdə bir hissəsini hədiyyə verməsi və üçdə bir hissəsini sədəqə olaraq çıxarmasıdır. Tük və yaxud dəri olsa belə ondan bir şey satmaq haramdır. Qurbanı kəsən adama ücrət olaraq heyvandan bir şey verməməlidir, lakin sədəqə və hədiyyə kimi verə bilər.

Zül-hiccənin ilk on günü girdiyi zaman qurban kəsənə yaxud adından kəsilənə, qurban kəsilən günə qədər tükündən və ya dırnağından bir şey alması haramdır.Ondan sonra isə saçı qırxmaq sünnətdir.

---

[600] Qurban kəsmək ibadəti vacib deyildir, müstəhəbdir. Lakin kimsə misal üçün "bu il qurban kəsməyi nəzir etdim" deyərsə o zaman o qurbanı kəsmək ona vacib olur və əgər qurban kəsmə vaxtını ötürərsə qurbanı qəza olaraq kəsməsi lazımdır. Amma boynunda qurban kəsmək kimi hər hansı bir vacibiyyət olmayan kəslər üçün bu ibadət müstəhəb olaraq qalır və müstəhəb ibadətin vaxtı keçdiyi üçün ona nail ola bilməz, əgər yenə də kəsərsə bu, qurban sayılmır, sadəcə kəsilmiş heyvan sayılır, sədəqə verə bilər.

[601] əl-Ləbədi deyir: "(Miskinlərə sədəqə verməsi vacibdir sözü) ilə qəsd etdikləri əti çiy verməkdir yoxsa kasıbın mülkünə verərkən onun qaynadılmış və ya qızardılmış olmasınımı qəsd edirlər? Bunu aşkar sözlərlə ifadə edən və ya buna işarə edən birini görmədim. Daha sonra isə "əl-İqna" və başqa kitabda aşkar şəkildə deyildiyini gördüm ki, çiy verilir." Doğrusunu Allah bilir. Qurban ətini üç gücədən artıq müddətə saxlamaq icazəlidirmi? Bəli, istədiyi qədər saxlaması icazəlidir. Çünki bunu qadağan edən hökm nəsx olunub. Bəzi alimlər bunun aclıq zamanında olmasını istisna ediblər."

## Əqiqə haqqında fəsil

Əqiqə, ata üçün - imkansız olsa belə[602] - sünnətdir.[603] Oğlan uşağının adından iki qoyun, qız uşağının adından isə bir qoyun kəsilir. Dəvə və ya inək (kəsmək) yalnız bütöv olduqda keçərli olur.

Onu, uşaq doğulandan sonra yeddinci gün kəsmək, əgər bu günü qaçırsa on dördüncü gündə, bunu da qaçırdıqda iyirmi birinci gündə kəsmək sünnətdir.[604] Bundan sonra isə həftələr hesaba alınmır.

Kəsilmiş heyvanın qanını uşağa sürmək məkruhdur.[605] Yeni doğulmuş uşağın doğulduğu zaman sağ qulağına azan, sol qulağına isə iqamə oxumaq sünnətdir.[606] Yeddinci gündə uşağın saçını qırxmaq, saçı çəkisində gümüş sədəqə vermək və uşağın adını qoymaq sünnətdir.[607] Allahın ən sevdiyi adlar Abdullah və Abdurrahməndir.

---

[602] İmam Əhməd imkanı olmayan birinə əqiqə kəsmək üçün borc almağı gözəl bir əməl görüb.

[603] Ibn Avd əl-Mərdəvi haşiyəsində (1/689) deyir: "Əgər (atası) bunu (etməyi) tərk edərsə doğulmuş uşağa həddi-büluğa çatdıqdan sonra öz adından əqiqə kəsməsi sünnət deyildir, (əgər kəsərsə) əqiqə adlanmaz. Bir qrup alim isə bunu müstəhəb sayıb."

[604] əl-Ləbədi haşiyəsində (səh: 160) deyir: "Əgər əqiqə kəsilmədən öncə uşaq ölərsə yenə də əqiqə kəsmək sünnətdir ya yox? Bu barədə açıq-aydın bir söz danışan birini görmədim. Elm əhlindən olan qohumlarımdan birindən eşitmişdim ki, belə halda (əqiqə kəsmək) məşru deyildir, çünki əqiqə doğulmuş uşağın bir nemət kimi qarşılığı olaraq kəsilir, uşağın ölümü ilə bu nemət aradan qalxır. Onun bu barədə hər hansı bir alim sözü görüb görmədiyini bilmirəm. Ona görə də deyirəm ki, alimlərimizin sözlərindəki ümumilik həm sağ, həm də ölüyə şamildir. O vaxtdan bəri bu hökm haqqında araşdırmağı durdurmamışam, ta ki, İbn Aud'un bu kitaba yazdığı haşiyədə dediyi bu sözlərlə qarşılaşdım: "Sünnət onu, yəni əqiqəni doğumundan sonra yeddinci gündə - hətta doğulmuş uşaq bundan öncə ölsə belə - kəsməkdir..."... Bu isə mənim dediyim haqqında açıq aydın sözlərdir və alimlərimizin sözlərinin ümumiliyi buna dəlalət edir və bu, hədisin ümumiliyinin tələb etdiyi mənadır."

[605] ət-Təğləbi deyir: "Başına zəfəran sürməkdə heç bir problem yoxdur. İbnul-Qayyim bunun sünnət olduğunu deyib."

[606] Müəllif burada təhniki qeyd etməmişdir. Lakin ət-Təğləbi kitabın şərhində deyir: "Xurma ilə təhnik edər; onu ağzında çeynəyər və sonra uşağın ağzının içinə sürtər və mədəsinə getməsi üçün ağzını açar."

[607] ət-Təğləbi deyir: "Qızın saçı qırxılmaz." Həmçinin deyir: "Uşağa ad vermək ataya aiddir və ata mövcud olduğu halda başqası ad verməməlidir."

Abdunnəbi və Abdulməsih kimi Allahdan qeyrisinin qulu olduğunu ifadə edən adları qoymaq haramdır. Uşağa Hərb, Yəsər, Mubarək, Muflih, Xeyir, Surur adlarını qoymaq məkruhdur. Mələklərin və peyğəmbərlərin adları ilə adlandırmaq isə (məkruh) deyildir.

Əgər əqiqə və qurbanlıq eyni vaxta təsadüf edərsə biri(ni kəsmək) digərinin yerini verir.

O, fərzu-kifayədir.[608]

Onu həyata keçirən kifayət edəcək qədər adam olduqda (cihada qoşulmaq) sünnətdir.[609]

(Cihad) yalnız kişi, azad, müsəlman, mükəlləf, sağlam, özünə və yoxluğu zamanı ailəsinə yetəcək qədər malı olan və (namazı) qısaltma məsafəsində onu daşıyacaq bir minik tapa bilənə[610] vacibdir.

Döyüşçünü qarşılamaq yox, onu yola salmaq sünnətdir.

Könüllü ibadətlərin ən fəzilətlisi cihaddır. Dəniz yürüşü isə (qurudakı döyüşlərdən) daha fəzilətlidir.

Şəhidlik borcdan savayı bütün günahları silib aparır.[611]

---

[608] əl-Ləbədi haşiyəsində (səh: 162) fərdu-kifayə olan əməllərə digər misallar verir. Bu misallar arasında müsəlmanlara verilən zərərin dəf etməyi və bunun misal olaraq paltarı olmayanı geyindirməyi, ac olanları doyurmağı, sənaye və kənd təsərrüfatı istehsalat məntəqələrinin qurulmasını, dəvətin edilməsini, hüccət və ya qılınc yolu ilə şübhələrin dəf edilməsini, quyuların və kanalların qazılması, onların təmizlənməsini, akvedukalar, körpülər və istehkam divarları tikməyi, onları təmir etmək, yolları və məscidləri təmir etməyi, fətva verilmə və şəriət elmlərinin, həmçinin ehtiyac duyulan hesab, dil, qrammatika, qiraət, tibb kimi elmləri öyrətmə mərkəzlərinin qurulmasını qeyd edir. Bütün bunları əl-Həccəvi'nin "əl-İqna" kitabından ixtisar etdiyini deyir.

[609] Şeyx ət-Təğləbi şərhində (1/319) deyir: "Fərzu-Kifayənin mənası budur ki, əgər kifayət edəcək qədər adam bunu həyata keçirərsə digərlərinin boynundan düşər, əgər kifayət edəcək qədər adam bu işi yerinə yetirməzsə o zaman insanların hamısı günahkar sayılır." əl-Ləbədi bu sözlər barədə deyir: "Mənim başa düşdüyüm budur ki, burada "insanlar" ilə qəsd olunan qadınlar, qullar və bənzərləri yox, cihad ilə mükəlləf olanlardır, çünki onlar (yəni qadınlar, kölələr) bu əmr ilə muxatab deyillər."

[610] Buradan anlayırıq ki, cihadın baş verdiyi yer namazı qısaltmağa icazə verən məsafədən az bir məsafə uzaqlığındadırsa belə bir miniyin olması şərt deyildir. Bu, həm cihadda, həm də həcdə belədir.

[611] Şeyx ət-Təğləbi qeyd edir ki, dənizdə şəhid olmaq hətta borc üçün belə kəffarədir. Lakin bu barədə Əbu Nueym və əd-Deyləmi'nin rəvayət etdiyi hədis zəifdir.

(Özündən sonra tərk edə biləcək) malı olmayan borclu yalnız borc sahibinin izni ilə, həmçinin valideynlərindən biri azad və müsəlman olan kəs yalnız onun izni ilə[612] könüllü cihada gedə bilər.

Ribat – və o, cihad üçün cəbhə bölgəsində gözətdə olmaqdır – sünnətdir. Onun ən az müddəti bir saatdır, ən dolğunu isə qırx gündür. O, Məkkədə yerləşməkdən daha fəzilətlidir.[613] Bunun ən riskli olanı ən fəzilətlisidir.

Müsəlmanların (sayda) özlərinin iki mislində olan (düşmən)dən qaçması – iki nəfərdən (qaçan) bir (müsəlman olsa) belə - caiz deyildir. Əgər düşmənlər onların iki mislindən çox olarsa bunu etmək icazəli olar.[614]

Küfrün və azdırıcı bidətlərin hökmünün üstünlük təşkil etdiyi bir yerdə dinini aşkar etməyə aciz olan hər bir kəsə hicrət etmək

---

Şeyx ət-Təğləbi şərhində əlavə məlumat olaraq deyir ki, "təharət, namaz, ramazan orucu, ərəfat gününün orucu, aşurə orucu yalnız kiçik günahların kəffarəsidir." əl-Ləbədi haşiyəsində (səh: 163) deyir: "Yəni ki, böyük günahlara gəldikdə isə onların tövbədən başqa heç bir kəffarəsi yoxdur. Bəzi alimlər isə deyib: "Hədisin zahiri həm kiçik, həm də böyük günahların bağışlanacağını göstərir, Allahu Təalənin fəzli daha ümumi və daha genişdir." əl-Mərruzi (İmam Əhməddən) nəql edir: "Valideynə xeyirxahlıq böyük günahların kəffarəsidir."

[612] Çünki valideynə xeyirxahlıq fərzu ayn sayılır və fərzu ayn belə halda fərzu kifayədən önə keçirilir. Müəllifin sözlərindən anlayırıq ki, əgər valideyn kafirdirsə və ya kölədirsə, ondan izn almaq şərt deyildir.

[613] əl-Furu` (6/196) kitabında gəldiyi kimi Şeyxul-İslam ibn Teymiyyə buna dair icma qeyd etmişdir.

[614] əl-Ləbədi öz haşiyəsində deyir: "Yəni; lakin əgər düşmən üzərində zəfər qazanacaqlarını güman etsələr o zaman (qaçmamaq), yerində qalmaq daha yaxşıdır, hətta müstəhəbdir. Döyüşə davam etdikləri zaman həlak olacaqlarını və əgər döyüşməsələr əsir götürüləcəklərini güman etmələri halı da belədir, bu zaman döyüşə davam etmələri daha yaxşıdır. İmam Əhməd deyib: "Əsir düşmələri mənə xoş deyil." Dedi: "Döyüşmək mənim üçün daha sevimlidir, çünki əsir düşmək ağırdır, öldürülməsi qaçınılmazdır." Dedi: "(Düşmən) aman versə də döyüşə davam etsinlər, çünki ola bilər ki, verdikləri amana vəfalı olmasınlar. Əgər iki tərəf(dən birin)in həlak olacağı güman edilirsə döyüşə davam etmək daha yaxşıdır."

Kim (cihadda) bir əsir ələ keçirərsə onu öldürməsi caiz deyildir, əksinə onu İmamın yanına gətirməlidir. Əgər həmin əsir onunla getməkdən imtina edərsə, hətta döyüldükdə belə getməzsə, bu halda öldürülməsi icazəlidir. Əgər bundan başqa səbəblərə görə öldürərsə; öldürülən kişidirsə günah qazanmış olur, lakin üzərinə heç bir şey düşmür. Əgər qadın və ya uşaqdırsa İmam onu cəzalandırmalıdır, qənimətdən onun qiymətini cəza kəsməlidir, çünki (öldürdüyü qadın və ya uşaq) əsir düşdüyü andan kölə sayılır."

vacibdir. Əgər orada dinini aşkar etməyə qadirdirsə oradan hicrət etmək sünnət olur.

## Fəsil

Kafirlərdən olan əsirlər iki qismə bölünürlər:

Bir qismi sadəcə əsirliyə düşməklə köləyə çevrilənlərdir; bunlar qadınlar və uşaqlardır.[615]

Digər qism isə belə deyildir; bunlar həddi-buluğa çatmış döyüşən kişilərdir.[616] İmam bunlar barəsində (onları) öldürmək,[617] kölə etmək, təmənnasız azad etmək və mal müqabilində və ya müsəlman əsirin əvəzində azad etmək[618] arasında seçim edə bilər.[619] Bunların arasından ən məqsədə uyğun olanını etməsi vacibdir.[620]

---

[615] Şeyx ət-Təğləbi bu qismə həmçinin dəlilərin də aid olduğunu deyir. Burada kafirin kitab əhlindən olması ilə başqa növdən olması arasında bir fərq yoxdur.

[616] Şeyx əl-Ləbədi haşiyəsində (səh: 164) deyir: "Xroniki xəstə, kor, çox yaşlı və monastrda (ibadət edən) rahib kimilərindən fərqli olaraq; onlar da sadəcə əsir alınmaqla kölə olurlar, necə ki, (bu məna) "əl-İqna" və "əl-Muntəhə" kitablarından anlaşılır."

[617] əl-Ləbədi deyir: "Öldürmək ilə qəsd olunan qılınc ilə boynunu kəsməkdir; (Cüssəsini) "təmsil" etmək və əzab vermək caiz deyildir." Təmsil – buna həm də muslə deyirlər – bir düşmən kafirin cəsədinə qarşı həddi aşmaqdır, yəni hər hansı bir üzvünü kəsmək olmaz, qarnını yarmaq və yaxud da ürəyini çıxarmaq və buna bənzər hərəkətlər etmək olmaz. Həmçinin əzab verərək öldürmək olmaz. Beləliklə də qılınc ilə boynunu vurmaq əzabı ən az ölüm yolu olduğu üçün şəriət bunu əmr edir və bu, Allahın qullarına olan rəhmətindəndir.

[618] Müsəlman əsirlərin azad edilməsi də fərzdir. Bu zaman müsəlman əsir üçün fidyə tələb edilsə beytul-mal'dan ödənilməlidir. Əgər mümkün olmazsa o zaman müsəlmanlardan toplanılmalıdır. Lakin əsirlərimizi azad etməyin qarşılığında düşmənə fidyə olaraq at və ya silah vermək olmaz, paltar və buna bənzər şeylər vermək olar. Bunu əl-Ləbədi haşiyəsində söyləyir.

[619] əl-Ləbədi qeyd edir ki, bu deyilənlər "əsir alındıqdan sonra İslamı qəbul etmək halına aid deyildir. "Əgər İslamı qəbul edərsə o zaman kölə edilməsindən başqa yolu yoxdur, bu zaman hökmü qadınların hökmü ilə eyni olur. (İmam Əhməd)dən gələn digər rəyə görə isə beləsləri barəsində üç seçim vardır: kölə

Onlardan kölə edilmişləri kafirə satmaq səhih deyildir.

Bu üç səbəbdən biri olduğu təqdirdə kafirlərin həddi-buluğa çatmamış uşaqlarına müsəlman hökmü verilir:

**Birinci**: valideynlərindən xüsusən birinin İslamı qəbul etməsi

**İkinci**: onlardan birinin diyarımızda edam edilməsi[621]

**Üçüncü**: bir müsəlmanın onu valideynlərinin birindən ayrı olduğu halda əsir alması.

Əgər onu bir zimmi əsir götürərsə onun dinində sayılar və ya hər iki valideyni ilə birlikdə əsir götürülərsə onların dinində sayılar.

## Fəsil

Kim müharibə halında birini öldürərsə, onun əşyalarını ələ keçirə bilər.[622] Bunlar ölünün üzərində olan paltar, bər-bəzək, silah,

---

etmək, azad etmək ya da fidyə verməkdir. Bu görüşü əl-Muvaffəq (İbn Qudəmə) səhih saymışdır. Fidyə isə köləlikdən azad olmaq üçün verilir. Amma qorxu və ya digər səbəblərə görə əsir düşmədən öncə İslamı qəbul etmiş olarsa (onun hökmü) əsli müsəlman kimidir."

[620] əl-Ləbədi buyurur: "Əgər bunlardan hansının daha məqsədə uyğun olması barəsində tərəddüd edərsə (alimlərə görə) öldürmək seçimi daha üstündür. Mənə görə isə bu halda bunu etmək vacib olur. Doğrusunu Allah bilir.

[621] ət-Təğləbi buna misal verərək deyir: "Misal üçün zimmi qadın biri ilə - kafir ilə olsa belə - zina etdi və uşaq doğdu (və sonra buna görə öldürüldü), bu zaman (Əhmədin) aşkar sözünə əsasən uşaq müsəlman sayılır." Bunun səbəbi isə budur ki, Allahın elçisi – aleyhissalətu vassələm – deyir: "Hər doğulan uşaq millət (fitrət) üzərində doğulur, amma valideynləri onu nəsraniləşdirir, yəhudiləşdirir..." Bu hədisdən fəqihlər onu anlayıblar ki, iki valideyn hər ikisi də olduqda uşaq nəsranilətşir, yəhudiləşir, onlardan biri olmadıqda uşaq doğulduğu fitrətə qayıdır və ona görə də hökm verilir. Ona görə də edam edilməsi və ya öldürülməsi şərt deyildir. Buna görə də əl-Ləbədi haşiyəsində deyir: "Eyni hökm valideynin hər ikisinin və ya birinin bizim ölkəmizdə ölməsi halına da aiddir, bu zaman (uşağın) müsəlman olduğuna hökm edilər."

[622] əl-Ləbədi deyir: "Yəni ki, (bu) onunla təkbətək vuruşarkən və ya özünü təhlükəyə ataraq onu öldürməsi(nə aiddir). Lakin (düşmən) yemək yeməklə və bənzəri işlərlə məşğul olarkən öldürərsə və ya (düşmən) qaçarkən öldürərsə o zaman onun əşyalarını götürməyə haqqı yoxdur. Həmçinin öldürülməməsi gərəkən çox yaşlı kişini və ya qadını öldürərsə hökm eynidir.

həmçinin üzərində (oturaraq) döyüşdüyü minik heyvanı və onun üstündə olan şeylərdir. Lakin onun azuqəsi, yəhəri, çadırı və döyüşdə istifadə etmədiyi minik heyvanı qənimətdir.

Qənimətlər onu ələ keçirənlər arasında bölünür və onlara qənimətin beşdə dörd hissəsi verilir. Piyada döyüşçüyə bir pay, mələz atın üzərində olan atlıya iki pay, ərəb atının üzərində olan atlıya isə üç pay düşür.

Atdan qeyrisi üçün pay kəsilmir. Həmçinin yalnız dörd şərtə yiyələnən şəxs üçün pay kəsilir: həddi-buluğ, ağıl, azadlıq və kişi olmaq.

Əgər bir şəxsdə bu şərtlərdən biri pozularsa ona (qənimətdən) bir az verilər, lakin pay sahibi edilməz.

Yerdə qalan beşdə bir hissə isə beş hissəyə bölünər: bir hissəsi Allah və Elçisi üçün ayrılar və fey məqsədləri üçün xərclənər. Bir hissəsi Peyğəmbərin əqrabalarına ayrılar və harada olmaqlarından asılı olmayaraq bunlar Haşim oğulları və əl-Muttalib oğullarıdır; kişi iki qadının payı qədər alar. Bir hissəsi də yoxsul yetimlərə verilər və yetim, həddi-büluğa çatmamış atasız kəsdir. Bir hissə miskinlərə və (digər) bir hissə yolçulara verilər.

## Fəsil

Cizyə, xərac, hərbi’nin ticarətindən alınan onda bir hissə, zimminin ticarətindən alınan iyirmidə bir hissə, kafirlərin qorxudan tərk etdikləri və ya varisi olmayan bir ölüdən buraxdıqları şeylər kimi döyüşsüz və haqlı olaraq kafirlərin malından alınana fey deyilir.

O, müsəlmanların mənafeyi üçün xərclənir. Ən əhəmiyyətli olan iş ilə başlanır. Ən əhəmiyyətli olan isə sərhəd məntəqələrin gücləndirilməsi, oranın əhalisini təmin edilməsi, müsəlmanları

qoruyanların ehtiyaclarının ödənməsi, körpülərin tikilməsi, qazilərin və fəqihlərin əmək haqqının verilməsi və başqa şeylərdir. Əgər artıq bir şey qalarsa azad müsəlmanların zənginləri və kasıbları arasında bölüşdürülər.

Beytul-mal müsəlmanların mülküdür. Onu tələf edən təzminatını ödəməlidir. İmamın icazəsi olmadan oradan bir şey götürmək haramdır.

## Zimmət sazişi ilə bağlı bölüm

Bu (saziş) yalnız kitab əhli üçün və ya məcusilər kimi kitab şübhəsi olanlar[623] üçün bağlanır.

Əgər (imam) onların hiyləsindən arxayın olarsa və bizim qoyduğumuz dörd şərtə əməl edərlərsə, imamın bu sazişi bağlaması vacib olur. (O şərtlər bunlardır):

**Birinci**: zəlil vəziyyətdə öz əlləri ilə cizyə verməkləri,

**İkinci**: İslam dinini yalnız xeyir ilə anmaqları,

**Üçüncü**: müsəlmanlara zərər gətirəcək bir şeyi etməməkləri,

**Dördüncü**: can, mal, namus və - şərab kimi halal saydıqları şeylərdə deyil, zina kimi haram saydıqları işlərdə - hədləri tətbiq etməklə bağlı İslam əhkamlarının onların üzərində də keçərli olmasıdır.

Qadından, xonsadan, uşaqdan, dəlidən, kölədən, əlildən, kordan, əldən düşmüş qocadan və monastırda olan rahibdən[624] cizyə alınmır.

---

[623] Çünki daha öncə onların səmavi kitaba sahib olmaqları ehtimalı vardır. Belə bir kitaba sahib olmaqları onları da kitab əhli edir, lakin bunu dəqiq bilmədiyimiz üçün sadəcə şübhə adlandırırıq. Belə bir şübhə onların qanını və malını qoruyur, çünki əsli hökm belələrinin həyatda qalmasıdır. Lakin belə bir şübhə onların qadınlarını və kəsdiklərini bizə halal etmir, çünki belə şeylərdə əsli hökm haramlılıqdır.

Bir il keçdikdən sonra İslamı qəbul edənin üzərindən cizyə düşür.[625]

## Fəsil

Zimmə əhlini öldürmək və mallarını əllərindən almaq haramdır.

İmamın onları qoruması və onlara əziyyət verənlərə mane olması vacibdir.

Onlara atlara minmək, silah daşımaq, kilsələr tikmək, dağılmış kilsələri bərpa etmək, habelə münkər işləri, bayramlarını, xaçı aşkarda nümayiş etdirmək və (kilsə) zəngi çalmaq, habelə kitablarını ucadan oxumaq, Ramazanda gündüz çağı yemək və içməyi, şərab içməyi, donuz əti yeməyi aşkarda göstərmək qadağan edilməlidir.

Habelə onlara Quran oxumaq, Quran kitabını və fiqh və hədis kitablarını almaq və müsəlmanların üzərinə binalar ucaltmaq[626] qadağan edilməlidir.

Onların libasda bizdən seçilməkləri gərəkdir. Onlara bənzəmək isə bizim üçün məkruhdur.[627]

---

[624] Şeyx Mənsur bin Yunus əl-Buhuti "İrşədu Ulin-Nuhə li Dəqaiqil-Muntəhə" adlı haşiyəsində (1/614) deyir: "Anlaşılan məna budur ki, əgər (rahib) alış-satış üçün insanların arasına qarışırsa digərləri kimi onlardan da alınar."
Həmçinin Şeyx ət-Təğləbi şərhində (1/328) deyir: "Rahibdən onun özü üçün kifayət edəcək miqdarından artığı əlindən alınar və əlində özünə kifayət edəndən başqası qalmaz."

[625] Yəni cizyəni ödədiyi vaxtın üzərindən bir il keçdikdən sonra İslamı qəbul edərsə, qəbul etmədən öncə ona vacib olmuş bir ilin cizyəsini ödəməsi vacib olmaz.

[626] ət-Təğləbi deyir: "...hətta müsəlman qonşusu buna razılıq versə belə (qadağandır)..." əl-Ləbədi haşiyəsində (səh: 167) deyir: "Altında müsəlmanların yaşadığı hündür bir yerdə yaşamaqlarını da qadağan etmək bunun kimidir, hətta daha münasibdir, necə ki, bu yöndə Şeyx Abdur-Rahmən əl-Buhuti fətva vermişdir. Həmçinin belə demək də əsaslıdır ki, belə yeri onlara icarə vermək də haramdır və bu, aşkardır, qaranlıq heç bir şey yoxdur."

Onlar üçün ayağa qalxmaq, onları məclislərin yuxarı başında oturtmaq,[628] (görüşdükdə) onlar "salam" ilə və "sabahı necə qarşıladın?" və ya "axşamı necə qarşıladın?" və "sən necəsən?", "vəziyyətin necədir" sözləri[629] ilə birinci xitab etmək haramdır. Həmçinin onları təbrik etmək, onlara təziyə vermək və xəstələrini ziyarət etmək haramdır.

Kim bir zimmiyə salam verərsə, sonra onu(n zimmi olduğunu) bilərsə, "salamımı geri qaytar" sözlərini deməsi sünnətdir.

Əgər zimmi salam verərsə salamına cavab vermək vacibdir; bu zaman "va aleykum" deyilməlidir. Əgər bir kafir bir müsəlmanın asqırmasına dua edərsə ona cavab verər.

Onlarla əllə görüşmək məkruhdur.

## Fəsil

Zimmə əhlindən hər kim cizyə verməkdən imtina edərsə və ya zəlil vəziyyətdə cizyə verməkdən imtina edərsə və ya bizim hökmümüzə riayət etməkdən imtina edərsə və ya müsəlman qadınla zina edərsə[630] və ya nikah bağlayaraq onunla yaxınlıq edərsə və ya quldurluq edərsə və ya Allahu Təaləni, ya da elçisini pisləyərsə və ya

---

[627] Həmçinin bunun haram olması deyilmişdir. Şeyxul-İslam bu görüşə üstünlük verərək demişdir: Peyğəmbərin - salləllahu aleyhi və səlləm – "kim özünü bir qövmə bənzədərsə onlardandır" sözünün ən aşağı halı bənzəmənin haram olmasını tələb edir, baxmayaraq ki, bu sözlərin zahiri onlara bənzəyənin küfr etdiyini gərəkdirir." ("əl-Furu`", 1/360)

[628] ət-Təğləbi deyir: "İslamı qəbul etməklərinin ümid edilməsi halı istisnadır. Bu görüşə Şeyx (İbn Teymiyyə) üstünlük verib."

[629] əl-Ləbədi deyir: "Şeyx (İbn Teymiyyə) deyir: "Bu və buna bənzər sözlər, "Allah sənin ömrünü uzatsın və malını çoxaltsın" kimi sözlər(i demək) icazəlidir."

[630] əl-Ləbədi deyir: "Bunun üçün etibarlı şahidlər ilə sübut edilməsi şərt deyildir, bunun məşhurlaşması, geniş yayılması kifayət edir."

bir müsəlmana qətl etməklə və ya onu dinində fitnəyə salmaq ilə ona qarşı həddi aşarsa[631] (müsəlmanlarla olan) əhdi pozular.

İmam əsirlərdə olduğu kimi beləsinə dair seçim qarşısındadır və həmin şəxsin malı fey sayılır. Lakin onun qadınlarının və övladlarının əhdi pozulmur. Əgər o, peyğəmbəri - sallallahu aleyhi va səlləm - təhqir etmiş olsa belə İslamı qəbul edərsə onu öldürmək haram olar.[632]

---

[631] Lakin bir müsəlmanı zinada ittiham edərsə, ya da ona sehr edərsə bununla zimmət sazişi pozulmur. Həmçinin bir münkəri aşkarda edərsə, misal üçün ramazanda gündüz vaxtı yeyib içərsə və ya öz kitabını oxuyarkən səsini qaldırarsa zimməti pozulmamışdur. Bunu ət-Təğləbi şərhində zikr edir.

[632] İbn Muflih "əl-Furu`" (6/287) kitabında deyir: "İbn Əbu Musa qeyd etmişdir ki, peyğəmbəri söyən İslamı qəbul etsə belə ödürülür. "əl-Mustəv`ib" kitabında (əs-Səmuri) yalnız bunu qeyd etməklə kifayətlənmişdir. Habelə ibn əl-Bənna "əl-Xisal" da bunu qeyd etmişdir. Şeyx Təqiyuddin ibn Teymiyyə deyir: "Bu, məzhəbin səhih olan görüşüdür." əl-Ləbədi deyir: "Zinada ittiham etmə halı istisnadır, amma (peyğəmbəri) zinada ittiham edərsə qeydsiz-şərtsiz öldürülər."